Tərtib, ön söz və lüğətin müəllifi: **Cəlal Bəydili (Məmmədov)** *filologiya elmləri namizədi*

Elmi redaktorlar: **Tofiq Hacıyev** *AMEA-nın müxbir üzvü, Türk Dil Qurumunun həqiqi üzvü, filologiya elmləri doktoru, professor, əməkdar elm xadimi*

**Teymur Kərimli** *filologiya elmləri doktoru*

**894.35 - dc 21**
**AZE**
**Yunus Əmrə. Əsərləri.** Bakı, "Öndər nəşriyyat", 2004, 326 səh.

Düşüncələrini dövrün təsəvvüf mədəniyyəti çərçivəsində dilə gətirən Yunus Əmrə türk xalq sufi şeirinin görkəmli nümayəndəsidir. "Vətən coğrafiyasının torpaqdan yüksələn bütün gözəl səslərini xalq diliylə birləşdirən" şairin yaradıcılığı milli söz sənətinin inkişafına qüvvətli təsir göstərmişdir.

Azərbaycan oxucusuna təqdim olunan bu kitab Yunus Əmrə əsərlərinin ən əski və yaxşı nüsxəsi sayılan Fateh nüsxəsi əsasında tərtib edilibdir. Divanın tərtibi zamanı Ə.Gölpınarlı tərəfindən hazırlanmış 1965-ci il İstanbul və F.K.Timurtaş tərəfindən hazırlanmış 1989-cu il Ankara nəşrlərindən istifadə olunmuşdur.

XIII-XIV yüzillər türkcəsinin həqiqi toxunulmaz xəzinəsi olduğu üçün Yunus Əmrə divanının dil xüsusiyyətləri hazırkı nəşrdə mümkün qədər qorunmuşdur.

Geniş oxucu kütləsi üçün nəzərdə tutulan bu kitabdan mütəxəssislər də faydalana bilərlər.

**ISBN 9952-416-00-7**





## HƏQQ DİDARIN GÖRƏN ŞAİR

*"Yunus ilə yoldaş olsun gəlsün Allahuna gedən..."*
**Yunus Əmrə**

*İslam dövrünün yüzillər boyu yetişən saysız türk şairləri arasında* adı sonsuz ehtiramla çəkilən Yunus Əmrə zəngin türk dili və mədəniyyəti tarixinin yetirdiyi çox nəhəng simalardandır. Milli zövqlü sufi şairin şöhrəti əsrləri adlamış, Anadolu və Rumeli sahəsini, eləcə də bütün Azərbaycanı bürümüşdür. Yunus Əmrə elə bir sənətkardır ki, zaman keçdikcə işığı dünyaya daha çox yayılır. İlahi eşq atəşində yana-yana onu bütün gözəlliyi ilə yaşayan şair Tanrı sevgisinin dərkolunmaz həyəcanlarını insanlığa çatdırmağa müvəffəq olmuşdur. Dünyaya yayılan da həmin sevginin ətridir.

Əsrlərdir könüllərdə taxt quran Yunus Əmrənin yaradıcılığı ümumən türk şeirinin inkişafına qüvvətli təsir göstərmişdir. Xalq ədəbiyyatı ənənəsi ilə meydana gəlmiş türk xalq sufi şeirinin görkəmli nümayəndəsi olan böyük şairin həyatı haqqında, təəssüflər olsun ki, bir o qədər də geniş məlumat yoxdur. Bəlli olan budur ki, Yunus "Risalətun-nushiyyə" ("Nəsihətnamə") adlı 562 beytlik məsnəvisini hicri 707-ci (m. 1307/08) ildə yazmış, h. 720-ci (m. 1320/21) ildə 82 yaşında vəfat etmişdir. Beləliklə, h. 638-ci (m.1240/41) ildə dünyaya gəldiyi anlaşılan Yunus Əmrə XIII yüzilliyin II yarısı – XIV yüzilliyin ilk yarısında yaşamışdır. Bu tarixlərin doğruluğu şairin öz əsərlərində *müasirləri* Mövlana Cəlaləddin, Əhməd Fəqih, Geyikli Baba və Seydi Balumdan bəhs etməsi ilə də təsdiqlənir. Divanında Hacı Bəktaşdan heç söz etməyən Yunus Əmrə şeyxi Baraq Baba olan Tapdıqdan açıq-aydın öz şeyxi deyə bəhs açır (Həmin Baraq Babadır ki, "Vilayətnamə"də adı Hacı Bəktaş xəlifələri arasında çəkilir). Şairin özününsə harada dünyaya göz açdığı, necə bir ömür yaşadığı dəqiqliyi ilə bilinmir. Xalq arasında yayılmış olan qənaətə görə, o, Sivrihisar yaxınlığındakı Sarıköydə doğulmuşdur. Ehtimal ki, təhsilini də bölgənin ən mühüm elm və mədəniyyət mərkəzi olan Konyada almışdır. Bir türkman dərvişi olan Yunus təkyələrdə yaşamış, şeyxlik dərəcəsinə çatıb zaviyələr qurmuşdu. Övliyalıq qatına yüksəlmiş olan, sonralarsa həyatı əfsanələrə bürünən Yunusun Anadoluda on ayrı yerdə məzarı olduğu söylənir. Belə ziyarət yerlərindən biri də Azərbaycanın Qax bölgəsində göstərilir.

Şeirlərində adını əksərən Qul Yunus, Aşiq Yunus, Yunus Əmrəm və ya Miskin Yunus, Dərviş Yunus, Qoca Yunus, ya da sadəcə Yunus şəkillərində işlədən Yunus Əmrə daha çox xalq şeiri ölçüsündə – heca vəznində, üstəlik bu vəznin, demək olar, hər bir şəklində yazıb yaratmışdır. O, alınma ünsürləri



belə türkcənin sirri-sehri içərisində görünməz edib yad olduqlarını az qala unutduracaq qədər onları milli ahəngə uyğunlaşdırmışdır. Vəhdəti-vücud kimi mürəkkəb və anlaşılması çətinlik törədən bir metafizik sistemi axıcı üslubda çatdıran şair xalqın zövqünə tam uyarlı bir sufi ədəbiyyatı meydana gətirmişdir. Beləcə, Yunus Əmrə başlanğıcı Türküstanda Yəsəvilik təriqətində də görünən, istər dil, istərsə söylənmə şəkli baxımından milliliyi ilə seçilən bir ədəbiyyatın və bütövlükdə XIII yüzil türkcəsinin ən qüdrətli şairi adını qazanmışdır.

Hələ də millətin ruhuna hakim kəsilən bu əsərlərdə Qurani-Kərimdən, hədislərdən, sufilərin sözlərindən, peyğəmbərlərin, ərənlərin qissələrindən, eləcə də əsatiri varlıqlardan bəhs etməyindən aydın olur ki, şair dövrün elmlərini gərəyincə mənimsəmişdir. Lakin bu mənimsəmə, əlbəttə, mədrəsə elmlərinin xırdalıqlarına enəcək və ya o zamanın İran ədəbiyyatındakı bəlağət qaydalarından tam xəbərdar olacaq bir həddə deyil.

Yunus Əmrənin irsi kiçik, mənsur müqəddiməli məsnəviyatdan və qəzəllərlə ilahiləri özündə birləşdirən divandan ibarətdir. "Risalətun-nushiyyə" adlanan məsnəvidə könül cahanında hökm sürən rəhmani və şeytani qüvvətlərdən, qənaət və səbrin əhəmiyyətindən bəhs olunur. Əxlaqi mahiyyətli bu əsərdə tədqiqatçılar İran təsəvvüf ənənəsinin də təsirini görürlər. Həmin uzun məsnəvidən sonra isə Yunusu Yunus olaraq tanıdan ilahilər, Bəktaşi təbiri ilə deyilərsə, nəfəslər gəlir. Vəhdəti-vücud fəlsəfəsinə aid, təsəvvüf rəmzləriylə zəngin olan bu coşqulu, mənaca dərin hikmətli parçalarda əzəli eşqdən gələn səmimi fəryad, hayqırış və təmiz bir həyəcan var.

Yunus Əmrəyə düşüncələrini dövrün türk təsəvvüf mədəniyyəti çərçivəsində dilə gətirən sufi şair gözüylə baxanlar olduğu kimi "həqiqi türklük zərrəcə təsəvvüf cilvəsi göstərməmişdir" deyib onu "millətindən və lisanından başqa türklüklə heç bir əlaqəsi olmayan neoplatonist", hətta türk-islam mədəniyyətindən daha çox qədim dövr Anadolusunun bütpərəst mədəniyyətinin yetirməsi sayanlar da olmuşdur. Ayrıca namazın və həccin gərəkliliyinə dair şeirləri olduğu halda şairin irsinə ateist meylli yanaşma tərzi ilə səciyyələnən, elmi gerçəklərə də büsbütün zidd olan bu son baxışın hətta bir sıra tərəfdarlarına görə, Yunus Əmrə Tanrını insanlaşdırmaqdan insanı tanrılaşdırmağacan bütün hallardan keçmişdir; guya dindarlığına və müsəlman görünüşünə baxmayaraq, o, heç bir dinin adamı deyil, kitabsız, qibləsiz, Allahsız bir inancın adamıdır. Halbuki:

*Namaz qılmayana sən müsülmandır deməgil,*
*Hərgiz müsülman olmaz, bağrı dönmişdür taşa –*

söyləyən Yunusun duyğu və düşüncə aləmini hazırlayan mədəniyyətin qaynağında, həqiqətən dərin bir iman, İslam imanı dayanır. Sufi şairin, imanı qədər

dərin və səmimi olan insan sevgisi isə onun əslində insanda Allahdan bir zərrə olduğunu bilməyindədir. O zərrə bir Tanrı əmanətidir ki, can içində oturub ilahi nuruyla dolu dərviş könlünü ərş eyləyən Dostdan gəlir. Yaradılmışı Yaradandan ötəri sevən Yunus həmin zərrənin bütünü olana – Allaha aşiqdir. Bir könül əri olan Yunus Əmrənin bu ilahi sevgisinin Tanrısız fəlsəfədən qaynaqlanan fəlsəfi humanizm, Allahsız bir sevgi olaraq düşünülə bilməsi əsla mümkün deyil.

Eşqin ülviliyi və sirr dolu mahiyyətindən danışan dərviş Yunus gözləri həmişə mənəvi aləmin dərinliklərinə dikili olduğuna görədir ki, hətta təbiət lövhələrindən bəhs eləyən zaman bu lövhələri vicdani rənglərlə boyayır, onlara əxlaqi, hikmətamiz bir məzmun verir. Hər biri min naz ilə Haqqı vəsf eyləyən çiçəklərdən Tanrının ətrini alan Yunus ilahi eşqin qüdrətli tərənnümçüsüdür:

*Eşq odına yananlarun külli vücudı nur olur,*
*Ol od bu oda bənzəməz, hiç bəlürməz zəbanəsi.*

Buna görə də eşq şərabını içib içəli işi ahü zar olan şair gerçək aşiqin diliylə: "...var eşq rənginə boyan" – söyləyir. Çünki "əvvəl yer-göğ yoğ ikən bünyadı var olan" həmin əzəli eşqdir. "Çələbün dünyəsində yüz bin dürlü sevgi var...", "Eşq sözini söyləyən cümlə qüdrət dilidür" – deyilməyi bu üzdəndir. Ən yüksək bilgi əldə eləyən və Haqqa yetişən kamil insan olmağın yolu varlığı içəridən bir-birinə bağlayan və "cümlə qüdrət dili"ndə söylənən bu eşqin dərkindən keçir.

Həqiqətən eşqdən doğulan ilahi nuru kimi Yunus Əmrənin "divanının böyük qismi eşq fəryadlarıyla doludur" (F.Köprülü). "Yürəginə eşq odın urmayan aşiqmidür?!" deyə haqlı sual eləyən Dərviş Yunus cahanın Həqqlə dolu olduğuna dair görüşlərini belə dilə gətirir:

*Həqq cəhana tolıdur, kimsələr Həqqi bilməz,*
*Anı sən səndən istə, o səndən ayru olmaz.*

*Dünyayə inanursın, rizqə bənümdür dersin,*
*Neçün yalan söylərsin, çün sən dedügün olmaz.*

*...Dünyayə gələn köçər, bir-bir şərbətin içər,*
*Bu bir köpridür keçər, cahillər anı bilməz.*

*Gəlün tanışıq edəlüm, işün qolayın tutalum,*
*Sevəlüm seviləlüm, dünyayə kimsə qalmaz.*

Gecə-gündüz Həqq dileyenlərə, Həqq isteyenlərə, lakin onu özündən qıraqda arayıb axtaranlara "məna bəhrinə dalıb Vücud seyrini qılan" miskin Yunusun sözü budur:



*Ey dünü gün Həqq istəyən, bilməzmisin Həqq qandadur?*
*...İstəməgil Həqqi ıraq, könüldədür Həqqə duraq,*
*Sən sənligün əldən bıraq, təndən içərü candadur.*

Yunusun dost dediyi də Həqdir... Səhər çağı gördüyü məzarlıqda çürümüş torpaq üstə qarışan tənlərin halını yanğılı-yanğılı təsvir elərkən, bəzisi tutuşub yanan bu məzarlıqda Dərviş Yunus qara torpağın altında belə gül dərən əlləri görür. Bəlkə bu üzdəndir şair insanları yalançı, fani dünyaya aldanmamağa, bununçünsə bir ikən ayrılmayıb Dosta – üzü Həqqə doğru getməyə çağırır:

*Bu dünyayə qalmayalum, fanidür aldanmayalum,*
*Bir ikən ayrılmayalum, gəl dosta gedəlüm, könül*

Bütün varlıqların Tanrını bildiyini söyləyən Yunus bütün varlığıyla ona da inanmışdır ki, ruhları dünya kirinə bulaşdığından dünya üçün oda düşüb yananlar bu eşqin nə olduğunu heç bir halda anlaya bilməzlər. İnsanları maddiyyat batdağında çırpınıb duran qarmaqarışıq dünyamızın bu üzdən ona sonsuz ehtiyacı var...

*Diliyilə eşq deyənlər bilməzlər eşq nəydügini,*
*Eşqdən xəbər ayıtmasun kim dünyə izzətin sevə.*

İslam təsəvvüfünün ən dərin mətləblərini bütün incəliklərinə qədər sadə, səlis və yüksək xəlqiliyi ilə seçilən aydın bir dildə anladan bu böyük müsəlman-türk xalq şairi Tanrı, ilahi eşq, varlıq və yoxluq, həyat və ölümdən bəhs etmiş, dünyanın faniliyi, gerçəkliyin əqllə, elmlə idrak oluna bilməyəcəyi kimi məsələlər üzərində dayanmışdır.

İslami təsəvvüf görüşünü ən böyük mütəsəvviflərdə belə rast gəlinməyəcək qədər gözəl və təbii şəkildə anladan Yunus Əmrə sözün həqiqi mənasında, türk ədəbiyyatının azman şairlərindəndir. Şeyx Əziz Mahmud Xudayi (?-1623) onun haqqında belə deyirdi: "Mənəvi mərtəbələrin hansına yetdimsə bu türkmən dərvişi Yunusu önümdə gördüm".

Vəhdət məqamına yetmiş Mövlana Cəlaləddin Rumi fəlsəfəsini dərindən mənimsəyən, özü də "qüvvətli bir məlamət cəzbəsiylə yoğrulmuş coşqun vəhdəti-vücudçu olan" şair eynilə onuntək bütün insanları bir bərabərdə tutmuşdur:

*Yetmiş iki millətə bir göz ilə baqmayan*
*Şər'in övliyasıysa həqiqətdə asidür,*

ya da:

*Dinü millətdən keçən, eşq əsərindən duyan,*
*Məzhəbü dinmi seçər kəndüyi yoğa sayan?!*

sözlərindən göründüyü kimi, o, dinindən və millətindən asılı olmayaraq insanların hamısını bir gözdə görmüşdür.

Haqq nurunun eşq atəşiylə yanıb Haqq ilə haqq olmaq məqamına yetənlər onlara daş atanlara güllər nisar eləyəcək qədər uca ərdəm yiyələridir, qoca aşiq Yunus da eləcə:

*Önümcə quyu qazanı Həqq təxtünə ağdürsun anı,*
*Ardumca taşlar atana – güllər nisar olsun ana.*

Mütəsəvviflərin nəzərində elm iki cürdür. Biri zahir elmi və ya şəriət elmidir ki, əsasında ağıl dayanır, yeri də mədrəsələrdir (Yeri gəlmişkən, Yunus Əmrənin Haqqı sırf ağılla bilmək iddiasında olan bu insanlarla heç bir zaman işi olmamışdır). İkincisi isə batin elmi və ya həqiqət elmidir ki, qaynağında ilham dayanan bu elmə sufilər "irfan" deyirlər. Allah elmdən çox irfanla bilinir. İrfan hər gözə, hər könülə görünməyən Tanrını bilməkdir. Bu irfan dərəcəsinə isə eşq yoluyla gedilir. Mədrəsə elminə qarşı təkyə irfanını üstün görməyi Yunus Əmrənin Allahı bəyan eyləyən əlif hərfinə işarətlə söylədiklərindən də bəlli edir. Elm oxumaqla olmayan həmin irfandı ki, könül kitabından oxunur. "Eşq ilən mən aşinayəm, əql ilən yad olmuşam" – deyən ölməz Nəsimi kimi, "Eşq imiş hər nə varsa aləmdə // Elm bir qilü qal imiş ancaq" söyləyən ölümsüz Füzuli kimi Dərviş Yunus da elmlə eşq arasındakı çarpışmanı eşqin xeyrinə həll eləyir və deyir ki:

*Elm ilə, hikmət ilə kimsə irməz bu sirrə,*
*Bu bir əcaib sirdür, elmə, kitaba sığmaz.*

On səkkiz min aləmi bir zərrədə görmək, o bir zərrəni yarıb da onda günəşi duymaq gücünü verən həmin sirri isə, doğrudan da, bəyan edən, dedirdən Haqq-tealadır, ancaq "söz əslini anlamayan sanur bu söz bəndən gəlür", əslində isə yenə sufi şairin özünün dediyi kimi, "Yunus bilməz kəndü halin, Çələbdür söylədür dilin..." Bu mənada sistemli yanaşma tələb eləyən Yunus Əmrə irsini köklü şəkildə anlaya bilməyin öz yolu var. Yeni onun, insanı bir anda özünə inandıracaq qədər heyrətamiz ilahilərinə sadəcə elmi şərh verək yetməz. Üstəlik həmin hikmətlərin tək bir "Süleymandan içəri var olan Süleyman" üçün anlanacaq rəmzlər dolu öz dili vardır:

*Bənüm dilüm quş dilidür, bənüm elüm dost elidür,*
*Bən bülbüləm, dost gülümdür, bilün, gülüm solmaz bənüm.*

Yunus heç bir zaman xalqdan ayrılmamış, bu üzdəndir ki, bütün dövrlərdə xalqın sevimlisi olaraq qalmışdır. Moğolların Anadolunu darmadağın elədikləri dövrdə yaşayan şair zaman-zaman da çevrəsindəki insanlardan şikayətlənmiş, bu şikayətlərini:



*Bəglər azdı yolından, bilməz yoqsul halindən,*
*Çıqdı rəhmət gölindən, nəfs gölinə talmışdur.*

və ya:

*Bində biri bu xəlqin Rəhman yoluna girməz,*
*Gəl bir kişi göstər kim, şeytan yoluna girməz –*

deyə bütün həqiqət isteyənlər kimi acı-acı dilə gətirmişdir.

Yunus Əmrə, şübhəsiz, fəlsəfi bir sistem quran böyük filosof deyil, lakin təsəvvüfün əsaslarını, ən qarışıq metafizik məsələləri heç sənətkarlıq qeydinə qalmaya-qalmaya belə sənətkarcasına, sistemli və başlıcası budur ki, ən sadə, əslində isə ilahi bir dillə ifadə edən dahi şairdir. Açıq-aydındır ki, könlü vəcd içində qərq olan şair sırf ruhi həyəcanlarını dilə gətirmək istəmişdir. Bir çoxlarının əsassız iddialarla hürufi şairlər sırasına daxil etmək istedikləri Yunus həqiqətən atəşin bir mütəsəvvifdir. Yunusu oxuyarkən gözlər önündə könlü bütün yaradılmışlara sevgi selinə qərq olmuş bir dərvişin aydan arı ruhu canlanır. İfadə tərzindəki təbiiliyi ilə heyran eləyən şair bu sonsuz səmimiliyi sayəsində oxuyanları bir andaca özünə tam inandırır.

Türkiyə alimlərindən xüsusən prof. Ə.Y.Ocağın son araşdırmaları sayəsində Yunus Əmrənin, təkyəsi və müridləri olan bir məlaməti-qələndəri şeyxi olduğu gerçəyi sübuta yetirilmiş sayıla bilər. Həqiqətən islam təsəvvüf tarixinin diqqətçəkən hadisələrindən biri kimi böyük sufilər tərəfindən inkişaf etdirilən məlamətilik məktəbinin adına şairin divanında tez-tez rast gəlinir:

*Gerçək sana aşiq isəm, arlanmaqlıq nə'mdür bənüm?*
*Şükranə canumı verəm, gər məlamət tonın geyəm.*

***

*Hələ biz işbu yola gəlmədük riyayilə,*
*Bu məlamətlik tonın bizümlə geyən gəlsün.*

Məlaməti-qələndəri sufilər insanı ilahi eşqin zövqünə qovuşdura bilməyən quru elmlə yanaşı, quruca ibadəti və ibadətdən ibarət islam anlayışını da rədd edirdilər. Yunus Əmrə də eləcə, bir qədər əvvəl qeyd olunduğu kimi, nəinki quru elmə qarşı çıxır, "Bir gəz könül yıqdun isə bu qılduğun namaz dəgül" – deyərək ruhsuz ibadət anlayışını heç bir şəkildə qəbul eləmirdi:

*Aq saqallu pir qoca biliməz hali necə,*
*Əmək yeməsün Həccə, bir könül yıqar isə.*

Yunus Əmrə milli dühadır; möhtərəm F.Köprülünün doğru söylədiyi kimi, "bütün türk ədəbiyyatı mənşəyindən bu günə qədər ondan daha böyük bir mütəsəvvif şair yetirə bilməmişdir".

XIII yüzil Anadolusunda yeni bir ədəbi dilin meydana gəlməsində Yunus Əmrənin əvəzsiz xidməti olmuşdur. Azərbaycan türkcəsinə də son dərəcə yaxınlığı və bənzərliyi ilə seçilən əski Anadolu türkcəsini son dərəcə cilalı bir biçimdə işləyən, onu inkişaf etdirən böyük sənətkarın şeirlərində türk dili özünün ən gözəl, ən təmiz şəklini almışdır.

Yunus Əmrə yaradıcılığının fonetik, morfoloji, ümumən qrammatik özəllikləri bütünlüklə dövrə aid xüsusiyyətləri daşıyır. Şairin dilində, məsələn, "qanda, qaçan, qancaru, kəndözi" əvəzlikləri, "o an" mənasında "oluq dəm", "ol" ilə yanaşı "şol" işlədilir, yaxud indiki zamanda "durur" şəkilçisindən, "-acaq, -əcək" gələcək zaman şəkilçisinin tam qarşılığı kimi "-(i)-sər"dən, sifətin üstünlük dərəcəsini bildirən "-rək" ("yegrək") şəkilçisindən, feli bağlama şəkilçilərinin "-madın, -mədin" formasından, qədim formantlı "deyü" feli bağlamasından, felin "-ğıl, -gil" şəkilçili əmr formasından, "-cılayın, -ciləyin" qoşmasından və b. istifadə olunur ki, bütün bu əlamətlərə tarixən Azərbaycan türkcəsinin qrammatik quruluşunda da rast gəlir.

Yunusun əsərlərində bədii dil üçün məqbul sayılan xalq danışıq dili özəllikləri (məsələn, "sayəban, şəhər..." yerinə "sayvan, şər..." deyilməyi kimi) qorunub saxlanmış, mütləq ədəbi dil normalarına uyğunlaşdırılmamışdır. Şairin dilində dövrün özüylə gələn bir ikilik də vardır. Yəni Yunus bir yandan "Allah, yəzdan, cənnət, cəhənnəm, eşq, elm, məst, vəli, vəhdət, Əzrayil, ğəssal, nur..." deyirsə, digər yanda da "Tənqri, çələb, uçmaq, tamu, sevi, bili, əsrük, ərən, birlik, canalıcı, yuyucı, ışıq..." sözlərini işlədir. Şairin dili bu qəbildən "əsən, görklü, aytmaq, irmək, arı, nəsnə..." kimi çox sayda qədim türk sözləri ilə zəngindir ki, həmin sözlərə "Kitabi-Dədə Qorqud"un, həmçinin digər abidələrin, o cümlədən orta əsrlərdə yazıb-yaradan Azərbaycan şairlərinin dilində işlənir.

Yunus Əmrənin dilində "Dərd gərəkdür, dərd gərəkdür, dərd gərək..." şəklindəki təkrirlərlə yanaşı bitib-tükənməyən işıq və enerji dolu "Eşq yağmurı tamlası könül gögindən tamar", "Nəfsümün başını kəsdüm, qanadlanub uçar oldum", "Qarlı tağların başunda salqım-salqım olan bulut..." ya da:

*Bu dünyədə bir nəsnəyə yanar içüm, göynər özüm –*
*Yigid ikən ölənlərə göğ əkini biçmiş kibi –*

deyimləri də istənilən qədərdir. Bu mənada Yunus Əmrənin ürək qanı, dərin zəka və fitri istedadla yaratdığı əsərlərin dili son dərəcə də obrazlıdır. İrfan əsaslı, zərif üslublu bu dolğun dilin öz melodiyası, özünün obrazlar hörgüsü və çələngi var. Bir yunan filosofuna isnad olunan kəlam Yunus Əmrənin dilində nə qədər gözəl səslənir: "Bən sanur idüm bilürəm, uş şimdi bildüm bilməzəm".



Dərviş Yunusun dili xalq hikmətindən yoğrulmuş olub, məsələn, "Yüz çuqalu gəlürsə yalıncağı soyamaz", "Kim kimə quyı qaza, kəndü düşə", "Tağ nə qədər yüksək isə yol anun üstindən aşar", "Arifə bir söz yetər.." kimi çox sayda atalar sözləri ilə də bəzənib süslənmişdir.

Türk ədəbiyyatının ilk mütəsəvviflərindən olan Yunus Əmrənin xəlqi ruhlu şeir dili XIII əsr türkcəsinin milli çöhrəsini, bu dilin səs arxitektonikasını son dərəcə canlı, işıqlı və aydın əks etdirir. Türk dilinin bir yazı dili, sənət və mədəniyyət dili olmasında "aşiq qoca" son dərəcə böyük xidmət göstərmişdir. İslam-türk mədəniyyətinin bütün zənginliyini özündə toplayan həmin bu dildə türk xalqının bütün duyğu və düşüncələri, hiss və həyəcanları, var olan mənəvi zənginliyi ən son həddinəcən sadə və səmimi bir şəkildə ifadəsini tapmışdır. Hər kəsin anlaya bildiyi qədər son dərəcə anlaşıqlı, musiqi dolu bir dildə – təmiz türk dilində yaradan dərviş Yunusu xalq yüzillər boyu sevə-sevə oxumuş, övliya qatında əziz və müqəddəs bilib onu bu günlərəcən yaşatmış, türk dili var olduqca da yaşadacaqdır. Çünki Yunus Əmrə "vətən coğrafiyasının torpaqdan yüksələn bütün gözəl səslərini türk xalq diliylə birləşdirmişdir", bu üzdən də onun unudulması sadəcə olaraq mümkün deyil.

Yunus Əmrənin qəzəllər və ilahilərdən ibarət divanında təxminən 300-350 şeir toplanmışdır. Lakin şairə isnad olunan şeirlərin sayı mindən artıqdır. Buna səbəb Yunus Əmrədən sonra bu ad altında bir çox şairin yazıb yaratmasıdır. Ona görə də şairin əsərləri dəfələrlə nəşr olunsa da, şeirlərin sayı az qala hər dəfə dəyişir, bir nəşrdə yer alıb Yunus Əmrənin olduğu sanılan şeir digərində ona aid edilmir. Bununla belə, araşdırıcıların qənaətinə görə, həmin şeirləri böyük Yunus Əmrənin əsərlərindən ayırmaq da çətin deyil. Onların sırasında tək bir Aşiq Yunus istisna təşkil edir. XIV əsrin sonları – XV əsrin əvvəllərində Bursada yaşamış bu şairin şeirləri dil və üslub baxımından Yunus Əmrənin əsərlərinə çox yaxın sayılır; həmin şeirlərdir ki, əsrlərlə Yunus Əmrənin olduğu zənn edilibdir.

Yunus Əmrəni XX əsrdə elm aləminə tanıtmaq şərəfi "Türk ədəbiyyatında ilk mütəsəvviflər" əsərinin müəllifi, şöhrətli alim Fuad Köprülüyə nəsib olmuşdur. Sonrakı dövrdə şairin divanı dəfələrlə işıq üzü görmüşdür. Onun əsərlərinin nəşri və öyrənilməsi Bürhan Topraq, Əbdülbaqi Gölpınarlı və bir sıra başqa Yunus Əmrə araşdırıcılarının adları ilə sıx bağlıdır.

Azərbaycan oxucusu Yunus Əmrənin əsərləri ilə daha çox şairin 750 illik yubileyi şərəfinə Bakıda nəşr olunmuş "Güldəstə" şeirlər toplusundan tanışdır. Müasir Azərbaycan türkcəsinə uyğunlaşdırılmış bu kitab eyni adlı toplunun 1990-cı il Ankara nəşri əsasında hazırlanmışdır.

Geniş oxucu kütləsi üçün hazırlanan, sırf akademik olmasa belə, elmi əsaslara söykənən hazırkı nəşrdə isə Yunus Əmrə divanının dil xüsusiyyətlərinə mümkün qədər sadiq qalınmasına çalışılmışdır. Latın əsaslı Azərbay-

can əlifbasından çıxarılmış apostrof işarəsi də mətndə bu məqsədlə saxlanılmışdır. Çünki bu ədəbi irs dövrün – XIII-XIV yüzillər Anadolu türkcəsinin həqiqi toxunulmaz dil xəzinəsidir. Azərbaycan oxucusuna təqdim olunan bu kitabda məhz həmin cəhət xüsusi nəzərə alınmış, bu üzdən kitab tərtib edilərkən Yunus Əmrə əsərlərinin ən əski və ən yaxşı nüsxə sayılan Fateh nüsxəsi əsasında tanınmış alim Əbdülbaqi Gölpınarlı tərəfindən hazırlanmış 1965-ci il İstanbul nəşri əsas götürülmüşdür (210 vərəqlik hərəkəli Fateh nüsxəsinin fotosurəti verilən həmin kitabda adı çəkilən nüsxədə olmayıb Yunus Əmrə divanının digər nüsxələrində rast gəlinən şeirlər də yer alır). Aşiq Yunusa aid şeirlərin tərtibində isə prof. Faruq K.Timurtaş tərəfindən hazırlanan "Yunus Əmrə divanından seçmələr"ə (Ankara, 1989) də istinad olunmuşdur.

Kitabın sonuna klassik ədəbiyyatda sıx təsadüf olunan, müasir oxucu üçünsə anlaşılması bəlli ölçüdə çətinlik törədə bilən sözlərdən ibarət lüğət də əlavə edilmişdir.

***Cəlal Bəydili (Məmmədov)***





## 1

Sənsüz yola girür isəm çarəm yoğ adım atmağa,
Gövdəmdə qüvvətüm sənsin başum götürüp getməgə.

Könlüm, canum, əqlüm, bilüm sənün ilə qərar edər,
Can qanadı açuq gərək uçuban dosta getməgə.

Kəndüligindən keçəni toğan edər mə'şuq anı,
Ördəgə, kəkligə salar sürə irübən tutmağa.

Bin Həmzəcə qüvvət vermiş qadir Çələb eşq ərinə,
Tağları yolından ırar, qəsd edər dosta getməgə.

Yüz bin Fərhad külüng alup qazar tağlar bünyadını,
Qayalar kəsüb yol edər abi-həyat aqıtmağa.

Abi-həyatun çeşməsi aşiqlərün vüsalidür,
Söhbəti eşq ilə edər susamışları yaqmağa.

Aşiqmi derim bən ana Tənqrinün uçmağın sevə?!
Uçmaq xud bir tuzaqdurur əbləhlər canın tutmağa.

Aşiq olan miskin olur, Həqq yolına təslim olur,
Hər nə dersən boyun tutar, çarə yoq könül yıqmağa.

Bildük gələnlər keçdilər, gördük qonanlar köçdilər,
Eşq şərabın içən canlar uymaz köçməgə, qonmağa.

Dutulmadı Yunus canı, keçdi tamudan uçmağı,
Yola düşüb dosta gedər ol əslinə uyaqmağa.

2

Eşqdən də'vi qılan kişi hiç anmaya hirsü həva,
Eşq evinə girənlərə ayruq nə meylü nə vəfa.

İzzətü ərkan qamusı bunlardur dünyə sevgüsi,
Bənüm cəvabum sən ayıt, eşqə izzətimdür bəha.

Diliyilə eşq deyənlər bilməzlər eşq nəydügini,
Eşqdən xəbər ayıtmasun kim dünyə izzətin sevə.

Hər kim izzətdən keçmədi, aşiqlik böhtandur ana,
Keçəməz dost döşəginə atü qatır, yaxud dəvə.

Yunusa aşiq deyübən zinhar özənüb gəlməgil,
Çoq bəzirgan peşman olur varıcağız uzun yola.

3

Bir gün yüzün görən kişi ömrincə hiç unutmaya,
Təsbihi sənsin dilində, ayruq nəsnə ayıtmaya.

Taətə turan zahidün gözləri səni görürsə,
Təsbihini unudup ol ayruq səcdə də etməyə.

Ağzına şəkkər aluban gözləri sana tuş olan,
Unıda ol şəkərini ayruq çeynəyüb yutmaya.

Bən səni sevdigüm içün əgər bəha derlər isə,
İki cəhan mülkin verəm dəxi bəhası yetməyə.

İki cəhan toptolu bağu bustan olur isə,
Sənün qoqundan eyü gül bustan içində bitməyə.

Gülü reyhan qoqusı aşiqlərə mə'şuq yetər,
Aşiq olanun mə'şuqı hərgiz ögindən getməyə.





İsrafil surın urıcaq, məxluqat turu gəlicək,
Sənün önündən artuq hiç qulağum eşitməyə.

Zöhrə yerə enübəni sazın nüvəxt eylər isə,
Aşiqün işrəti sənsüz gözi ol yanə getməyə.

Nə edərlər xanümanı ya sənsüz iki cəhanı,
İki cəhan fəda sana, kimsənə güman dutmaya.

Səkiz uçmağun hurisi əgər bəzənüb gələlər,
Sənün sevgündən özgəyi (könlüm) hiç qəbul etməyə.

(Bu) Dünyədə nə ola kim axirətdə ol olmaya,
Hurilə ğılman gəlicək aşiq əlin uzatmaya.

Yunus səni sevəlidən bəşarət oldı canına,
Hər dəm yeni dirlikdədür, hərgiz ömrin əskitməyə.

4

İki cəhan zindan isə gərək bana bustan ola,
Ayruq bana nə ğəm-ğüssə, çün inayət dostdan ola.

Varam ol dosta qul olam, həm açıluban gül olam,
Həm ötüb bülbüli olam, turağum gülüstan ola.

Dost yüzini gördi gözüm, ərənlərə topraq yüzüm,
Söz anlayana bu sözüm gərək şəkəristan ola.

Hər dəvadən keçən kişi, dostdan yana uçan kişi,
Eşq şərbətin içən kişi gəh əsrük, gəh məstan ola.

Sənsüz iki cəhan bənüm zindan görinür gözümə,
Sənün eşqünlə bilişən gərək xasül xasdan ola.

Eşqə doyamadı özüm, kəksüzin söylərin sözüm,
Yunus, sənün işbu sözün aləmlərə dəstan ola.

**5**

Eşq ətəgin tutmaq gərək, aqibət zəval olmaya,
Eşqdən oquyan (bir) əlif kimsədən sual olmaya.

Eşq dedügin tuyar isən, eşqə candan uyar isən,
Eşq yoluna candur fəda, ana fəda mal olmaya.

Əsilzadələr nişanın əgər bilmək dilər isən,
Özi oğlan da olursa, sözində vəbal olmaya.

Ariflərdən nişan budur hər könüldə hazır ola,
Kəndüyi təslim eyləyə, sözdə qiylü qal olmaya.

Görməzmisin sən aruyı, hər bir çiçəkdən bal edər,
Sinək ilə pərvanənün yuvasında bal olmaya.

Dürrü cövhər istər isən ariflərə xidmət eylə,
Cahil bin söz söylər isə mə'nidə misqal olmaya.

Miskin Yunus, zəhri-qatil eşq əlində tiryak olur,
Elmü əməl, zöhdü taət bəs eşqsüz həlal olmaya.

**6**

Ey aşiqlər, ey aşiqlər, məzhəbü din eşqdür bana,
Gördi gözüm dost yüzini, yas qamu dügündür bana.

Ey padişah, ey padişah, uş bən bəni verdüm sana,
Gəncü xəzinəm qamusı sənsin bənüm öndən sona.

Əvvəl dəxi bu əqlü can sənün ilə əsli məkan,
Axır yenə sənsin məkan, uş varuram səndən yana.

Səndən sana varur yolum, səndən səni söylər dilüm,
İllah sana irməz əlüm, bu hikmətə qaldım tana.



Ayruq bana bən deməyəm, kimsənəyə sən deməyəm,
Bu qul o sultan deməyəm, eşidənlər qala tana.

Dost eşqə ulaşalıdan dünya axirət bir oldı,
Əzəl, əbəd sorar isən, dün ilə bu gündür bana.

Ayruq bizə yas olmaya, hiç könlümüz pas olmaya,
Zira Həqdən gələn avaz savulmaz dügündür bana.

Bən eşqündən ayrılmıyam, dərgahindən ırılmıyam,
Əgər bəndən gedərisəm sənün ilə varam bana.

Ol dost bəni veribidi, var bu dünyayı gör dedi,
Gəldüm gördüm xoş arayiş, səni sevən qalmaz ana.

Qullarına və'd eylədi, yarın uçmaq verəm dedi,
Ol dostlarun sevindügi yarınum bu gündür bana.

Bu ah ilə, bu zar ilə bu hikməti kim nə bilə,
Bilsə dəxi gəlməz dilə, tutdum yüzüm səndən yana.

Sənsin bana canü cəhan, sənsin bana gənci nihan,
Səndəndürür assı ziyan, nə iş gələ bəndən bana?!.

Yunus sana tutdı yüzin, unutdı cümlə kəndözin,
Cümlə sana söylər sözin, söz söylədən (sənsin) bana.

**7**

Anmamısın (sən) şol güni cümlə aləm heyran ola,
Nedəsini bilimeyüb bixudü sərgərdan ola.

İsrafil surını ura, həb məxluqat yerdən tura,
Dərilübən həşrə vara, qazi anda Sübhan ola.

Zəbanilər çəkə duta, ilədə tamuya ata,
Dəri yana, sünqük tütə, qatı ulu əfğan ola.

Malik çağıra tamuya, çəküb meydana gətirə,
Tənqri qorqusından tamu zari qılub nalan ola.

Tağlar yerindən ırıla, göglər heybətdən yarıla,
İlduzlar bağı qırıla düşə yerə ğəltan ola.

Yazuqlarımuz dartıla, anca pərdələr yırtıla,
Bilmədügün günahlarun anda sana əyan ola.

Yunus aydur işbu sözi, ərənlərə topraq yüzi,
Dilər Həqqi görə gözi, inayət gər andan ola.

### 8

Gedər idüm bən yol sıra, yavlaq uzamış bir ağac,
Böylə lətif, böylə şirin, könlüm aydur bir qaç sir aç.

Böyl' uzamaq nə mə'nidür, çünki bu dünyə fanidür,
Bu füzullıq nişanıdur, gəl bəri miskinligə keç.

Böylə lətif bəzənübən, böylə şirin düzənübən,
Könül Həqqə uzayuban dilək nədür, nəyə möhtac?

Ağaç qarır, dövran dönər, quş budağa bir gəz qonar,
Dəxi sana quş qonmamış nə gögərcin, nə xud durac.

Bir gün sana zəval irə, yücə qəddün enə yerə,
Budaqlarun oda girə, qaynaya qazan, qıza sac.

Yunus, imdi sən bir necə, əksükligün yüz bin onca,
Qur' ağaca yol sorunca təfərrüclən yoluna keç.

### 9

Sən bu cəhan mülkini Qafdan Qafa dutdun tut,
Ya bu aləm malını oynayuban utdun tut.

Süleymanın təxtinə şad olup oturdun, bil,
Divə, pəriyə düpdüz hökmləri etdün tut.



Fir'ovnun xəzinəsin Nuşinrəvan gənciylə
Qarun malına qatub sən maluna qatdun tut.

Bu dünya bir loqmadur, ağzunda çeynənmiş bil,
Çeynənmişə nə yudmaq, ha sən anı yutdun tut.

Ömrün sənün oq bigi yay içində toptolu,
Tolmış oqa nə turmaq, ha sən anı atdun tut.

Hər bir nəfəs kim gəlür, kəsədən ömr əksilür,
Çün kəsə ortalandı, sən anı dükətdün tut.

Çün dənizə ğərq oldun, boğazuna gəldi su,
Dəli bigi talbınma, ey biçarə, batdun tut.

Yüz yıllar xoşlığ ilə ömrün olursa, Yunus,
Son ucı bir nəfəsdür, keç, andan da ötdün tut.

### 10

Netəligüm soran, eşit hekayət:
Su vü topraq, odü yel oldı surət.

Dört müxalif nəsnədən dört divarun
Sazkar eylədi verdi kəramət.

Yel ilə toprağı qıldı müəlləq,
Su içində odı dutdı səlamət.

Rizqi ömri təmam eylədi hənuz,
Şeş cəhət olmadın tutduğı kisvət.

Ruhumdan kimsənə xəbər verəməz,
Əmrdür qadirliği verür hərəkət.

Baqi tərtiblərümi şərh edəyim,
İnayət mövcudi səm'i-bəsarət.

Əqlimün xəbəri bugünki dəgül,
Anı ər der isən əvvəlki ayət.

Sual-cəvab kəlecisi buna dəgindür,
Bundan böylə cəhanum binəhayət.

Yunus ilə buna dənlü nəsibüm,
Könül dost turağı, dilüm şəhadət.

### 11

Eşq imamdur bizə, könül cəmaət,
Qibləmüz dost yüzi, daimdür səlat.

Dost yüzni göricək şirk yəğmalandı,
Anunçün qapuda qaldı şəriət.

Könül səcdə qılur dost mehrabında,
Yüzin yerə urub qılur münacat.

Münacat kibi vəqt olmaz arada,
Kim ola dost ilə bu dəmdə xəlvət.

Şəriət aydur saqın şərti bıraqma,
Şərt ol kişiyə kim edə xəyanət.

Ərənlər nəfəsi dövlətlü rümuz,
Anunla fitnədən olduq səlamət.

Bəli qövlin dedük əvvəlki dəmdə,
Hənuz bir dəmdür ol vəqtü bu saət.

Dərildi beşümüz bir vəqtə gəldi,
Beşi bir eyləyüb kim qıla taət.

Biz kimsə dininə xilaf deməzüz,
Din təmam olıcaq toğar məhəbbət.



Toğurlıq bəkliyən dost qapusında,
Gümansuz ol bulur ilahi dövlət.

Yunus ol qapuda kəminə quldur,
Əzəldən əbədə dəkdür bu izzət.

### 12

Dinü millət sorar isən, aşiqlərə din nə hacət?!
Aşiq kişi xərab olur, aşiq bilməz din diyanət.

Aşiqlərün könli gözi mə'şuq deyə getmiş olur,
Ayruq surətdə nə qalur kim qılisər zöhdü taət.

Taət qılan uçmağ içün, din tutmayan tamu içün,
Ol ikidən fariğ olur, nəyə bənzər bu işarət.

Hər kim dostı sevərisə dostdan yana getmək gərək,
İşi-güci dost olıcaq cümlə işdən olur azat.

Anun kibi mə'şuqənün xəbərini kim gətürür,
Cəbrayilü mürsəl sığmaz, şöylə olındı işarət.

Soru, hesab olmayısar dunya axirət qovana,
Münkirü Nəkir nə sorar tərk olıcaq cümlə murat.

Xovfü rəca gəlməz anda varlıq yoqlıq bırağana,
Elmü əməl sığmaz anda nə tərazu var, nə sırat.

Ol qiyamət bazarında hər bir qula baş qayısı,
Yunus, sən aşiqlər ilə hiç görməyesin qiyamət.

### 13

Dün gedər gündüz gəlür, gör necəsi uz gəlür,
Padişah hökmüyilə aləmə düpdüz gəlür.

Qarañğulıq sürilür, aləm münəvvər olur,
İşıdı nur qəndili həvaya az-az gəlür.

Bir baqğıl sağa-sola, qayıqma dəgmə yola,
Dinilə quş ünini, necə dürlü saz gəlür.

Quş xu(d) yumurdayidi, yuvada yerdəyidi,
O xu qüdrət ünidür, bilməyənə qaz gəlür.

Söz issi sözin alur, surət topraqda qalur,
Hər kim bu hali bilür, kəndözindən vaz gəlür.

Eşq bənligüm ilətdi, əql dört yanə getdi,
Yunusa yüki yetdi, bilməyənə az gəlür.

## 14

Ey bəni eyibləyən, gəl bəni eşqdən qurtar,
Əlündən gəlməz isə söyləmə fasid xəbər.

Hiç kimsənə kəndüdən haldan-hala gəlmədi,
Cümləmüzün halini mə'şuq edər müqərrər.

Aşiqlərün hər hali mə'şuq qatında bitər,
Sözün var ana söylə, bənüm arada nə'm var?

Hər kim eşq qədəhindən içdiyisə bir cür'ə,
Ana nə yad, nə biliş, ana n'əsrük, nə xümar?!

Dost yüzindən niqabı hər kim gedərdiyisə,
Hicab qalmadı ana ayruq nə xeyrü nə şər.

Şəriət ədəbindən qorqaram söyləməgə,
Yoğ isə aydayıdum dəxi ayruqsı xəbər.

Dost qılıcından Yunus ölür isə ğəm dəgül,
Dost gögindən oyanan mə'şuq bürcindən toğar.



## 15

Eşq ilə biliş canlara əzəl-əbəd olmayısar,
Gümrah olub bu cəhanda kimsə baqi qalmayısar.

Bir tona qan bulaşıcaq yumayınca mismil olmaz,
Könül pisi yunmayınca namaz rəva olmayısar.

Könül pisin yudın isə, kibrü kini qodun isə,
İqrar bütün olmayınca ərdən nəzər olmayısar.

Murdar dünyayə bulaşan, döşirübəni durışan,
Ərdən himmət olmayınca ömür keçər yunmayısar.

Yunus, imdi sən Həqqə ir, dünü gün könlün Həqqə ver,
Könül gözi görməyincə hiç baş gözü görməyisər.

## 16

Eşq məqamı alidür, eşq qədim, əzəlidür,
Eşq sözini söyləyən cümlə qüdrət dilidür.

Deyən ol, eşidən ol, görən ol, göstərən ol,
Hər sözi söyləyən ol, surət can mənzilidür.

Surət söz qanda buldı, söz issi qaçan oldı,
Surətə kəndü gəldi, dil hikmətün yolıdur.

Bu bizüm işrətümüz, oldur bu ləzzətümüz,
İçüb əsridügümüz eşq şərbəti gölidür.

Anı ana dersin anun söyləyən oldur, söz anun,
Ol bizimdür, biz anun, bu ğeyr təsbih dilidür.

Yunus sözində yalan görmədi münkir olan,
Ömrin zülmətə salan mə'rifət yoxsulıdur.

## 17

Bir kişiyə söylə sözi kim, mə'nidən xəbəri var,
Bir kişiyə ver könlüni canında eşq əsəri var.

Şunun kim taşı xoşdurur, bilün kim, içi boşdurur,
Dün gün ötən bayquşdurur, sanma bütün dıvarı var.

Bir dəvləngəc yuva yapar, yürür eldən yavru qapar,
Toğan iləyindən sapar, zir' əlində murdarı var.

Yoqdur toğanla birligi, yə Həqqə layiq dirligi,
Şol kişidən um ərligi, anun səfa nəzəri var.

Surət ilə çoqdur adəm, dəgməsində yoqdur qədəm,
Əvvəl-axır ol pişqədəm Mühəmməd din sərvəri var.

Ərənlər yolıdur meşə, meşə qolaydur qolmaşa,
Meşə olan yerdə, paşa, hərami çoq, Əntəri var.

Şeyxü danişməndü vəli cümləsi birdür ər yolı,
Yunusdur dərvişlər qulı, Taptuq kibi sərvəri var.

## 18

Ey eşq əri, aç gözüni, yer yüzinə eylə nəzər,
Gör bu lətif çiçəkləri, bəzənübən gəldi keçər.

Bunlar böylə bəzənübən, dostdan yana uzanuban,
Bir sor, əxi, sən bunlara, qancarudur əzmi-səfər?

Hər bir çiçək bin naz ilə ögər Həqqi niyaz ilə,
Bu quşlar xoş avaz ilə ol padişahı zikr edər.

Ögər anun qadirligin, hər bir işə hazırlığın,
Əvət, ömri qasirliğin anıcağız bənzi solar.



Rəngi dönər gündən-günə, toprağa dökilür genə,
İbrətdürür anlayana, bu ibrəti arif tuyar.

Nə gəlməgün gəlməkdürür, nə gülməgün gülməkdürür,
Son mənzilün ölməkdürür tuymadunsa eşqdən əsər.

Hər bir sözi tuyayıdun, ya bu ğəmi yuyayıdun,
Yürürkən oynayayıdun, gedəydi səndən karü bar.

Bildün gələn keçər imiş, bildün qonan köçər imiş,
Eşq şərabın içər imiş bu mə'nidən hər kim tuyar.

Yunus, bu sözləri qoğıl, kəndözündən əlün yuğıl,
Səndən nə gələ bir degil, çün Həqdən gəlür xeyrü şər.

## 19

Söyləməmək xərcisi söyləməgün xasıdur,
Söyləməgün xərcisi könüllərün pasıdur.

Könüllərin pasını gər siləyim der isən,
Şol sözi söyləgil kim, sözün xülasasıdur.

"Qul il-Həqq" dedi Çələb sözi toğrı deyənə,
Bu gün yalan söyləyən ertə utanasıdur.

Cümlə yaradılmışa bir göz ilə baqmayan,
Şər'ün övliyasıysa həqiqətdə asidür.

Şəriət xəbərini şərh ilə aydam, eşit,
Şəriət bir gəmidür, həqiqət dəryasıdur.

Ol gəminün taxtası hər necə möhkəm olsa,
Dəniz mövci qat' olsa taxta uşanasıdur.

Bundan içərü xəbər eşit aydayın, ey yar,
Həqiqətün kafəri şər'ün övliyasıdur.

Biz talibi-elmlərüz, eşq kitabın oquruz,
Çələb müdərris bizə, eşq xud mədrəsəsidür.

Övliya səfa-nəzər edəlü gündən bəri,
Hasil oldı Yunusa hər nə ki olasıdur.

## 20

Bu yoqlıq yolına bu gün bizə yoldaş olan kimdür?
Elümüzə günilələm, sorun qardaş olan kimdür?

Nə qalduq işbu iqlimdə, ağır yüklərün altında,
Bu yüklər, bu yapıları döküb haldaş olan kimdür?

Səni bunda veribidi, təfərrüc eylə gəl dedi,
Sən ev yaparsın, ey xoca, evi taraş olan kimdür?

Bu fərşi gördük aldanduq, hənuz ərşə irəmədük,
Bu ərşə fərşə, ey xoca, gör ə fərraş olan kimdür?

Gəlünüz gedəlüm, gəlün ki, Yunus keçdi gö(y)nildi,
Ayaqlara düşər Yunus, bu yola baş olan kimdür?

## 21

Bənəm sahibqiran, dövran bənümdür,
Bənəm uş pəhləvan, meydan bənümdür.

Həramidən bənüm qorqum, qayum yoq,
Bu zorü bu qüvvət Həqdən bənümdür.

Əbubəkrü Ömər ol din ulusı,
Əliyyəl Mürtəza, Osman bənümdür.

Kim ala bu topı çövganumuzdan,
Top uran meydanda çövgan bənümdür.

Yunusam bən Yunus işbu cəhanda,
Bənəm sultan quli, sultan bənümdür.



## 22

Səhha ol aşiq canına, kim dost ilə vüsalı var,
Canı birdür mə'şuq ilə, dəxi nə dürlü halı var.

Canü könül, əqlü fəhm nisar olsun mə'şuqinə,
Pəs aşiqün andan ayru dəxi nə mülkü malı var.

Bu yerü gögü ərşü fərş eşq dadilə qaimdür,
Bünyadı eşqdür, aşiqə hər bir arada əli var.

Aşiqlərün nə kim varı, təcrid gərəkdür arada,
Hər nəsnəyə ol hökm edər, hər yol içində yolı var.

Baqi dirlik sevən kişi gərək tuta eşq ətəgin,
Eşqdən artuq hər nəsnənün dəgşirilür zəvalı var.

Aşiqlərə işbu surət məsəla könlək kibidür,
Yüz bin könlək əskidürsə aşiqlərün mühalı var.

Neçələr aydur Yunusa çün qocaldun, eşqi qoğıl,
Ruzigar uğramaz eşqə, eşqün nə ayü yılı var.

## 23

Eşidün, ey ulu kişi, sizə bənüm xəbərüm var,
Zehi dövlət bənüm bu gün kim, şunun kibi yarum var.

Yürür isəm önümdəsin, söylər isəm dilümdəsin,
Oturursam yanumdasın, ayruqda nə bazarum var.

Nə yüriyəm, nə xud aram, nə uzaq səfərə varam,
Çünki dostı bunda buldum, ayruq nəyə səfərüm var?!

Iraq yola bəzirganlar assı etməgə gedərlər,
Çün göhər əlümdədür(ür), de, ayruq nə səfərüm var?!

Miskin Yunusun (bu) canı şol dosta ulaşalıdan,
Dəmbədəm arturur eşqi, ulu yerdən timarum var.

**24**

Ey sözlərün əslin bilən, gəl de bu söz qandan gəlür?
Söz əslini anlamayan sanur bu söz bəndən gəlür.

Söz (var) qılur qayğuyı şad, söz (var) qılur bilişi yad,
Əgər xorlıq, əgər izzət hər kişiyə sözdən gəlür.

Söz qaradan-aqdan dəgül, yazub oqumaqdan dəgül,
Bu yürüyən xəlqdən dəgül, Xaliq avazından gəlür.

Nə əlif oqıdum, nə cim, varlığındadur kələcim,
Bilməyə yüz bin münəccim, taleyüm nə'ldızdan gəlür.

Şö'lə bizə aydan dəgül, eşq əri bu soydan dəgül,
Rizqüm(üz) bu evdən dəgül, dəryayi ümmandan gəlür.

Biz bir bəhanə arada, ayruq de əldən nə gələ?!
Həqq çün əmr eylər cana, (bú) kələci andan gəlür.

Yunus, bir dərd ilə ah et, qəhr evində neylər rahət,
Bu dərdə dərman kəffarət bir ah ilə suzdan gəlür.

**25**

Can bir ulu kimsədür, bədən anun alətidür,
Hər nə loqma yer isən, bədənin qüvvətidür.

Nə dənlü yer isən çoq, ol dənlü yürisən toq,
Cana hiç assı yoq, həp surət məsləhətidür.

Bu can neməti qanı, gəlün bulalum anı,
Asayiş qılan canı övliya söhbətidür.

Söhbət canı səmirdür, həm aşiqün ömridür,
Həqq Çələbün əmrilə ərənün himmətidür..



Ərənün yüzi sulı, himməti ərşdən ulı,
Kimi görsən bu xulı, ərən inayətidür.

İnayətdür anun işi, anlamaz dəgmə bir kişi,
Bilgil ki, bu Hüma quşı aşiqlərün dövlətidür.

Bu Yunusun yanar içi, qamudan könlidür kiçi,
Suya sayılmamaq suçı həb ərənün himmətidür.

**26**

Canını eşq yolına verməyən aşiqmidür?!
Cəhd eyləyüb ol dosta irməyən aşiqmidür?!

Dost sevgüsin könüldə can ilə bərkitməyən,
Tuli-əməl dəftərin dürməyən aşiqmidür?!

Eşqə tanışıq sığmaz, dəgmə can gögə ağmaz,
Pərvanələyin oda yanmayan aşiqmidür?!

Nəfs arzusından keçüb, eşq qədəhindən içüb,
Dost yolına ər kibi turmayan aşiqmidür?!

Dün-gün riyazət çəküb, xəlvətlərdə diz çöküb,
Söhbətlərdə baş çatub yanmayan aşiqmidür?!

Yunus, imdi ol dostun cəfasına səbr eylə,
Yürəginə eşq odın urmayan aşiqmidür?!

**27**

Səni Həqdən yığanı hər nəyisə ver gedər,
Nə bəslərsən bu təni, sində qurd-quş yer gedər.

Ölənə baq, gözün aç, dökülür saqalü saç,
Ilan-çıyan gəlür ac, yeyüb-içüb sir gedər.

Bizə bizdən ulular igən eyü xulular,
Şol eyü əməllülər xəbər şöylə der gedər.

Kəsgil haramdan əlün, çəkgil ğeybətdən dilün,
Əzrayil əl' irmədin bu dükkanı dür gedər.

Əcəl irər, qurur baş, tiz dükənür uzun yaş,
Düpdüz olur tağü taş, göğ dürilür yer gedər.

Çün can ağdı həzrətə, yarağ et axirətə,
Tanla turan taətə Tənqr' evinə er gedər.

Miskin Yunus ölicək, sini nurla dolıcaq,
İman yoldaş olıcaq axirətə şir gedər.

**28**

Ey bana eyü deyən, bənəm qamudan kəmtər,
Şöylə mücriməm yolda mücrimlər bəndən sərvər.

Bənüm kibi mücrim qul bir dəxi istəyə bul,
Dilümdə elmü üsul diləgüm dünya sevər.

Zahirüm eyü yerdə könlüm fasid xəbərdə,
Bulunmaya Bağdadda bənciləyin bir əyyar.

Taşum göyni, içüm xam, dirligüm budur müdam,
Yol verrnədin bir qədəm ərşdən verürəm xəbər.

Taşum biliş, içüm yad, dilüm xoş, könlüm mürtədd,
İşüm yavuz eyü ad, böylə fitnə qanda var?!

Kimə kim ögüt verdüm, ol Həqqə irdi gördüm,
Bana bənüm ögüdüm hiç eyləmədi əsər.

Daqıdum şeyxlik adın, qodım mə'şuq taətin,
Verdüm nəfsün muradın, qanı Həqq ilə bazar?

Yayıldı Yunus adı, suçdur cümlə taəti,
Çələbüm inayəti suçın keçirə məgər.



**29**

İstəyəlüm iş issini, bulub görəlüm qandadur?
Can qulağı açuğ isə işbu sözüm turvan(da)dur.

Alı görün turvandadan, eşq əridür anı dadan,
Bunda boyununı buran Həqq qatında dərmandadur.

Kişi gərək bilə anı, həm oyanıq ola canı,
Bilürsin dünyə sevəni – bayquş kibi yabandadur.

Bayquş çağırur virandan, kimsə murad almaz andan,
Eyü əməl iltə görün, ol həqq tərazu andadur.

Varıcağız tərazuya, Həqq kəndü baqar yazuya,
Görücək tağlar əriyə, zəbanilər kim andadur.

Biti sunıla əlünə, itdügün gələ yolına,
Tanuqlar bilə bulına, dostun düşmənün andadur.

Tərk edəsin təxtü tacı, bulasın itdügün güci,
Mühəmməd Həqq yalvarıcı, şəfaətimüz andadur.

Yunus, əgər aşiq isən, varlığun dəgşir yoqlığa,
İman quşağın bərk quşan, de, həb əksüklig bəndədür.

**30**

Qoğıl ölüm əndişəsin, aşiqlər ölməz baqidür,
Ölüm aşiqün nəsidür, çünki nuri-ilahidür.

Ölümdən nə qorqarsın, çünki Həqqə yararsın,
Bəlk' əbədi varasın, ölmək fasid işidür.

Nəzər qıl bu göhərə, bu gizlü gəncə, nura,
Nur qaçan yavı vara kəndü nəzərgahidür.

"Qalu bəla" denmədin qədimdə biləyidük,
Key anlağıl nəydügin, bilişün qandağıdur.

Əzəli biliş idük, birligə bitmiş idük,
Mövcudat düşdü ıraq, vücud can yatağıdur.

Bu əzəli pirligi, ya cəhanda dirligi,
Ya (bu) könül birligi can qüdrət budağıdur.

Yatlıq yoqdur bilənə, dirlik tuta gələnə,
Biləlik soyləyənə vüslət yolı qəvidür.

Hökmi-rəvan mülkinə ol işin kəndü bilə,
Çün iş gəldi hasilə, bu mülk varlıq evidür.

## 31

Vüsləti olan kişiyə bu dərd ilə fəraq nədür?
Dostı yaqın görən kişi bu baqdığı ıraq nədür?

Vüslət əri olan kişi gərək varlıqdan əl yuya,
İşbu yola gedən kişi, bir görəlüm yaraq nədür.

Vüslət əri oldun isə gör xitabın bildün isə,
Dostı əyan gördün isə bu varlığı bıraq, nədir?!

Elm xud göz hicabıdur, dünyə axirət hesabıdur,
Kitab xud eşq kitabıdur, bu oqunan vərəq nədür?

Zinhar gözüni aça gör, nəfs duzağını seçə gör,
Dost mənzilinə köçə gör, andan yegrək duraq nədür?!

Aydursın kim, gözüm görür, də'viyi mə'niyə irür,
Gündüzin gün şö'lə verür, gecə yanan çıraq nədür?

Yunusdur aşkərə nişan, Həqq toludur iki cəhan,
Gəlsün bərü dosta gedən, hurü qüsur buraq nədür.



## 32

Həqiqətün mə'nisin şərh ilə bilmədilər,
Ərənlər bu dirligi riya dirilmədilər.

Həqiqət bir dənizdür, şəriət anun gəmisi,
Çoqlar gəmidən çıqub dənizə talmadılar.

Bular gəldi tapuya şəriət tutdı turur,
İçərü girübəni nə varın bilmədilər.

Dört kitabı şərh edən asidür həqiqətdə,
Zira təfsir oquyub mə'nisin bilmədilər.

Yunus, adun sadiqdür bu yola gəldün isə,
Adın dəgşürməyənlər bu yola gəlmədilər.

## 33

Qoyub nəqşü nigarı nəqşə yol vermə zinhar,
Nəqş ilə yola girən aqibət dünya sevər.

Dünyəyi bıraq əldən, dünyə keçməz bu yoldan,
İki eşq bir könüldən əsla keçməz bu xəbər.

Ya sevgil dünyə dutğıl, ya sevgil yol ilətgil,
İki də'vi bir mə'ni bu yolda sığmaz derlər.

Keç məxluq taətindən, göz ırma dost qatından,
Aldanma fani nəqşə, fani nəqşi nedərlər?!

Qalma bu dəgmə rəngə, yüz bin yıllıq fərsəngə,
İki cəhan bir adım şaşurmadın adarlar.

Bu dövrandan ötə gör, kərvan getdi yetə gör,
Qorqu var sağda solda, qayıqmadın gedərlər.

Yaban yolın gözətmə, yol evdə, taşra getmə,
Can yolı can evində, can razunı can tuyar.

Can razını can bilə, can verməz razın dilə,
Gerçək aşiq dost ilə yalan yabanda söylər.

Əvvəl qədəmdən bərü gerçək yöni ilerü,
Gəldi gedər içərü Yunus taşra bixəbər.

**34**

Eşqsüz adəm dünyədə bəllü bilün ki, yoqdur,
Hər birsi bir nəsnəyə sevgüsi var, aşiqdür.

Çələbün dünyəsində yüz bin dürlü sevgü var,
Qəbul et kəndözünə, gör qanğısı layiqdür.

Biri Rəhmani-Rəhim, biri şeytani-rəcim,
Anun yazuğı muzdı sevgüsnə təəllüqdür.

Dünyədə Peyğəmbərün başına gəldi bu eşq,
Tərcümanı Cəbrayil, mə'şuqəsi Xaliqdür.

Ömerü Osman, Əli Mustafa yarənləri,
Bu dördinün ulusı Əbubəkri-Siddiqdür.

Aləm fəxri Mühəmməd me'raca ağıcağız,
Çələbdən dilədügi ümmətinə azıqdur.

Yunus, sana həqiqət budurur buyurduğı,
Gözünlə gördügünə dönüb baqma, yazıqdur.

**35**

Gəlün soralum canlara, surətindən noldı gedər?
Dün gün sənünəm der ikən səbəb nəyi buldı gedər.

Əcəb dəgül gedər isə, surəti tərk edər isə,
Yanlış, yalan, ğeybət dəgül, dostdan xəbər gəldi gedər.



Qanı anun mülkü malı, tərk eyləmiş cümləsini?
Ol padişəh dərgahına həman əməl aldı gedər.

Eylə ki dost olmış idi, ol işlər düzülmiş idi.
Bəllü bilün, can surətün saqalına güldi gedər.

Eylər idi satu bazar, bir pul içün genə bozar,
Olmış bu dünyədən bezar, yensüz könlək geydi gedər.

Bini toğar, biri gedər, buyruq böylə gəldi məgər,
Kim ola dünyayə doyar, peymanəsi toldı gedər.

Ertə gecə söyləşürlər Həqqi bulalum deyübən,
Yunus aydur, miskin olan Həqqi bunda buldı gedər.

**36**

Dərvişlik dedükləri bir əcayib duraqdur,
Dərviş olan kişiyə əvvəl dirlik gərəkdür.

Çün ərdə dirlik ola, Həqq ilə birlik ola,
Varlığı əldən qoyub ərə qullıq gərəkdür.

Qullıq eylə ərənə, baqub Həqqi görənə,
Səndən xəbər sorana key miskinlik gərəkdür.

Həqq ərə bənüm dedi, varlığın ərdə qodı,
Ərənlərün himməti yerdən gögə dirəkdür.

Bu dərvişlik bəratın oqumadı müftilər,
Anlar nə bilsün anı, bu bir gizlü vərəqdür.

Yunus, sən arif isən anladum bildüm demə,
Dut miskinlik ətəgin, axır sana gərəkdür.

## 37

Sən xud bizə bizdən yaqın görünməzsin, hicab nədür?
Çün eybi yoq görklü yüzün, üzərində niqab nədür?

Sən ayıtdun ey padişah, "yəhdillahu limən yəşə'",
Şərikün yoq sənün, ey şah, suçlu kimdür, itab nədür?

Lövh üzərə kimdür yazan, azdıran kim, kimdür azan?
Bu işləri kimdür düzən, bu sualə cəvab nədür?

Rəhimdürür sənün adun, rəhimligün bana dedün,
Mürşidlərün muştıladı "la təqnətü" xitab nədür?

Bu işləri sən bilürsin, sən verürsin, sən alursın,
Nə kim qıldum çün bilürsin, ya bu soru hesab nədür?

Qanı bu mülkün sultanı, bu tən isə qanı canı?
Bu göz görmək dilər anı, bu mərhuma məab nədür?

Yunus, bu göz anı görməz, görənlər xud xəbər verməz,
Bu mənzilə əql irməz, bu qodığun sərab nədür?!

## 38

N'oturursın taş qapuda, gör içərü nələr gəzər,
Təmə' arturur daima, səf bağlamış, fitnə düzər.

Gəl, indi gəl qənaətə, usan, dutma, tez bin ata,
Olmaya kim əcəl yetə, fasid ola satu bazar.

Sən qanda isən təslim ol, qamulardan aşağa tur,
Ədəb tacın başuna ur, gör müfsid necəsi qızar.

Yaramazdur büxlü həsəd, kibr mübarizdür ğayət,
Köküni qaz, yabana at, fariğ otur, ey ğəmgüzar.



Qoğıl bu dünyə babını, ögrən dostlıq ədəbini,
Bulursan ustabanını ögə varan qaldan zərər.

Kibrü mənidür subaşı, dəlim kişidür yoldaşı,
Sən olmağıl anun eşi, ana uyan yoldan azar.

Var dedügüm yerlərdə dur, hiqdü həsədi oda ur,
İxlas gəlür cümləyi yur, Yunus yolı yavlaq düzər.

## 39

Eşit sözümi, ey ğafil, tanla səhər vəqtində tur,
Eylə buyurmış ol kamil, tanla səhər vəqtində tur.

Eşit, nə der xorusunuz, tanla verilür ruzunuz,
Dost dərgahına dutğıl yüz, tanla səhər vəqtində tur.

Eşit sözümi, ey səğir, ta tərəzün gələ ağır,
Yalvar Çələbünə çağır, tanla səhər vəqtində tur.

Yatanlarun yatlı hali, hiç nəsnəyə irməz əli,
Səhər əsər rəhmət yeli, tanla səhər vəqtində tur.

Quşlar ilə turğıl bilə, qıl namazı imam ilə,
Yalvar günahunı dilə, tanla səhər vəqtində tur.

Oqına Qur'anü Yasin, qulaq urub dinləyəsin,
Tağca günahlar yuyasın, tanla səhər vəqtində tur

Oqına hədisü kəlam, deyələr əleyhissəlam,
Aşiq isən bəllü biləm, tanla səhər vəqtində tur.

Həlal ola sana uçmaq, uçmaqda hurilər quçmaq,
Kövsər şərabını içmək, tanla səhər vəqtində tur.

Miskin Yunus, aç gözüni, oyar ğəflətdən özüni,
Ta biləsin kəndözüni, tanla səhər vəqtində tur.

## 40

İşbu vücudum şəhrinə bir dəm girəsüm gəlür,
İçindəki sultanun yüzin görəsüm gəlür.

Eşidürəm sözini, görəməzəm yüzini,
Yüzini görməkligə canum verəsüm gəlür.

Ol sultan xəlvətinün yedi hücrəsi vardur,
Yedisindən içərü seyran qılasum gəlür.

Hər qapuda bir kişi, yüz bin çərisi vardur,
Eşq qılıcın quşanub cümlə qırasum gəlür.

Ərənlərün söhbəti arturur mə'rifəti,
Bidərdləri söhbətdən hər dəm sürəsüm gəlür.

Leyliyi-Məcnun bənəm, şeydayi-Rəhman bənəm,
Leyli yüzin görməgə Məcnun olasum gəlür.

Dost oldı bunca mehman, bunca yıl necə zəman,
Gerçək İsmayıl kibi qurban olasum gəlür.

Miskin Yunusun nəfsi dört təbiət içində,
Eşq ilə can sirrinə pünhan varasum gəlür.

## 41

Yandı yürəgim, dutuşdı bağrum, cigərüm kəbabdurur,
Aşiqlərin şərbətləri bu dərdümə səbəbdürür.

Bir neçələri eşq düzər, bir neçələri eşq bozar,
Bir neçələr əsrük gəzər, eylə kim var xərabdurur.

Eşq ilə çalındı qələm, eşqə yesirdürür aləm,
Aşiqlər arasında Cəbrayıl dəxi hicabdurur.



Mədrəsələr müdərrisi oqumadılar bu dərsi,
Şöylə qaldılar aciz(ü) bilmədilər nə babdurur.

Əzazil də'vi qıldı, də'visi yalan oldı,
Yalan də'vi qılanun pəs cəzası əzabdurur.

Ölməz eşq bilişləri, əsrük məclis xoşları,
Daim bunlarun işi çəngü şəştə rəbabdurur.

Yunus, imdi miskin ol, həm miskinlərə qul ol,
Zira miskin olanları arzulayan Çələbdürür.

## 42

Padişahlıq sənündür, heybətün var,
Yaratdun yerü gögi, qüdrətün var.

Binişansın, nişanun kimsə bilməz,
Əgərçi binəhayət ayətün var.

Cümlə insü mələk vühuş və tüyur,
Qamunun üstunə ibadətün var.

Nə dünya axirət, nə qafü nə kaf,
Bular qətrə, dərya mələkutun var.

Nə rəngü nə şəkil, nə qədd, nə qamət,
Nə cövhər, nə ərəz, nə surətün var.

Sənündür ərşü kürsi, lövhü qələm,
Dönər çərx, yer turur, xoş hikmətün var.

Bu yüz yigirmiyü dört bin nəbiyə
Gecə me'rac, gündüz münacatun var.

Dört yüz qırq dört təbəqat övliyaya
Verilmiş anlara kəramətün var.

Gah birlik içrə birlik eyləyəm ol birilə,
Gəh dönəm dərya olam, qətrə olam, ümman olam.

Gah duzəxdə yanam Fir'ovn ilə, Haman ilə,
Gah cənnətdə varam ğılman ilə Rizvan olam.

Gah bir ğazi olam əfrəng ilə cəng eyləyəm,
Gəh dönəm əfrəng olam nisyanilə üsyan olam.

Gah bir məchuli-mərdud olamü Nəmrud olam,
Gəh varam Cə'fər olam, Təyyar olam, pərran olam.

Neçə bir ami olam, nami olam, cami olam,
Neçə bir kami olam, nakam olam, nadan olam.

Gah ola odlar yaqam, dillər yıqam, canlar yaqam,
Gah varam ərşə çıqam, gəh şahü gəh sultan olam.

Neçə bir dərdlər ilə odlara yanam yaqılam,
Neçə bir şakir olam, zakir olam, mehman olam.

Tərk edəm bu xakü badı vara əslinə yenə,
Şeş cəhətdən bən çıqam bicism olam, bican olam.

Neçə bir Cərcisü Bərcis olamü Mərrix olam,
Neçə bir Calenusü Boqrat olam, Loqman olam.

Bu toquz arslanü yedi əvrənü dört əjdəha,
Bunlarunla cəng edəm, Rüstəm olam, dəstan olam.

Bir dəmi asud' olam, huşyari-ğafil, xürdü xam,
Bir dəmi aşüft' olam, Məcnun olam, heyran olam.

Könlümün gəncinə rənc irgürmədin bir yol bulam,
Yaxu(d) dəryayə girəm birəngü biəlvan olam.



Ya neçə bir bən deyəm, sənsin deyəm utanmadın,
Ya neçə dəksüz olam, dilsiz olam, heyran olam.

Neçə bir balçıqda olam, alçaqda olam, xar olam,
Gah varam göhər olam, yaqut olam, mərcan olam.

Gəh adamlıqdan çıqam, uçam mələklər mülkinə,
Lövn olam, bilövn olam, gəh kövn olam, bikan olam.

Gah münqadü müti'i-Həqq – Allahun xası,
Gəh dönəm hər dun olam, Musa olam, İmran olam.

Gəh duram Davud olam, təxti-Süleymana çıqam,
Gah dönəm gümrah olam, həmrah olam, hicran olam.

Gah zindandan çıqam azad olam, abad olam,
Gəh genə dərban olam, məhbus olam, zindan olam.

Dar olam, kirdar olam, Mənsur olam, bərdar olam,
Tən olam, həm can olam, həm in olam, həm an olam.

Gəh biyabani-xərabü, gəh sərabü, gəh türab,
Gəh yenə mə'mur olam, gəh cin olam, gəh can olam.

Gah izzətdə əzizü gah zillətdə həqir,
Gəh varam ərkan olam, rəhban olam, röhban olam.

Gəh dönüb xamuş olam, bihuş olam, sərxoş olam,
Söyləyəm dəstan olam, həm bağu həm bustan olam.

Yunusa Tapduğü Saltuğü Baraqdandur nəsib,
Çün könüldən cuş qıldı, bən necə pünhan olam?!

Yunus, imdi bu sözi sən aşiqə de, aşiqə,
Kim sana bən sidq olam, həm dərdü həm dərman olam.

Gah xalis, gah müxlis olam uş Fürqan ilə,
Gah Rəhmanür-rəhim ya həyyü ya mənnan olam.

Gəh dönəm bir şəms olam, zərrəmdə yüz bin ərş ola,
Gəh yenə tüğyan olam, aləmlərə tufan olam.

Əvvəli hu, axırı yahu vü illa hu olam,
Əvvəl – axır ol qala vü "mən oleyha fan" olam.

### 111

Kə'bə vü büt iman bənəm, çərx uruban dönən bənəm,
Bulut olub həvaya ağub, rəhmət olub yağan bənəm.

Yaz yaradub yer tonadan, könlümüz evi xanədan,
Xoşnudam ata-anadan, qullıq qədrin bilən bənəm.

Yıldırım olub şaqıyan, qaqıyub nəfsin doqıyan,
Yer qə'rəsində bərkiyən şol ağılu ılan bənəm.

Həmzəyi Qafdan aşuran, əlin-ayağın şeşürən,
Gözsüzlərün gözindəki boz-pusaruq duman bənəm.

Ətü dəri, sünğük çatan, hökm eyləyüb diri dutan,
Qüdrət beşigində yatan, hikmət südin əmən bənəm.

Aşiq olan gəlsün bəri, göstərəyin toğrı yolı,
Məqamumdur könül şəri, ırılmayub duran bənəm.

Yerə, gögə bünyad uran, ırılmadın qaim turan,
Irmaqlara göl çağıran, adum Yunus, ümman bənəm.

### 112

Bən səni sevdügimi söyləşür(lər) xasü am,
Söyləşənlər söyləşsün, sənsüz dirligüm haram.

Kim sənün ləzzətündən canı dad almaz isə,
Yürür bir cansuz surət, aləm halindən biqəm.



Bən bu dəm səni gördüm, necəsi səbr eyləyəm?
Səni bir dəm görməgə müştaqdur cümlə aləm.

Səni görən kişiyə nə hacət hurü qüsur?!
Səni sevməyən cana tamudur cümlə məqam.

İki cəhan varlığı gər bənüm olur isə,
Sənsüz bana gərəkməz, iş sənünlədür təmam.

Bin yıl ömrüm olursa xərc edəm bu qapuda,
Bən gerçək aşiq isəm, gərək bu yolda öləm.

Çoqlar Yunusa der, necədür eşq esrüklügi,
Netsün, əzəl bəzmində şöylə çalındı qələm.

### 113

Bəni anmaqlığa bəndən fariğvəm,
Nedərəm anuban bəs nə layiqvəm?!

Bənüm yoldaşlığum ədəbə sığmaz,
Ədəbsüz kişiyə neçün rəfiqvəm?

Əl dutmaz, ayaq dirməz cəhana düşdüm,
Nə qərar, nə məkan, nə xud təfriqvəm.

Cümlə təkəbbürlük döküldi, qalmadı,
Nə esrügəm, nə məxmur, nə xud ayıqvam.

Nə səbrü nə sükun, nə xud becid iş,
Nə adım adaram, nə xud təriqvəm.

Bu gün cəhana gəldüm, uş gedərəm,
Sanasın yolcı idüm, ya qonuqvam.

Qanı Yunus, qanı cünbüş hərəkət?
Nə sərmayəm ola, nə var, nə yoqvam.

## 114

Bən ol yari sevdügümi necə bir gizləyü biləm?!
Könlümə sığmaz, nedəyin, məgər razum elə deyəm?!

Dilüm dutub yürüdügüm yadlığuma dəlil imiş,
Yaqam yadluq pərdəsini, hicabumı bən gedərəm.

Anun ilə əhvalumı aləmlərə bildürəyim,
Çağıruban muştulayam aləmi üstümə derəm.

Aşiqlərün könli, gözi məşuq dəpə getmiş olur,
Könlüm ilə qövl etmişəm, başəd ki mə'şuqə irəm.

Canum qurban qılur idim canı qəbul qılur isə,
Qaçan isə ölisərəm neçün böylə diri duram?!

Şükranə canum üstinə bən dost içün ölür isəm,
Ölmək lazımdur qamuya, bən ölümdən qanca varam?!

Elmü əməl sözi dəgül Yunus dili söylədügi,
Dil nə bilür dost xəbərin bən dostilə necə birəm?!.

## 115

Netə ki ol mə'şuq ilə bən razumı bir eyləyəm,
Ğərq olam müşahidəyə, irməgə tədbir eyləyəm.

Kimdür ki, anı görübən gizlənü bilə əhvali?
Göstər bana ol kişiyi, bən dəxi əlbir eyləyəm.

Bu xəlaiq aydur bana, saqla anı can içində,
Bir zərrəsi yüz bin cəhan, ayıt, necə sirr eyləyəm?!.

Şunun kibi çapuk nəzər, bir nəzərdə yüz bin Musa,
Sərməstü heyran qamusı, de necə tədbir eyləyəm?



Fərz dəgüldür qamulara Turda münacat eyləmək,
Bən qandasam dost andadur, hər bir yeri Tur eyləyəm.

Hidayət irdi qamuya həvasindən keçməzlərə,
Tövfiq yüzin yerə urub eşqümi şirgir eyləyəm.

Müheqqiqlər görə durur Yunus gözi nə gördügin,
Düşüm söyləyəyim sana, nəcmilə tə'bir eyləyəm.

## 116

Təfərrüc eyləyü vardım, sabahın sinləri gördüm,
Qarışmış qara toprağa şu nazük tənləri gördüm.

Çürimiş topraq içrə tən, sin içində yatur pünhan,
Boşanmış tamar, aqmış qan, batmış kəfənləri gördüm.

Yıqılmış sinləri tolmış, həb evləri xərab olmış,
Qamu əndişədən qalmış nə düşvar halləri gördüm.

Yaylalar yaylamaz olmış, qışlalar qışlamaz olmış,
Bar dutmış söyləməz olmış ağızda dilləri gördüm.

Kimisi zövqü işrətdə, kimi sazü bəşarətdə,
Kimi bəla vü möhnətdə, dün olmış günləri gördüm.

Soğulmış şol qara gözlər, bəlürsüz olmış ay yüzlər,
Qara toprağun altında gül dərən əlləri gördüm.

Kimisi boynını əgmiş, tənini toprağa salmış,
Anasına küsüb getmiş boynın buranları gördüm.

Kimi zari qalub ağlar, zəbanilər canın tağlar,
Dutuşmış sinləri oda, çıqan dütünləri gördüm.

Yunus bunı qanda gördi, gəlüb bizə xəbər verdi,
Əqlüm vardı, bilüm şaşdı, netə kim şunları gördüm.

## 117

Həqdən bana nəzər oldı, Həqq qapusın açar oldum,
Girdüm Həqqün xəznəsinə, dürrü göhər saçar oldum.

Dövlət tacı başa qondı, eşq qədəhi bana sundı,
Canum içdi, eşqdən qandı, qarayı aqdan seçər oldum.

Əsritdi eşqə düşürdi, bən xam idüm, eşq bişürdi,
Əqlümi başa dəvşürdi, xeyri şərdən seçər oldum.

Xeyrə döndi bənüm işüm, əndişədən azad başum,
Nəfsümün başını kəsdüm, qanadlanub uçar oldum.

Köçənlər mənzilə yetdi, vardı anda qərar etdi,
Ömür keçdi, qövl yetdi, gö(y)nüldim uş keçər oldum.

Miskin Yunus bilişəli, canü könül verişəli,
Tapduğuma irişəli gizlü razum açar oldum.

## 118

Gözüm səni görməg içün, əlüm sana irməg içün,
Bu gün canum yolda qodum yarın səni bulmağ içün.

Bu gün canum yolda qoyam, yarın əvəzin verəsin,
Ərz eyləmə uçmağumı, hiç arzum yoq uçmağ içün.

Bənüm uçmaq nemə gərək, hərgiz könlüm ana baqmaz,
İşbu bənüm zarılığum dəgüldür(ür) bir bağ içün.

Uçmağ, uçmağum dedügün, mö'minləri yeltəndigün,
Vardur ola bir qaç huri, arzum yoqdur uçmağ içün.

Bunda dəxi verdün bizə ol huriyi cüfti həlal,
Andan keçdi arzum təmam, arzum sana irməg içün.



Sufilərə ver sən anı, bana səni gərək, səni,
Haşa, bən tərk edəm səni şol bir evlə çardağ içün.

Yunus həsrətdürür sana, həsrətini göstər ana,
İşün zülm dəgül isə, dad eyləgil, istədi çün.

## 119

Çoq-çoq şükr sən Çələbə, məqsudümə irdüm bu gün,
Müştaq idüm bunca zəman, pirüm yüzin gördüm bu gün.

Qayğu bəni almış idi, canum zəbun olmış idi,
Gördüm pirümün yüzini, ol qayğuyı sürdüm bu gün.

Gəlsün yardan ayru düşən, ğürbət ilə bağrı bişən,
Dost bağçası içindəki eşq tərtibin qurdum bu gün.

Yunus aydur, yar qulıyam, dost bağçası bülbüliyəm,
Söyləyəyin şimdən gerü, gülzaruma girdüm bu gün.

## 120

Ey yarənlər, ey qardaşlar, əcəl irə öləm bir gün,
İşlərümə peşman olup kəndözümə gələm bir gün.

Yanlaruma qona əlüm, söz söyləməz ola dilüm,
Qarşuma gələ əməlüm, netdüm isə görəm bir gün.

Oğlan gedər danişmənə, səladur dosta düşmənə,
Şol dört təkbir namaz ilə (dəxi) təmam qılam bir gün.

Beş qarış bezdürür tonum, ılan-çıyan yeyə tənüm,
Yıl keçə obrıla sinüm, unıdılub qalam bir gün.

Başuma dikələr hicə, nə ertə biləm, nə gecə,
Aləmlər ümidi xoca sana fərman olam bir gün.

Yunus Əmrə, sən bu sözi dəxi təmam etməmişsin,
Tək yüriyəyin neyləyəm, ustaduma gələm bir gün.

**121**

Suretdən gəl sifata anda mə'ni bulasın,
Xəyallarda qalmağıl ərdən məhrum qalasın.

Bu yolda əcaib çoq, sən əcəbə aldanma,
Əcaib anda ola dost yüzini görəsin.

Eşq quşağın quşanğıl, dostun yolını varğıl,
Mücahidə çəkərsən müşahidə görəsin.

Bundan eşqün şəhrinə üç yüz dəniz keçərlər,
Üç yüz dəniz keçübən yedi tamu bulasın.

Yedi tamuda yanğıl, hər birində kül olğıl,
Vücudun anda qoğıl, ayruq vücud bulasın.

Həqiqətdür Həqq şəri, yedidür qapuları,
Dərgahində yazludur, girüb qüdrət görəsin.

Əvvəlki qapusında bir kişi olur anda,
Sana aydur səlim ol, sən miskinlik bulasın.

İkinci qapusında iki arslan vardur anda,
Neçələri qorqutmış, olmasın kim qorqasın.

Üçünci qapusında üç əvrən vardur anda,
Sana həmlələr edər, olmasın kim dönəsin.

Dördünci qapusında dört pirlər vardur anda,
Bu söz sana rümuzdur, gör kim dəlil bulasın.

Beşinci qapusında beş röhban vardur anda,
Dürlü məta'lar satar, olmasun kim alasın.

Altıncı qapusında bir hur oturur anda,
Sana aydur gəl bərü, olmasun kim varasın.



Çün sən anda varasın ol huriyi alasın,
Bir vayədən ötürü yolda məhrum qalasın.

Yedinci qapusında yedilər oturur anda,
Sana derlər qurtıldun, gir dost yüzin görəsin.

Şu dedügüm sözlərüm vücuddan taşra dəgül,
Təfəkkür qılur isən cümlə səndə bulasın.

Yunus işbu sözləri Həqq varlığından söylər,
İstər isən kanını miskinlikdə bulasın.

**122**

Çərxi-fələk yoğ idi canlarumuz var ikən,
Biz ol vəqtin dost idük Əzrayil əğyar ikən.

Neçə yıllar biz anda cəm' idük can kanında,
Həqiqət aləmində mə'rifət söylər ikən.

Çələb eşqi candaydı, bu bilişlik andaydı,
Adəm Həvva qandaydı biz anunla yar ikən?!

Dün gəldi Səfi Adəm, dünyayə basdı qədəm,
İblis aldadı ol dəm uçmaqda gəzər ikən.

Canlar ol dəm bilişdi, ol dəm könül ilişdi,
Adəm xəlqi qarışdı dənizlər qaynar ikən.

Nə gög var idi, nə yer, nə zəbər vardı, nə zir,
Qonşıyıduq cümləmüz nur tağın yaylar ikən.

Nə oğul vardı, nə qız, ərvah idük anda biz,
Yunus, eşqdən xəbər ver eşq ilə göynər ikən.

### 123

Zinhar! Verməgil könül dünya payına bir gün,
Dünyəyə könül verən düşə tayına bir gün.

Quşlarun yuvasını kimsə toğan edinməz,
Ol əldə qaçan dura, gedə yerinə bir gün.

Gör, əxi, neçələri topraqlar qucmış yatır,
Bizi də anlar kibi ala qoynına bir gün.

Şol quşun kim yuvası toğan qatında ola,
Ol andan qaçınsa (da), gedə yayına bir gün.

Miskin biçarə Yunus, gördüm bildim deməgil,
Dut ərənlər ətəgin, düşgil suyına bir gün.

### 124

Laşərikə oqursın, sonra şərik qatarsın,
Birə iki deməgil, fitnə kimdən dutarsın?

Çün Qur'an gögdən endi, anı Allah buyurdı,
Andan xəbər ver bana, ha kitabdan ötərsin.

Oqursın təsrif kitab, neçə bina vü i'rab,
Xövfü rica səndə yoq, eylə kim bir tatarsın.

Elm oqımaqdan gərək kəndözini bilməkdür,
Kəndözüni bilməzsən bir heyvandan betərsin.

Elm oqımaq mə'nisi ibrət almaqdur ancaq,
Çün ibrət almadun sən, görmədin taş atarsın.

On iki bin hədisi cəm' eylədi Mustafa,
Unutdunuz anı siz, şərh ilə söz satarsın.



Qılursın riya namaz, yazuğun çoq, xeyrün az,
Dinlə nəyə varur söz, cəhənnəmdən bitərsin.

Xəlqə fətva verürsin, nəyiçün sən dutmazsın?
İxlas ilə gəlürsən, bizdən nəsnə utarsın.

Sən fəqihsin, bən fəqir, sana hiç tanumuz yoq,
Elmün var, əməlün yoq, günahlara batarsın.

Bu düzilən tərtibi ayruqsıdı mı dersin?!
Başaramazsın, xoca, əndişədən yitərsin.

Eşit, Yunus, söz bunda, ibrət alğıl özindən,
Əgər qəbul edərsən, bir qaç dəxi qatarsın.

### 125

Andan yegrək nə vardur – kişi bilə kəndözin?!
Kəndözin bilən kişi – qamulardan ol güzin.

Kişi gərək çoq bilə, ol gərək ögüt ala,
Mənzilə irsəm deyən bəlürsin həzin-həzin.

Bu yol yavlaq uzaqdur, dünya ana duzaqdur,
Bu duzağa uğrayan qomaya qılavuzın.

Bən əmin olsam deyən, ya əminlik istəyən,
Keçsün bu qalü qiyldən, toprağa ursun yüzin.

Kim ərə qullıq edə, ol əzabdan qurtıla,
Mütləq ol yarlığanur kim görürsə ər yüzin.

Yunus bir xəbər verür, eşidənlər şad olur,
Gəncə uğrasam deyən izləsün izin-izin.

**126**

Ol dost bizə gəlməzisə bən dosta gerü varayın,
Çəkəyin cövrü cəfayı, dost yüzin görü verəyin.

Sərmayə bir avuç topraq, anı dəxi aldı bu eşq,
Nə sərmayə var, nə dükkan, bazara nəyə varayın?!

Qurılmışdur dost dükkanı, dost içinə girmiş gəzər,
Günahum çoq, könlüm sezər, bən dosta çoq yalvarayın.

Könlüm aydur dost bənümdür, gözüm aydur dost bənümdür,
Könlüm aydur gözə, səbr et, bir dəm xəbərin sorayın.

Həqq nəzər qılduğı cana bir göz ilə baqmaq gərək,
Ana kim ol nəzər qıla, bən anı necə yerəyin?!

Tapduğum aydur Yunusa, bu eşq Həqqə irsə gərək,
Qamulardan ol yücədür, bən ana necə varayın?!

**127**

Həqq bir göhər yaratdı kəndünün qüdrətindən,
Nəzər qıldı göhərə, əridi heybətindən.

Yedi qat yer yaratdı ol göhərün tozından,
Yedi qat gög yaratdı ol göhərün buğından.

Yedi dəniz yaratdı ol göhər tamlasından,
Tağları möhkəm qıldı ol dəniz köpügindən.

Mühəmmedi yaratdı məxluqa şəfqətindən,
Həm Əliyi yaratdı mö'minlərə fəzlindən.

Ğayib işin kim bilür məgər Qur'an elmindən,
Yunus içdi əsridi ol göhər dənizindən.



**128**

Şöylə heyran eylə bəni, eşqün odına yanayın,
Hər qancaru baqar isəm, gördügüm səni sanayın.

Həm bəni oqur Sübhanum, eşiginə dün-gün yönüm,
Anda çıqar bənüm günüm, bunda nəyə əglənəyin?!

Yedi tamu dedükləri qatlanmaya bir ahuma,
Səkiz uçmaq aldamaya, bunda nəyə aldanayın?!

Yüz bin huri gəlür isə aldamaya bu canumı,
Eşqün könlüm yəğmaladı, səndən necə usanayın?!

Sənün eşqün tuydı canum, tərkini urdum cəhanun,
Hərgiz bilinməz məkanun, səni qanda arayayın?!

Hər dəm söylənür xəbərün, hərgiz bulunmaz əsərün,
Götür yüzündən pərdəyi, didaruna göyünəyin.

Elmi-hikmət oquyanlar – eşqdən fərağatdur bunlar,
Mənsur oldum, asun bəni, hər dillərdə söylənəyin.

Yunus Əmrəmün bu sözi, cana toldı avazəsi,
Kordur münkirlərün gözi, bən necəsi göstərəyin?!

**129**

Ey dost, səni sevəldən əqlüm getdi, qaldum bən,
Irmaqları seyr edüb dənizlərə taldum bən.

Bir zərrə eşqün odı qaynadur dənizləri,
Düşdüm eşqün odına, dutuşuban yandum bən.

Ol canda ki eşq ola, anda ğüssə olmaya,
Bu eşq bana gələldən ğüssəm getdi, güldüm bən.

Bülbül də aşiq olmış qızılgülin yüzinə,
Gördüm ərənlər yüzin, həzardastan oldum bən.

Bu eşqi bana verdün, bən nedərəm kəndözüm?!
İçüm-taşum nur toldı, dosta aşiq oldum bən.

Bir qurı ağac idüm, yol üzrə düşmüş idüm,
Ər bana nəzər qıldı, tazə, cəvan oldum bən.

Yunus, gerçək aşiqsən adunı Miskin qoğıl,
Cümləsindən ixtiyar miskinligi buldum bən.

**130**

Əgriligün qoyasın, toğrı yola gələsin,
Kibrü kini çıqarğıl, ərdən nəsib alasın.

Nə versən əlün ilə şol varur sənün ilə,
Bən desəm inanmazsın, varıcağaz görəsin.

Könüldə pas oturur, anda səni yitürür,
İçərü şah oturur, girimezsin göresin.

On ikidür hücrəsi, yedi dərvazəsi var,
Anda iki dilbər var, bilməzsin ki, sorasın.

Var qardaşunı öldür, dəxi övrətün boşa,
Anana kəbin qıydur, Həqqi əyan görəsin.

Biçarə Miskin Yunus, eşqdən də'vi qılursın,
Dostdan xəbər gəlicək yüz süriyi varasın.

**131**

Canlar canını buldum, bu canum yəğma olsun,
Assı ziyandan keçdüm, dükkanum yəğma olsun.

Bən bənligümdən keçdüm, gözüm hicabın açdum,
Dost vəslinə irişdüm, gümanum yəğma olsun.



İkilikdən usandum, birlik xanına qandum,
Dərdi şərabın içdüm, dərmanum yəğma olsun.

Varlıq çün səfər qıldı, dost andan bizə gəldi,
Viran könül nur toldı, cəhanum yəğma olsun.

Keçdüm bitməz sağınçdan, usandum yazü qışdan,
Bustanlar başın buldum, bustanum yəğma olsun.

Yunus, nə xoş demişsin, balü şəkər yemişsin,
Ballar balını buldum, qovanum yəğma olsun.

**132**

Əgər eşqi sevərsən, can olasın,
Könüllər təxtinə sultan olasın.

Sevərsən dünyəyi möhnət bulasın,
Ərənlər sirrini qaçan tuyasın.

Dikən olma, gül ol ərən yolında,
Dikən olur isən oda yanasın.

Niyaz içün buyurdı Həqq namazı,
Niyazdan vay sana ğafil olasın.

Ərənlər nəfəsin əsa edin sən,
Əgər nəfsünə uyarsan fənasın.

İbadətlər başıdur tərki-dünya,
Əgər möminsən ana inanasın.

Atan, anan həqqin yetürdün isə,
Yəşil tonlar geyəsin tonanasın.

Əgər qonşı həqqi boynunda isə,
Cəhənnəmdən yarın baqi qalasın.

Yunus bu sözləri ərəndən aldı,
Sana dəxi gərək isə alasın.

Könülə girəni gö(y)nəndi derlər,
Könülə sən də gir kim, gö(y)nənəsin.

**133**

Eşq elinün xəbərin desəm eşidəmisin?!
Yoldaş olub ol yola sən bilə gedəmisin?!

Ol elün bağı olur, şərbəti ağı olur,
Qədəh dutmaz ol ağı, nuş edüb yudamısın?!

Ol elün zəvadəsi cəfa duta gedəsi,
Şəkər ayruğa sunub sən ağı yudamısın?!

Ol eldə ay, gün olmaz, ay gedilüb tolunmaz,
Tərtiblər tərk edübən şümar unudamısın?!

İşbu tənün tərtibi odü yel, topraq, sudur,
Yunus, sən cəvab eylə, suda, topraqdamısın?!

**134**

Elmündə ğərq olalı uş bən bəni bilməzin,
Dil ilə söyləyübən vəsfünə irəməzin.

Sifətün gəlməz dilə, qandalığun kim bilə,
Sün'ün saymaq dil ilə bən hiç layiq olmazın.

Həm əvvəlsin, həm axır, qamu yerlərdə hazır,
Hiç məqam yoqdur sənsüz, bən neçün görəməzin?!

Görmədin dəlü oldum, yanıldum günah qıldum,
Ussum, əqlüm aldurdum, əsridüm, ayrılmazın.



Çünkim bəni əsritdün, canü könül alıtdun,
Ayırma bəni səndən, bulışdum, ayrılmazın.

Bana canı sən verdün, Əzrayilə buyurdun,
Təslim edəyin canı, yalan də'vi qılmazın.

**135**

Aşiqlərə nə deyəm eşq xəbərindən şirin?!
Eşq ilə dinləyənə aydayın birin-birin.

Əvvəl yer-gög yoğ ikən var idi eşq bünyadı,
Eşq qədimdür, əzəli eşq gətürdü nə varın.

Əvvəl əzəl bəzmində kim dost yüzin gördisə,
Anun canıdır aşiq, sor andan eşq xəbərin.

Eşqi hiç bir nəsnəyə məsəl bağlasam olmaz.
Dünyədə, axirətdə nə dutısar eşq yerin?!

Əmanətdür, saqınğıl, eşq xəbərini zinhar,
Oturub dəgmə yerdə söyləmə eşqün sözin.

Sərraflarun qatında qaidə şöylə dürür;
Qədrin bilməz kişiyə göstərmədi göhərin.

Yunusun hövsələsi eşq ilə tolmışdurur,
Dərdin saqlıyamadı, kəksüz söylər eşq dilin.

**136**

Bunca könül ilədüb cəhana sultanmısın?!
Hökmün canlara keçər, can içində canmısın?!

Baqışun bin can alur, dərdin yürəkdə qalur,
Görən kəndüdən varur, üşşaqə Qur'anmısın?!

Uçan quşlar uçunur, səni yel görsə turur,
Divlər hökmünə girür Bilqeys, Süleymanmısın?!

Yüzündən gün dutılur, ay doğmağa utanur,
Görən heybətə qalur, Yusifi-Kən'anmısın?!

Ölü görsə dirilür, qalıbına canı gəlür,
Topraqdan avaz gəlür, İsa bin Məryəmmisin?!

Eşqün dinə şur eylər, aslana zəncir eylər,
Qatı taşı mum eylər, yoqsa Fərhad sənmisin?!

Eşqün Həqqə irgürür, ol gözlər didar görür,
Görənlər baş endürür, İbrahim Ədhəmmisin?!

Yüzün didar nurıdur, saçun me'rac dünidür,
Görən canın unıdur, Fəxri-aləm sənmisin?!

Yunus, sevdügün gözlə, eşq yolını key izlə,
Razı könüldə gizlə, sözə hakim sənmisin?!

**137**

Sən canundan keçmədin canan arzu qılursın,
Beldən zünnar kəsmədin iman arzu qılursın.

"Mən ərəfə nəfsəhu" dersin, əvət, dəgülsin,
Məlaikdən yuqaru seyran arzu qılursın.

Tifli-narəsidəykən ətəgün at edinüb,
Ələ çövgan almadın meydan arzu qılursın.

Biləmədün sən səni sədəfdə nə cövhərsin,
Misrə sultan olmadın Kən'an arzu qılursın.

Yunus, imdi hər dərdə Əyyub kibi səbr eylə,
Dərdə qatlanamazsın, dərman arzu qılursın.



**138**

Dost yüzini göricəg(iz) necə qərar qılsun bu can?!
Yəğmaya verür ol dəmdə yüz bin zahid dinü iman.

Tə'nə yoqdur aşiqlərə hər nə halə dönər isə,
Fərman olmaz kəndüyə müşahidəyə ğərq olan.

Canü könül, fəhmü əql eşq mövcinə ğərq olıcaq,
Nəyilə ansun ol kişi yazuq muzdü assı ziyan?!

Canında gözü yoq kişi görməyisər dost yüzini,
Gözsüz necə fəhm eylesün nə rəngədür işbu cəhan?!

Yüz bin məlikü səlatin dost yüzini görəyidi,
Tərk edəydi tən tərtibin, izzətü ləşkər xanüman.

Aşiq necə xərab isə vilayəti arta durur,
Anun içün ki, daima virandadur gənci-nihan.

Eynəl-yəqin görən kişi ırmaz gözin dost yüzindən,
Necə görə bilsün anı bu sevüdən taşra turan?!

Yunusa bu eşq qızğını qomaz dilin dutayıdı,
Aşiqə mə'şuq razını dürüst diləməyə lisan.

**139**

Bir dürri-yetiməm ki, görmədi bəni ümman,
Bir qətrəyəm illa ki, ümmana bənəm ümman.

Gəl mövci-əcaib gör, dəryayi-nihan gözlə,
Zehi bəhr nəhayətsüz qətrədə olur pünhan.

Oquyamadı Məcnun Leyli adını mövzun,
Həm Leyli idüm anda, həm Məcnun idüm heyran.

Bu aləmi-kəsrətdə sən Yusifü bən Yə'qub,
Ol aləmi-vəhdətdə nə Yusifü nə Kən'an?!

Dəm urmaz idi Mənsur tövhidi "ənəl-həq"dən,
Eşq darinə dost zülfi asmışdı bəni üryan.

Adum Yunus olduğı bu cism bəlasıdur,
Adum sorar olursan sultanə bənəm sultan.

"Yey", "nun", "sin" ulaşmadın, can qalıba düşmədin,
Eşq dadıyla məst gəldüm, həm məst gedərəm bundan.

**140**

Ol can qaçan ölisər sən ana can olasın,
Ölmiş könül dirilə, anda ki sən olasın.

Ölməklik dirlik ola, ölümsüz dirlik bula,
Ölmiş könül dirilə, şunda ki sən olasın.

Sən olduğun könüllər hər dəm canın yenilər,
Güc olmaz ol divanda hakimi sən olasın.

Can bədəndən uçıcaq mənzilinə köçicək,
Ol cəhana keçicək gözə əyan olasın.

Tozını yel almaya, bir zərrə ayrılmaya,
Aşiq canı ölməyə mə'şuqi sən olasın.

Yunus, sən aşiq isən, eşqə müvafiq isən,
Qorqma gər aşiq isən, nə olursan olasın.

**141**

Həqdən gələn şərbəti içdük əlhəmdülillah,
Şol qüdrət dənizini keçdük əlhəmdülillah.

Şol qarşuğı tağları, meşələri, bağları,
Sağlıq, səfalıq ilə aşduq əlhəmdülillah.



Quruyıduq yaş olduq, qanatlanduq quş olduq,
Bir-birmizə eş olduq, uçduq əlhəmdülillah.

Varduğumuz ellərə, şol səfa könüllərə,
Xəlqə Tapduq mə'nisin saçduq əlhəmdülillah.

Bəri gəl barışalum, yad isən bilişəlüm,
Atumuz əyərləndi, aşduq əlhəmdülillah.

Endük Rumi qışladuq, çoq xeyrü şər işlədük,
Uş bahar gəldi gerü, köçdük əlhəmdülillah.

Dirildik bınar olduq, irgildük ırmaq olduq,
Aqduq dənizə talduq, taşduq əlhəmdülillah.

Tapduğun tapusunda, qul olduq qapusunda,
Yunus Miskin, çig idük, bişdük əlhəmdülillah.

**142**

Zinhar! Könül evində dutma yavuz əndişə,
Bir-eküyçün quyı qazan aqibət kəndü düşə.

Kəndüyə yaramazı bir-eküyə sanan ol –
Adı müsülman onun, kəndü bənzər keşişə.

Qomaduğun aradan nəsnəyi götürməgil,
Qomaduğın götürmək budur a yatlu peşə.

Yarın Həqq didarını görməyisər üç kişi –
Bir de(yi)kci, bir quvıcı, biri ğəmmazdur peşə.

Yunusdan bir nəsihət dutan yavuz olmaya,
Bil kim, eyü söz ilə hər bir iş gəlür başa.

### 143

Xoşdur əgər yürür isəm eşq odına yanə-yanə,
Bəs yanmadın necə olam, çün eşq odı düşdi canə.

Bu işlər təmam olıcaq xəlvət olur mə'şuq ilə,
Mə'şuq yüzin görən kişi gərək yanə vü dükənə.

Hər nəsnə çig olıcağaz od olmayınca bişməz ol,
Bənüm dirligim çig idi, eşq odı oldı bəhanə.

Bənüm dost ilə bazarum yaradılalıdan dəgül,
Sevər idük mə'şuqəyi hənuz gəlmədin cəhanə.

Eşq mə'şuqi Tapduqdurur, Yunus quldur ol qapuda,
Gədalarına lütf etmək həm qaidədür sultanə.

### 144

Aşiq oldum ərənə irməg ilə,
Həqqi buldum ər yüzin görməg ilə.

Ərə irdüm, ərdə buldum məqsudum,
Bulımadum taşradan sormağ ilə.

Hər yerə baqdum isə ər oturur,
Könlin aldum yüz yerə sürməg ilə,

Heqdən irər dürlü nəsib canlara,
Olmaz imiş Kə'bəyə varmağ ilə.

Kə'bə sənün eşigündür, bilmiş ol,
Bulımazsın yol çəküb armağ ilə.

Bınar idüm, ərənlər qıldı nəzər,
Dəniz oldum dört yana ırmağ ilə.

Ün gəldi Yunus, deyü durdum urı,
Gözüm açdı qulağum burmağ ilə.



### 145

Könül netə dolana mə'şuqin bulmayınca?!
Kimsə aşiq mi olur könülsüz qalmayınca?!

Boynı zəncirlü gəldük, key qatı yesir olduq,
Ər nəzər eyləmədi halumuz bilməyincə.

Yedi nişan gərəkdür həqiqətə irənə,
Sevdügi girməz ələ sevdüklər verməyincə.

Sözi Yunusdan eşit, kibr qılma, dut ögüt,
İmarət olmayasın ta xərab olmayınca.

### 146

Vəsfi-halin aydısaram vüslət halin bilənlərə,
Yedi dürlü nişan gərək həqiqətə irənlərə.

Bu yedisindən birisi əksük olursa olmaya,
Bir nəsnə əksük gərəkməz bu sarb yola varanlara.

Əvvəl nişanı budurur yerməyə cümlə milləti,
Yerənlər yerini qaldı, yer dəgmədi yerənlərə.

İkinci nişanı oldur kim, nəfsini səmirtməyə,
Zinhar, siz andan olmanuz nəfsinə qul olanlara.

Üçünci nişanı budur cümlə həvəslərdən keçə,
Həvəslər əri yolda qor, yetəməz yol varanlara.

Dördünci nişanı oldur dünyadən münəzzəh ola,
Dünya səni sayru eylər, nə qövl qaysu sayrulara.

Yunus yedi nişan dedi, əvət, üçini gizlədi,
Anı dəxi deyü verəm gəlüb xəlvət soranlara.

## 147

Miskinlikdə buldılar kimdə ərlik var isə,
Nərdüvandan yitdilər yüksəkdən baqar isə.

Könül yüksəkdə gəzər, dəmbədəm yoldan azar,
Taş yüzinə ol sızar içində nə var isə.

Aq saqallu pir qoca biliməz hali necə,
Əmək yeməsün Həccə, bir könül yıqar isə.

Sağır eşitməz sözi, gecə sanur gündüzi,
Kordur münkirün gözi, aləm münəvvər isə.

Könül Çələbün təxti, könülə Çələb baxdı,
İki cəhan bədbəxti kim könül yıqar isə.

Sən sana nə sanursan, ayruğa da anı san,
Dört kitabun mə'nisi budur əgər var isə.

Bildük gələnlər keçmiş, qonanlar gerü köçmiş,
Eşq şərabından içmiş kim mə'ni tuyar isə.

Yunus yoldan azuban yüksək yerdə turmasun,
Sinlə sirat görməyə sevdügi didar isə.

## 148

İstədügimi buldum aşkərə can içində,
Taşra istəyən kəndü kəndü nihan içində.

Qədimdür, hiç ırılmaz, ansuz kimsə dirilməz,
Adım-adım yer ölçər hökmi-rəvan içində.

Dutun deyü çağırur, oğrı dəxi çağırur,
Bu nə əcaib oğrı bu çağıran içində.



Siyasət meydanında ğələbədən baqan ol,
Siyasət kəndü olmış girmiş meydan içində.

Dartmış qüdrət qılıcın, çalmış nəfsün boynını,
Nəfsini dəpələmiş – əlləri qan içində.

Sayru olmış inilər, Qur'an ünini dinlər,
Qur'an oquyan kəndü, kəndü Qur'an içində.

Bu tilsimi bağlayan, cümlə dildə söyləyən,
Gör necə cövlan (edər) xirqə, palan içində.

Dürlü-dürlü imarət, köşkü saray yapan ol,
Qara niqab dutunmış, girmiş külxan içində.

Başdan ayağa dəgin Həqdür ki, səni dutmış,
Həqdən ayru nə vardur, qalma güman içində.

Bir isən birligə gəl, ikiyi bıraq əldən,
Bütün mə'ni bulasın sidqü güman içində.

Oruc, namaz, ğüslü Həcc hicabdur aşiqlərə,
Aşiq andan münəzzəh xalis həvəs içində.

Girdüm könül şəhrinə, taldum anun bəhrinə,
Eşq ilə gedər ikən iz buldum can içində.

Bu izümi izlədüm, sağum-solum gözlədüm,
Çoq əcaiblər gördüm – yoqdur cəhan içində.

Yunus, sənün sözlərün mə'nidür bilənlərə,
Söylənisər sözlərün dövri-zəman içində.

## 149

Can olğıl can içində, qalma güman içində,
İstədügün bulasın yaqın zəman içində.

Rüku' sücudə qalma, əməlünə tayanma,
Elmü əməl ğərq olur nazü niyaz içində.

İkiligi tərk etgil, birlik məqamın dutğıl,
Canlar canın bulasın işbu dirlik içində.

Oruc, namaz, zəkat, Həcc cürmü cinayətdürür,
Fəqir bundan azaddur xassü həvas içində.

Şəriət qorıcıdur həqiqət ordusında,
Sənin içün qorınur hasil ordu içində.

Eynəlyəqin görüpdür, Yunus məcnun olupdur,
Bir ilə bir olupdur həqqülyəqin içində.

**150**

Dərviş olan kişilər əcəb necə dirilə?!
Yol təqazası budur bir ola hər birilə.

İkilik eyləməyə, hiç yalan söyləməyə,
Aləm bulanur isə bulanmadın turıla.

Əcəb öylə kim ola bulanmadın turıla,
Öyləlik istər isən yoldaş olğıl ər ilə.

Ər ilə yoldaş olan key olası könüldən,
Aləm yoldaş olurdı olurmısa dil ilə?!

Dildən nəsnənə gəlməz, suyilə könül yunmaz,
Gerçəgin gələnləri yedərlər bir qıl ilə.

Dünü günin çəkərlər ol qıl üzülsün deyü,
Ömrin anda bərkitmiş yedilür bir qıl ilə.

İncə sanman ol qılı, gəzaf sanman bu yolı,
Ərənlər keçdi gəldi hər biri bir hal ilə.

Hər kim hali hallandı, ol bəg oldı qullandı,
Yunus, sən qul olı gör, bəg söyləşür qul ilə.



**151**

Ey qopuz ilə çeştə, əslün nədür, nə işdə?!
Sana sual soraram, aydıver bana üşdə.

Aydur ki, əslüm ağac, qoyın kirişi bir qaç,
Gəl işrətüm dinlə keç, əqli qoma bələşdə.

Aydurlar bana həram, bən oğrılıq dəgüləm,
Çünki əslüm mismildür, nə var imiş kirişdə.

Bana kiriş dedilər, eşqə giriş dedilər,
Bənüm adum eşq verdi, bən durmazam qolmaşda.

Şadılığilə gəldüm işbu aləmə toldum,
Mürvətlərə düzüldüm, qodılar işbu düşdə.

Ağac dəri dirildi, kiriş ilə bir oldı,
Eşq dənizinə taldı, bəhanə yoq bu işdə.

Mövlana söhbətində saz ilə işrət oldı,
Arif mə'niyə taldı, çün bilədür fəriştə.

Fəriştəyi anmaqdan biləsin murad nədür,
Gecə-gündüz bilədür sənün ilə hər işdə.

Ol fəriştələr adı Kiramən katibindür,
Yazmaqdan usanmazlar, armazlar yazü qışda.

Birisi sağ omzunda, birisi sol omzunda,
Birisi xeyrün yazar, birisi şər cünbüşdə.

Kağızları dükənməz, nə xud mürəkkəbləri,
Aşınmaz qələmləri, qaimlərdür ol işdə.

Həm meyxanəyə varur, həm bütxanəyə girür,
Bunlar saqlarlar səni, sən ğafilsin bu işdə.

Yunus, imdi sübhanı vəsf eyləgil könüldə,
Ayru dəgül arifdən bu qopuz ilə çeştə.

152

On səkiz bin aləm xəlqi cümləsi bir içində,
Kimsə yoq birdən artuq, söylənür dil içində.

Cümlə bir anı birlər, cümlə ana gedərlər,
Cümlə dil anı söylər hər bir təbdil içində.

Cümlə göz anı gözlər, kimsə yoq nişan verür,
Görən kim, göstərən kim, qalduq müşkil içində.

Kim gördi anı əyan, nə nəqşü nə xud nişan?!
Sözi "lənterani"dür Musayə Tur içində.

Toqsan bin Həqq kəlamı, altmış bini amü xas,
Otuz bini xasül-xas, oldurur sirr içində.

Oldurur ol gizlü söz, arif söylər dün-gündüz,
Hiç nişanı dinmədi hurü qüsur içində.

Yunus, sən dilər isən, dostı görəm der isən,
Əyandur görənlərə ol könüllər içində.

153

İsrafil surı urıla, yerün yüzi dəgşirilə,
Xərab ola yaşü qurı, çərxi-fələk də yorıla.

Kimsənə qalmaya bunda, fəna ola həpi sində,
Mikayilün dükkanında şol həqq tərazu qurıla.

Əyan ola çün cümlə iş, qurtılmaya yadü biliş,
Gələ fülan ibni fülan, həp adıyilə çağrıla.

Cümlə xəlaiq həp bitə, yer yüzini düpdüz duta,
Hökm eyləyə Cəbbari-vəqt məhşər dəpə həp sürilə.



Qopa qiyamətün hövli, ikinci nəfhənün qövli,
Üçünci nəfhə içində yerü gög yüzi yarıla.

Çün gələ siddiq sanub, aşiq(lər)ə yoqdur xövf,
Yarın (ol) məhşər günində "yaumə yəşufə'" qurıla.

Yunus, var yarağun əylən, yol qorquludur key əglən,
Önündə qətran dənizi qıldan sirat da gərilə.

154

Kimsə döyməz bu nəzərə, eşq ilə kim pənçə ura?!
Bu nəzərə qarşu duran xanümanın ğərqə verə.

Çün əlini eşqə ura, eşq oqına kimdür tura,
Gög yüzində məlaiki eşq anı endürə yerə.

Gör Harut, Marut nəyidi, həzrətdə fəriştəyidi,
Nəsibin eşqə aldurub məqamın Zöhrəyə verə.

Abdəstümüz, namazumuz, doğrulıqdur taətümüz,
Eşq ilə bağladuq qamət, səfümüzü kim ayıra?!

Məscid, mədrəsə olduğı, ban cəmaət qılınduğı,
Xəlaiq səf-səf turduğı eşq şükranəsidür zira.

İçümdə yanar eşq odı, könlümdə anun həsədi,
Eşq odınun tütünindən Yunusun bənzi sarara.

155

Biməkanum bu cəhanda, mənzilüm, turağum anda,
Sultanam ki, təxtü tacum hüllə vü burağum anda.

Əyyubam, bu səbri buldum, Cərcisəm ki, bin gəz öldüm,
Bən bu mülkə tənha gəldüm, bikülli yarağum anda.

Bülbüləm uş ötə gəldüm, dildə mənşur duta gəldüm,
Bunda müşküm sata gəldüm, keyigəm – otlağum anda.

Kim nə bilə nə quşam bən, şol ay yüzə tutaşam bən,
Əzəlidən sərxoşam bən, içmişəm ayağum anda.

Dəliyəm, pəndi dutmazam, dəgmə bir yerə getməzəm,
İşbu sözi eşitməzəm, vəlakin qulağum anda.

Sirr söz aşkərə dinməz, anda su oda göyünməz,
Dünü gün yanar söyünməz, bu bənüm çırağum anda.

Bən bu mülkə qıldum cövlan, yedi kərə urdum seyran,
Mühəmməd nurını gördüm, bənümdür məkanum anda.

Yunus bu fikrətə taldı, həp cəhanı arda saldı,
Vallahi, xoş ləzzət aldı, tolmışdur dimağum anda.

**156**

Uş genə nəzər oldı bu bizüm canumuza,
Mühəmməd bünyad urdı dinü imanumuza.

Peyğəmbərlər sərvəri din dirəgi Mühəmməd,
Gör nə göhərlər qomış bu bizüm kanumuza.

Hay gəl, əməl edəlüm əlümüz irər ikən,
Əcəl irər ansuzın, irməzüz sanumuza.

Ey diriğa, nedəlüm biz də əməl edəlüm,
Xişm edüb yapışalar bu kəfən donumuza.

Sorucılar gələlər, sorı-hesab alalar,
Qarangu sin içində otura yanumuza.



Ölüm həqdür, bilürsin, neçün ğafil olursın?
Əzrayil qəsd edisər günahlu canumuza.

Miskin Yunus bu sözi kendözindən ayıtmaz,
Həqq Çələb veribidi səbəğün dilimüzə.

**157**

Yenə bu badi-növbahar xoş növ ilə əsdi yenə,
Yenə qışun sovuqluğı füzullığın kəsdi yenə.

Yenə rəhmətdür biqiyas, yenə işrət oldı dəmsaz,
Yenə gəldi bu yeni yaz, qutlu qədəm basdı yenə.

Yenə yeni xəzinədən yeni xəl'ət geydi cəhan,
Yenə verildi yeni can, otü şəcər süsdi yenə.

Ölmiş idi otü şəcər, dirildiləri bitdilər,
Müşriklərə nüktə yetər, var eylədi nəsli yenə.

Yenə səhər mürğzarı xoş aqar əsrük suları,
Bülbül gülə qarşu turub can budağa asdı yenə.

Sözüm yazü qışçün dəgül, vallah bu, düş içün dəgül,
Aşiqlərün cür'əsindən, Yunus, qədəh susdı yenə.

**158**

Bir imarət göstər bana kim, sonı viran olmaya,
Qazan şol malı kim, səndən dökilüb gerü qalmaya.

Dökilüb qalisər malun, ayruqlar ala həlalun,
Səndən gerü qalan malun sana assısı olmaya.

Ol mal ki (ol) Xəlilidür, xeyirlərə yeltər səni,
Ol mal ki ol Qarunundur, issi hiç rahət olmaya.

İsrafil surını ura, tağlar, dəpələr sürilə,
Bir qarınca cəvabını bin Süleyman verəmiyə.

Bu dünyə həb issüz qala, altunı malı dökilə,
Səbil olubanı yitə, hərgiz issi bulunmaya.

Hey Yunus Əmrə, ölüncə var yüri toğru yolunca,
Dünyasını tərk edənlər yarın həsrətdə olmaya.

**159**

Sana derəm, ey vəli, tur ertə namazına,
Əgər dəgülsən öli, tur ertə namazına.

Əzan oqur müəzzin, çağırır Allah adın,
Yıqma dinün bünyadın, tur ertə namazına.

Ağar pərvazə quşlar, təsbih oqur ağaclar,
Himmət alan qardaşlar, tur ertə namazına.

Namazı qıl, zikr eylə, əlün götür şükr eylə,
Öləcəgün fikr eylə, tur ertə namazına.

Namaz qıl yarağ olsun, axrətdə gərək olsun,
Sinləkdə çırağ olsun, tur ertə namazına.

Namaz qıl iman ilə, yatmağıl güman ilə,
Gedəsin iman ilə tur ertə namazına.

Çıqa gedə can dəxi, şöylə qala tən dəxi,
Dərviş Yunus, sən dəxi tur ertə namazına.

**160**

Ol dost içün ağlar isəm gözüm yaşını kim silə?
Ya bunca ahü zar ilə bu göz yaşı becid gələ.

Ey yarənlər, ey qardaşlar, kimə deyəm əhvalümi?
Ya şu bənüm bu dərdümün dərmanını kim nə bilə?



Aləm dərman olur isə sənsiz dərman olmayısar,
Sənsüz dərman necə ola, çün könüldə dost sevilə.

Ölüb sinə girür isəm, ətüm, tənüm çürüməyə,
Ayrılmayam sevdügümdən, çün gedərin sevgüyilə.

Əhdi-sabiq denilmədin, hənuz "ələst" buyrulmadın,
Ol bən idüm, bən ol idi, bəs bu necəsi kəsilə?!

Yarənlərüm aydur bana, səni neçün görəmədük?
Firqətə düşdi surətüm bir mənzildən o mənzilə.

Ol dost ilə bənüm işüm olub dəxi bitməyisər,
Bən necə ola kim bitə, çün könüldə dost sevilə.

Yarın məhşər qopıcağaz qamu qul nəfsüm deyisər,
Bən Yunusı hiç anmayam, Tapduğı gətürəm dilə.

**161**

Anmamısın şol güni (sən), gözün nəsnə görməz ola,
Düşə surətün toprağa, dilün xəbər verməz ola.

Çün Əzrayil enə tuta, assı qılmaz ana-ata,
Kimsə döyməz o heybətə, xəlqdən mədəd irməz ola.

Oğlan gedər danişmana, səladur dosta-düşmana,
Sonra gəlmək peşimana sana assı qılmaz ola.

Əvvəl gərək şol yuyıcı ardınca şol su qoyıcı,
İlədüb kəfən sarıcı bunlar halun bilməz ola.

Ağac ata bindürələr, sindən yana göndərələr,
Yer altına endürələr, kimsə ayruq görməz ola.

Üç günədək oturalar, həb işini bitürələr,
Ol dəm dilə gətürələr, ayruq kimsə anmaz ola.

Yunus Miskin, bu ögüdi sən sana versən yeg idi,
Bu şimdiki məxluqata ögüt assı qılmaz ola.

### 162

Zehi şirin xulu dilbər durağı rəvan içində,
Can evini ol almışdur, ayuruq nə sığar anda?!

Can içində dostı bulan ayruq nə yerdə istəsün?!
Anı taşra sananlarun ömri keçdi pərakəndə.

Anun eşqinün çözgüsi kəndüdə göstərdi bizi,
Könül əsrük, Həqqə aşiq, əsir olmış bu dərmanda.

Anı bana sorar isən, bu yönüm dostdan yanadur,
Hər nə haldə yürür isəm, mehrüm arta durur gündə.

Bu surətdə kim var dəxi yönin ayruq yana dönə,
Bənüm varlığum dost aldı, əsərümdür qalan bunda.

Anı bana soranlara necə nişan aydı verin?
Diliylə kim ayda bilə bu eşqün durağı qanda?

Zehi ilahi dövlətdür kimə yoldaş olur isə,
Kim dost ilə sürdi eşqi bu arada, bu məkanda.

Dost yüzini görən kişi kəndözini qoyasıdur,
Dünya dutan gələn hərif dutsaq olur bu ərkanda.

Gör necə şirindür(ür) ki, qocalar(ı) yigit eylər,
Ayılmadı əsrükligi, nə şur edər bu meydanda.

Yunus, gəl gör aşiqləri necə yavı varub durur,
Dünya axrət əldən qoyub nə verəndə, nə alanda.



### 163 (154-ün eynidir)

### 164

Mə'ni bəratın alduq uş genə əlümüzə,
Eşq sözin veribdi padişəh dilümüzə.

Eşq sözlərin söylər can, canları eylər heyran,
Cahillər girəməzlər bu bizüm sirrümüzə.

Sirrümüzə irməzlər, anın yoldaş olmazlar,
Dəgmələr haldaş olmaz bu bizüm halumuza.

Halumuza haldaş ol, sirrümüzə sirdaş ol,
Müşkilün əyan olsun, baş endir ulumuza.

Bu bir genci-nihandur, n'istər dəgmələr bunda?
Neçə ördək, neçə qaz xoş enər gölümüzə.

Şol yaqımı biz yaqduq, dünyayı əldən qodıq,
Axrəti qəbul etdük, şakirüz ulumuza.

Yunus, sən bəhri olğıl, eşq göllərinə dalğıl,
Bu həqq sözləri alğıl, irəsin kanumuza.

### 165

Görənün hali dönər nişansuz binişanə,
Əsritdün cümlə xəlqi, sırf içildi peymanə.

Sən bisifat sifatsın, binəhayət nihansın,
Aşiqlərə dövlətsin, məşhur oldun cəhanə.

Sözün eşidən qulaq kəndüdən getdi andaq,
Cümlə könüllər mütləq səddəq dedi bürhanə.

Sənünlə bir dəm birlik oldur cəhanda ərlik,
Səndən ayruqsı dirlik oldı qamu əfsanə.

Sənün hikmətün ıraq, sənsin canlara turaq,
Sən yandurduğun çıraq əbədi ömür yanə.

Xassül-həvas babısın, aşiqlər kitabısın,
Mütləq didar qapusın göricək məxluq sana.

Yer göğ qaim turduğı, dənizlər mövc urduğı,
Cənnətü hur olduğı cümlə sana bəhanə.

Dəxi yer, göğ yoğ idi, cümlə söz mənsux idi,
Aşiqlər taparlardı ol binişan sübhanə.

Bu göz kəndözin görməz, nişan nişanın verməz,
Yunusun əqli irməz, anın oldı divanə.

### 166

Kimün nə zəhrəsi vardur sana qılınc yürütməgə?!
Cümlə aləm əlündədür, kim nə bilür əl qatmağa.

Verən, alan sən olıcaq kim cünbüş eyləyə bilə?!
Hər qandasa qüdrət sənün pirü yigit oynatmağa.

Cümlə xəznələr sənündür, kimə dilərsən verəsin,
Kimün (nə) zəhrəsi vardur dəstursuz adım atmağa?!

Cümlə aləmün üstinə xeyrü şərri saçan sənsin,
Xişmü rəhmət həvalədür kəndü əslinə qatmağa.

Tövfiq inayət olmasa kim səbəb eyləyü bilə?!
Hər qandasa qüdrət sənün hər işə əl uzatmağa.

İblisü Adəm kim olur bunda füzulluq eyləyə?!
Yerlü yerinə sən qodın, qul gəldi qullıq qılmağa.



Ey yarenlər, siz bu sözi dinlən könül qulağilə,
Can dodağı xalis gərək eşq şərabını datmağa.

Bu dirligi tuyan canun hiç fikri bunda dəgüldür,
Yunus, dilin yumışdurur bu tövhidi eyitməgə.

### 167

Kimə kim dost gərək isə aydayın nə qılasını,
Tərk eyləyə kəndözini, hiç anmaya nolasını.

Rəsmidürür aşiqlərün dost yolında qurban olmaq,
Minnət dutar cümlə aşiq canını eşq alasını.

Hər kim aşiq olmadısa qurtulmadı məkr əlindən,
Qamusından eşq ayırur dünya axrət bəlasını.

Layiq dəgüldür dəgmə can dost yolına xərc olmağa,
Ümid dutar cümlə aşiq dosta qurban olasını.

Dostdan yana gedən kişi kəndözindən keçmək gərək,
Dost yəğmalar can şərini, alub könül qəl'əsini.

Dost yolına günilənə gerü dönmək olmayısar,
Bilməmisin bu qamusı səndən gerü qalasını.

Surət gözi nə görisər, dost məclisi qandadur(ur),
Can qulağıdur eşidən bu aşiqlər naləsini.

Bu dünyədə dostdan artuq Yunus nəsnəyi sevmədi,
Bilməzmisin qeyrətsüzə dostü düşmən güləsini?!

### 168

Bana namaz qılmaz demə, bən bilürəm namazumı,
Qılur isəm, qılmaz isəm ol Həqq bilür niyazumı.

Dostdan ğeyri kimsə bilməz kafir müsülman kimdügin,
Bən qıluram namazumı Həqq keçürdisə nazumı.

Ol nazı dərgahda keçər, mə'ni şərabından içər,
Hicabsuz can gözin açar, kəndü silər dost gözümi.

Dost bundadur bəllü bəyan, dost didarın gördüm əyan,
Elmü hikmət oqıyanun buna dəgindür əzimi.

Hər dəm dost yolın bulmayub, gizlü mə'ni şərh eyləyüb,
Dəgmə aşiq şərh etməyə bənüm bu gizlü razumı.

Sözüm mə'nisinə irün, binişandan xəbər verün,
Dərdlü aşiqlərə sorun bənüm bu dərdlü sözümi.

Dərd aşiqün dərmanıdur, dərdlü aşiqlər qənidür,
Qadir qüdrət ünidür der eşidənlər avazumı.

Dost istəyən gəlsün bana, göstərəyin dostı ana,
Budur sözüm öndən sona, bən bilürəm kəndözümi.

Yunus, imdi söylə Həqqi, münkir dutsun sana dəqi,
Bişübdürür Həqqin xanı, ariflər datsun duzumı.

## 169

Çələb veribiyə sana bir gün əcəl sərhəngini,
Gələ görinə gözinə, azdura bənzin rəngini.

Ayda sana əmanəti, issi dilər tapşurayın,
Ala səndən əmanəti, edə sənünlə cəngini.

Əmanəti səndən ala, gövdəni quru, boş sala,
Vəballar boynunda qala, nəfsün ura gülbangini.

Malınu varın, ey paşa, xəsmün-qövümün üləşə,
İlədələr səni, haşa, görəsin sinün təngini.

Səni sinündə qoyalar, mənzil mübarək deyələr,
Üstinə tez-tez yumalar dünyanun xakü səngini.



Qarangu yerdə olasın, əməlün ilə qalasın,
Çox ah edüb söyləyəsin peşmanlığunü nəngini.

Yunus, imdi tövbəyə gəl, can səndəkən eylə əməl,
Eşq ilə gəl quşanı gör bu dərvişlik palhəngini.

## 170

Bir sualum (var) sana, ey dərvişlər əcəsi,
Məşayix nə buyurur yol xəbəri necəsi?

Vergil sualə cəvab, dutalum olsun səvab –
Şö'lə kimə göstərir eşq evinün bacası.

Əvvəl qapu şəriət əmrü nəhyi bildürür,
Yuya günahlarunı hər bir Qur'an hecəsi.

İkincisi təriqət, qulluğa bel bağlaya,
Yolı toğrı varana yarlığaya xocası.

Üçüncüsi mə'rifət can, könül gözin açar,
Baq mə'ni sarayına – ərşə dəgin yücəsi.

Dördüncüsi həqiqət, ərə əksük baqmaya,
Bayram ola gündüzi, Qədr ola gecəsi.

Bu şəriət güc olur, təriqət yoquş olur,
Mə'rifət sarplıqdurur, həqiqətdür yücəsi.

Dərvişün dört yanında dört ulu qapu gərək,
Qancaru baqar isə gündüz ola gecəsi.

Ana irən dərvişə iki cəhan kəşf olur,
Anun sifatın ögər ol xocalar xocası.

Dört hal içində dərviş gərək siyasət çəkə,
Mənzilə irməz, qalur yol əri yuvacası.

Qırq kişi bir ağacı tağdan gücin endürə,
Ya bunca mürid mühibb sirat necə keçəsi?

Küfrün atarkən saqın imanun urmayasın,
Yoxsa sırsın güvəci, səbil olur güvəci.

Dört qapudur, qırq məqam, yüz altmış mənzili var,
Ana irənə açılur vilayət dərəcəsi.

Aşiq Yunus bu sözi mühal deyü söyləməz,
Mə'ni yüzin göstərür ol aşiqlər qocası.

171

Həqq nuru aşiqlərə hər dəm nüzul dəgülmi?!
Kimə kim nüzul dəgməz, Həqdən mə'zul dəgülmi?!

"Əl-qəlbu minəl-qəlbi" rövzənün sorun nədür,
Hər könüldən könülə rast doğru yol dəgülmi?!

Qarğayilə bülbüli bir qəfəsə qoysalar,
Bir-biri söhbətindən daim məlul dəgülmi?!

Eylə kim qarğa dilər bülbüldən ayrılmağa,
Bülbülün də məqsudi, billahi, ol dəgülmi?!

Cahil ilə arifün məsəli şuna bənzər,
Cahil qatında iman mə'lum-məchul dəgülmi?!

Yetmiş iki millətün sözini arif bilür,
Miskin Yunus sözləri cümlə üşul dəgülmi?!

172

Eşq bəzirganı sərmayə canı,
Bəhadur gördüm cana qıyanı.

Zehi bəhadur can tərkin urur,
Qılıcını kəsər himmət geyəni?!



Qamusın bir gör kəmtərin, ər gör,
Öli görməgil palas geyəni.

Tez çıqarur(lar) fövqəl'-əlayə
Bin İsa kibi dinə uyanı.

Tez endürürlər təxtəs-səraye
Bin Qarun kibi dünya qovanı.

Aşiq olanun nişanı vardur,
Məlamət olur bəllü bəyanı.

Çün Mənsur gördi, ol bənəm dedi,
Oda yaqdılar, eşitdün anı.

Oda yandurdun, külin savurdun,
Eyləmi gərək səni sevəni?!

Zinhar, ey Yunus, gördüm deməgil,
Oda yaqarlar gördüm deyəni.

173

Qaçan (kim) ol dilbər bənüm göz(lər)ümə tudaş oldı,
Aldı ussumı, əqlümi, könülümə yoldaş oldı.

Könlüm aydur bənəm qulı, canum aydur bənəm qulı,
Hiç bilməzəm kimündür ol, ara yerdə savaş oldı.

Bu ikisi arasında bildüm dövlət bənüm imiş,
Hiç danışuğum yoğ ikən başum anunla xoş oldı.

Hər qancaru baqar isəm, oldur gözümə tuş olan,
Önüm, ardum, sağum, solum gənc yaz oldı, gər qış oldı.

Xızrü İlyas dəgül ikən ölməz dirligə sataşdum,
Hərgiz yeməz, içməz ikən içüm toptolu aş oldı.

Cümlə aləmün könlində vardur anun məhəbbəti,
Anı candan sevməyənün, bil kim, imanı taş oldı.

Sənün eşqün odı məgər sıçramaya kimsənəyə,
Bir zərrə dəgdi Yunusa, cəhan içində faş oldı.

**174**

Yer gög yaradılmadın Həqq bir göhər eylədi,
Nəzər qıldı göhərə, sığmadı dövr eylədi.

Göhərdən buğ çıqardı, ol buğdan gög yaratdı,
Gög yüzinün bəzəgin çoq ılduzlar eylədi.

Gög' ayıtdı dön dedi, ayü gün yürsün dedi,
Suyı müəlləq dutub üstini yer eylədi.

Yer çalqandı, turmadı, bir dəm qərar qılmadı,
Yücə-yücə tağları Həqq çöksilər eylədi.

Əzrayil yerə endi, bir avuç topraq aldı,
Dört fəriştə yoğurdı, bir peyğəmbər eylədi.

Çün can gövdəyə girdi, aqsırdı turı gəldi,
Əl götürdi şol qədər, Həqqə şükür eylədi.

Allah aydur Adəmə, şükür, irdün bu dəmə,
Bu dünyədə nə tuydun, dilün nəyə söylədi?

Yoğ ikən var eylədün, toprağ ikən can verdün,
Qüdrət diliylə andun, dilüm söylər eylədün.

Bu söz Həqqə xoş gəldi, qulın əziz eylədi,
Nə keçdisə könlindən verdi, hazır eylədi.

Bu söz Yunusa qandan, xəbər verəsi candan,
Məgər ol sultan lütfi ana nəzər eylədi.



**175**

Çələb Adəm cismini topraqdan var eylədi,
Şeytan gəldi Adəmə tapmağa ar eylədi.

Aydur, bən oddan-nurdan, ol bir avuç topraqdan,
Bilmədi kim, Adəmün içün göhər eylədi.

Zahir gördi, Adəmün batininə baqmadı,
Bilmədi kim, Adəmi xəlqə sərvər eylədi.

Qırq yıl qalıbı yatdı, adı aləmi tutdı,
Gör şeytanı büğzindən nə fitnələr eylədi.

Adəm topraq yatmışdı, at aləmi tutmışdı,
Fikrinə baq İblisün, yəni hünər eylədi.

Ol yüriyən atları sürdi Adəm üstinə,
Adəmə məkr eyləyüb yə'ni zəfər eylədi.

Adəmün göbəgindən Çələb yaratdı anı,
Vaf(i) deyüb turı gəldi, anlar güzər eylədi.

Çün getdi Adəm əhdi, yetdi Musanun vəqti,
İblisə işbu işlər yavlaq əsər eylədi.

Musa gönüldi Tura Həqqə münacat edə,
Gördi kim, bir aqar su, Musa nəzər eylədi.

Musa aydur görəyin işbu su nerdən gəlür,
Gər böylə aqar isə zirü zəbər eylədi.

İlərü vardı Musa, gördi ləini ağlar,
Gözi yaşıyımış su, gözin bınar eylədi.

Musa sordı ləinə, ağladuğun neçündür,
Nedəyin ağlamadın işümi zar eylədi.

Müqərrəb idüm bən ol Həqqün dərgahında bol,
Götürdi urdı yerə, candan bezər eylədi.

Sən bilməmisin, Musa, bən nədən ayrılduğum,
Şunlar önümə düşər, bəni əvkar eylədi.

Varğıl ayıtğıl, Musa, rəhmət eyləsün bana,
Tövbə qıldum, işümə xoş istiğfar eylədi.

Musa irdi həzrətə, başladı münacata,
Unutdı əmanəti, söz müxtəsər eylədi.

Çələbdən irdi nida, qanı əmanət – dedi,
Ol nidaya canını Musa nisar eylədi.

Varğıl ayıtğıl, Musa, rəhmət edəyin ana,
Səcdə etsün Adəmə, çün istiğfar eylədi.

Musa gəldi ləinə dedi Həqqin buyruğın,
Səcdəyi eşidicək döndi inkar eylədi.

Bən andan umar idüm dərdümə dərman qıla,
Dərdüm dəxi arturdı, yə'ni timar eylədi.

Bən əgər tapsam ana, ol vəqtin tapar idüm,
Şimdi xud topraq olub zirü zəbər eylədi.

Adəm, İblis kim ola, işi işlədən Çələb,
Ayü güni yaradub leylü nəhar eylədi.

Mə'ni nədür İblisdən, füzulluqdurur bizdə,
Tuydunsa işbu sözdən, sirri aşkar eylədi.

Çələb aydur şol qula, inayət bəndən ola,
Nə şeytan azdırusar, nə kimsə kar eylədi.

Altı bin yedi yüzi yıldan keçən Adəmi,
Dilə gətürdi Yunus, şimdi təkrar eylədi.



### 176

Bənciləyin görən kişi bən sevdügimün yüzini,
Dəlü ola tağa düşə, yavu qıla kəndözini.

Bən necəsi deyü biləm cəmali tərtibin anun,
Kim, can dodağıdur dadan anun qılıncı tozunı.

Hər nərəyə varur isə ol şirin xulu dilbərüm,
Yetmiş iki millətə ol keçürür dürlü nazını.

Kişi nəyi sevər isə dilində sözi ol olur,
Kəksüz söyləyəsüm gəlür daima anun sözini.

Kişi kəndüligi ilə dosta layiq olmaz imiş,
Məhəbbət bürcində ol qor aşiq(lər)ün ılduzını.

Dərdsüzlərə bənüm sözüm bənzər qaya yanqusına,
Haldaşı bilür kişinün könlində gizli razını.

Bu Yunusun gördügini əgər Zöhrə göreyidi,
Çəngini əldən bırağub unuda idi sazını.

### 177

Biz bizi bilməz idük, bizi yaradan eylədi,
Aşikarə bizi qıldı, kəndüyi pünhan eylədi.

Biz bilə pünhan idük, ğeyri sənü bən idük,
Mütləq bigüman idük, həm bigüman eylədi.

Toprağı qüdrətindən surətü xətt bağladı,
Dört fəriştə yoğurdı, Adəm andan eylədi.

Çün yaratdı Adəmi, biləyidük biz qamu,
Bu qamu xasü amı bir mə'dəndən eylədi.

Əsli mə'dəndə idük, qayğusuz, ğəni idük,
Şol binişan cəhandan şöylə nişan eylədi.

Görgil Çələb fəzlini, yıqmaz asi könlüni,
Yüz bin yigirmi dört bin ol tərcüman eylədi.

Qamu bir yerə gedər, kimsə, neçəsi yitər,
İki birdür, bir bitər, gör bir nədən eylədi.

Adəmdən buna dəgin nə əli var, nə yenin,
Yeməg ilə geyməgi bir danədən eylədi.

Çün nəfs oldı həvalə, tağıtdı dəgmə yola,
Tatlu oldı nəvalə, ol sənü bən eylədi.

Səni nə bilə fülan, nə söylər isə yalan,
Dünya çirkinə qalan işin güman eylədi.

"Əlest"də biləyidük, göz açduq bəli dedük,
Ayıdan Yunus idük, cümlə birdən eylədi.

**178**

Dostdan xəbər sorar isən, gəzaf dəgüldür dost işi,
Bəllü bilün, hiç nəsnədür bu cəhanda dostsuz kişi.

Hər kim ki dost yüzin görə, "dost, dost" deyü can(ın) verə,
Ol vəqtin ol dosta irə, unıda cümlə təşvişi.

Kim yol bulısardur ana, ol qağırur andan yana,
Dövlət irdi andan bana, hacət dəgül Hüma quşı.

Dost işi əcəb işdür(ür), can dənizə talmışdur(ur),
Cansuzlara bir düşdürür, gəl yorasın sən bu düşi.

Dost eşqindən aləm toldı, hər bir aşiq andan oldı,
Eşqsüz bitən çiçək soldı, eşq ilədür dostlıq xoşı.



Necə deyəyin bən anı, qəbul etməz yüz bin canı,
Ana layiq qiymət qanı, yoqdur anun dəki tuşı.

Eşqi sevə aşiq gərək, nə olısar eşqdən yegrək?!
Eşqdür yerə-gögə dirək, qalanı həb söz öküşi.

Yunus, imdi sən bən ikən aşiqlərə nə sənü bən?!
Yoqlıqdamış dostı sevən, qomaz ayruqsı baqışı.

**179**

Ol Çələbün eşqi bənüm bağrumı baş eylədi,
Aldı bənüm könlümi, sirrümi faş eylədi.

Hərgiz getməz könüldən, hiç əksük olmaz dildən,
Çələb kəndü nurını gözümə tuş eylədi.

Can gözi anı gördi, dil andan xəbər verdi,
Can içində oturdı, könlümi ərş eylədi.

Bir qədəh sundı cana, can içdi qana-qana,
Tolu gəldi peymanə, canı sərxoş eylədi.

Əsrük oldı canumuz, dürr dökər lisanumuz,
Ol Çələbümün eşqi bəni sərxoş eylədi.

Bən qaçan dərviş olam, ta ki ana eş olam,
Yüz bin bənüm kibiyi eşq xirqəpuş eylədi.

Yunus imdi avunur, dostı gördi sevinür,
Ərənlər məhfilində eşqə cünbüş eylədi.

**180**

Kəmdürür yoqsullıqdan neçələrün varlığı,
Bunca varlıq var ikən getməz könül tarlığı.

Batmış dünya malına, baqmaz könül halinə,
Yetmiş Qarun malına zehi iş düşvarlığı.

Bu dünya kimə qaldı, kimi bərxurdar qıldı?
Süleymana olmadı anun bərxurdarlığı.

Süleyman zənbil ördi, kəndü əməgin yerdi,
Anun ilə buldılar anlar bərxurdarlığı.

Gəl imdi, Miskin Yunus, nə'n var yola xərc eylə,
Gördün, əlündən gedər bu dünyanın varlığı.

**181**

Ol dost bəndən yana hiç bilməzin necə baqdı,
İşbu vücud şəhrinə bir xoş nəzər bıraqdı.

Gözüm anun yüzindən necə gedəri biləm?!
Şol şirin qılınc ilə könlümi şöylə yıqdı.

Kimdən ögüt istərsəm, səbri göstərür bana,
Səbr sərmayəsini məhəbbət odı yaqdı.

Səbrlə bənüm işüm necə varısar başa,
Canuma can bağışlar şol dostumun növəxti.

Sevdükli sevdügilə bilə qopardur yarın,
Bu iş yarına göyməz, bugünki dəm sayaqdı.

Yunus dost mürüvvətin ırmaya kendözindən,
Kişi nəyi sevərsə, canı ana uyaqdı.

**182**

Toldur bizə (sun) qədəhi eşq şərabından, ey saqi,
Ol dənizdən içür bizə, k'andan içər şeyxü fəqih.

Söhbətümüz ilahidür, sözümüz kövsər suyıdur,
Şahumuz şahlar şahıdur, çalğumuzdur dost fərağı.



Kim ki bir dəm söhbət ola, müfti, müdərris mat ola,
Bir ilahi dövlət ola, andan içən oldı baqi.

Xirqə ilə tac yol verməz, fərəc ilə alim olmaz,
Din diyanət olmayıcaq oqısan qamu varaqı.

Oqıdun yedi müshəfi, ha taət göstərür safi,
Çünki əməl eyləmədün, gərəksə var yüz yıl oqı.

Bin gəz Həccə vardun isə, bin gəz ğəza qıldun isə,
Bir gəz könül irdün isə, gərəksə var yollar doqı.

Könül mi yeg, Kə'bə mi yeg, ayıt bana, əqli irən,
Könül yegdürür, zira kim könüldədür dost turağı.

Könüllərin qonşılarun ısmarladı Həqq Rəsula,
Me'rac gecəsi dost ilə bu kələci oldı baqi.

Yunus, işün budur (həmin) dutğıl könüllər ətəgin,
Dilərsən baqi olasın, könüllər oldılar baqi.

**183**

Sana ibrət gərək isə gəl görəsin bu sinləri,
Gər taş isən əriyəsin baqub göricək bunları.

Şunlar ki çoqdur malları, gör necə oldı halları,
Son ucı bir könlək geymiş, anun da yoqdur yenləri.

Qanı mülkə bənüm deyən, köşkü saray bəgənməyən?
Şimdi bir evdə yaturlar taşlar olmış üstünləri.

Bunlar evə girməyələr, zöhdü taət qılmayalar,
Bu bəgligi bulmayalar, zira keçdi dövranları.

Qanı ol şirin sözlülər, qanı ol günəş yüzlülər?
Şöylə ğaib olmış bunlar, hiç bəlürməz nişanları.

Bunlar bir vəqt bəglər idi, qapucılar qorlar idi,
Gəl şimdi gör bilməyəsin bəg qanğıdur, ya qulları?!.

Nə qapu vardur girəsi, nə yemək vardur yeyəsi,
Nə ışıq vardur görəsi, dün olmışdur gündüzləri.

Bir gün sənün dəxi, Yunus, bənün dedüklərün qala,
Səni dəxi böylə edə, netəkim etdi bunları.

### 184

Ol keçüdün qorqusı uş bəni yoldan qodı,
Keçməz dəgmə ariflər köprüsin qıldan qodı.

Ol qaranğu cəhənnəm aşiqə köşkü saray,
Qula anda sual yoq, qulı sualdan qodı.

Dostun ətegin dutan dost ilə bazar edər,
Bazar edən dost ilə bazarın əldən qodı.

Ol Məryəm oğlı İsa durub dosta gedərkən,
Şol bir yarımca ignə İsayı yoldan qodı.

Yunus, imdi deməgil dostı gerçək sevərin,
Dostı gerçək sevənlər bənligin əldən qodı.

### 185

Banladı ol müəzzin, turdı qaimət eylədi,
Həzrətə tutdı yüzin, döndi niyyət eylədi.

Həzrətə bağlu əlüm, Fatihə oqur dilüm,
Belini büküb Həqqə xoş rüku'ət eylədi.

Şu bənüm hacətgahum Tur tağı oldı məgər,
Musiləyin bu könlüm xoş münacat eylədi.



Bir surət gördi gözüm, səcdəyə vardı yüzüm,
Yıqıldı tərtiblərüm, zöhdümi mat eylədi.

Nə dua qılam, nə səlam, nə zikrü təsbih qılam,
Bu beş vəqt namazumı eşqün ğarət eylədi.

Gör Yunusı neylədi, xoş xəbərlər söylədi,
Aşiq idi mə'şuqa, dadu sitəd eylədi.

### 186

Bən bəndə seyr edər ikən əcəb sirrə irdüm, əxi,
Bir siz dəxi, siz də görün, dostı bəndə gördüm, əxi.

Bəndə baqdum, bəndə gördüm bənüm ilə bir olanı,
Surətümə can olanı kimdürür, (bən) bildüm, əxi.

İstəyübən bulımazam, ol bən isəm ya bən qanı?
Seçəmədüm andan bəni, bir gəzdən ol oldum, əxi.

Surət topraqdur deyəni könlüm qəbul etməz anı,
Bu toprağun cövhərini həzrətə irgürdüm, əxi.

Münkir kişi tuymaz bunı, dərdlülərün sizər canı,
Bən eşq bağı bülbüliyəm, ol bağçadan gəldüm, əxi.

Mə'şuq bizimlədür bilə, ayru dəgül qıldan-qıla,
Iraq səfər bizdən qala, dostı yaqın buldum, əxi.

Dəgmə bir yol qandan bana, tağılmayam dəgmə yana,
Qutlu oldı bu səfərüm, xoş mənzilə irdüm, əxi.

Mənsur idüm bən əzəldə, anun içün gəldüm bunda,
Yaq külümi savur gögə, bən "ənəl-həqq" oldum, əxi.

Nə oda yanam tağılam, nə dara çıqam boğılam,
İşüm bitincə yüriyəm, təfərrücə gəldüm, əxi.

Mün'im oldum yoqsul ikən, bənüm oldı kövnü məkan,
Yerdən-gögə, məğrib-məşriq, yerə-gögə toldım, əxi.

Netəkim bən bəni buldum, bu oldı kim, Həqqi buldum,
Qorqum anı bulıncadı, qorqudan qurtuldum, əxi.

Yunus, kim öldürür səni, verən alur genə canı,
Bu canlara hökm edəni kim idügin bildüm, əxi.

**187**

Əzəlidən varıdı canumda bu eşq odı,
Əşkər etmədüm kimsənəyə, bildüm ki, ol dost qodı.

Dört kitabı oquyan bulmadı eşqə çarə,
Nə bəglər, nə sultanlar, nə müdərris, nə qazı.

Yer-nög oynar, ırılmaz, yellər əsər, dəprənməz,
Aqibət şol canun ki, eşqün ola bünyadı.

Eşq anadan toğmadı, kimsəyə qul olmadı,
Hökminə qıldı əsir cümlə bilişü yadı.

Eşqə məcnun olanlar assı ziyandan fariğ,
Qorqmaz issi-sovuqdan, bəs nə bilisər odı?!

Əzəldə bənüm fikrüm "ənəl-həqq" idi zikrüm,
Hənuz dəxi toğmadın ol Mənsuri-Bağdadi.

Eşq çənginə düşənün məlamət olur canı,
Anun içün bədnamdur Miskin Yunusun adı.

**188**

Eşidün, ey yarənlər, evə dərvişlər gəldi,
Can şükranə verəlüm, evə dərvişlər gəldi.

Hər kim gördi yüzini, endürür kəndözüni,
Elmi-batindən ötər, evə dərvişlər gəldi.



Dərvişlər uçar quşlar, dəniz kənarın qışlar,
Zehi dövlətlü başlar, evə dərvişlər gəldi.

Dərvişlər yüzi sulu, görənlər olur dəlü,
Batini ərşdən ulu evə dərvişlər gəldi.

Seydi Balum elindən, şəkər tamar dilindən,
Dost bağçası yolından evə dərvişlər gəldi.

Yunus qulun ögürsüz, kimsəsi yoq, yalunuz,
Fəda olsun canunuz, evə dərvişlər gəldi.

**189**

Dinün, imanun varısa xor görməgil dərvişləri,
Cümlə aləm müştaqdurur görməkligə dərvişləri.

Ayü günəş müştaqdurur dərvişlərün söhbətinə,
Fəriştələr təsbihində zikr edələr dərvişləri.

Tərsalar tapuya gəlür, hökm isləri zəbun olur,
Tağlar-taşlar səcdə qılur göricəgəz dərvişləri.

Ol aləm fəxri Mustafa sidqi bütün kani-vəfa,
Andan istər isən vəfa, sən xoş dutğıl dərvişləri.

İncidəsin ah edələr, ömrün kökin qurıdalar,
Gözsüz olasın yidələr ta biləsin dərvişləri.

Yer-göğ aydur xirqə həqqi, himmətləri olsun baqi,
Ol padişa(h) oldı saqi, əsriddilər dərvişləri.

Gögdən enən dört kitabı gündə bin gəz oqur isən,
Vallah, didar görməyəsin sevməz isən dərvişləri.

Yunus aydur, bu eşq gəldi, ölmiş canum diri qıldı,
Sən bən demək bəndən qaldı göricəgəz dərvişləri.

## 190

Mənzili ıraq bu yolun, bu yola kim varası?
Müşküli çoq bu yolun, bunı kim başarası?

Bu yola yaraq gərək, çoq əksük gərək gərək,
Key dəmür yürək gərək bu sarb yola varası.

İncə sirat köprüsi sifət imiş bu yolda,
Dosta gedən kişinün toğrulıqdur çarəsi.

Kimdə kim toğrulıq var, Həqq Çələb anı sevər,
İki cəhana yarar ol ərün sərmayəsi.

Toğrılıq məncəniği istiğfar taşıyilə,
Toğrı vardı, atıldı, yıqıldı nəfs qəl'əsi.

İman aldağucları, bilün, çoqdur bu yolda,
Nəfsinə uyanlarun getməz yüzi qarası.

Yüz bin rica çərisi, bilün, çoqdur bu yolda,
Nəfs öldürmiş ər gərək ol çəriyi qırası.

Yunus, imdi səladur, gəl gedəlüm yoqluğa,
Gözlərün layiq isə dost didarın görəsi.

## 191

Neçə bir bəsləyəsin bu qədd ilə qaməti,
Düşdün dünya zövqinə, unutdun qiyaməti.

Düriş qazan, ye, yedür, bir könül ələ gətür,
Yüz Kə'bədən yegrəkdür bir könül ziyarəti.

Uslu dəgül, dəlüdür yücə saraylar yapan,
Aqibət viran olur cümlənün imarəti.



Kəramətüm var deyən, xəlqə saluslıq satan,
Nəfsin müsülman etsün var isə kəraməti.

Yüz bin peyğəmbər gələ, hiç şəfaət olmaya,
Vay əgər olmaz isə Allahun inayəti.

Həfsin müsülman edən Həqq yolın toğru varur,
Yarın ana olısar Mühəmməd şəfaəti.

Yunus, imdi sən dəxi gerçəklərdən olı gör,
Gerçək ərənlər imiş cümlənün ziyarəti.

## 192

Eşqün odı düşdi cana, əritdi yürək yağını,
Kəsdi həvasətün kökin, oda yandurdı bağını.

Qazdı qəhr qazmasilə canda cəfa ocağını,
Çaldı nəfsümün (boynuna) himmət əri bıçağını.

Rəhmət suyıyilə yudı könlüm evin ap-arıca,
Xidmət qapusından ana sundı şükür ayağını.

Kim bizə taş atar isə, güllər nisar olsun ana,
Çırağuma qəsd edənün Həqq yandırsun çırağını.

Miskin könlün eşq əlindən iki büküldi vücudı,
Tövbə qapusından sundum ana iman tayağını.

Gəl imdi, ey Miskin Yunus, həvasəti əldən bıraq,
Çələbüm, ruzi eylə bizə qənaət(ün) bucağını.

## 193

Ərənlər bir dənizdür, aşiq gərək talası,
Bəhri gərək dənizdən girüb göhər alası.

Genə biz bəhri olduq, dənizdən göhər alduq,
Sərraf gərək göhərün qiymətini biləsi.

Yüri var, əbsəm ola, (nə) simsarlıq satarsın,
Əli kibi ər gərək işbu sirrə irəsi.

Mühəmməd Həqqi bildi, Həqqi kəndüdə gördi,
Cümlə yerdə Həqq hazır, göz gərəkdür görəsi.

Bilə rizqini Həqdən, "nəhnu qəsəmna" pünhan,
Nəfsin bilmiş ər gərək göz hicabın siləsi.

Dedüm işbu nəfəsi aşiqlər hökmi ilə,
Könüllərdə yazılur bu kitabun surəsi.

Yüri, hey sufi zərraq, nə saluslıq satarsın,
Həqdən artuq kim ola qula dilək verəsi?!

Həqq turağı könüldə, ayatı var Qur'anda,
Ərşdən yuqaru canda eşq bürcinün qülləsi.

Şöylə dəlü olmışam, bilməzün dündən güni,
Yürəgümdə işlədi eşq oqınun yarəsi.

Gəl imdi, Miskin Yunus, tut ərənlər ətəgin,
Cümləsi miskinlikdə yoqluq imiş çarəsi.

**194**

Eşqün aldı bəndən bəni, bana səni gərək, səni,
Bən yanaram düni güni, bana səni gərək, səni.

Nə varlığa sevinürəm, nə yoqluğa yerinürəm,
Eşqün ilə avunuram, bana səni gərək, səni.

Eşqün aşiqlər öldürür, eşq dənizinə taldurur,
Təcəlliyilə toldurur, bana səni gərək, səni.

Eşqün şərabından içəm, məcnun olub tağa düşəm,
Sənsin dünü gün əndişəm, bana səni gərək, səni.



Sufilərə söhbət gərək, əxilərə axrət gərək,
Məcnunlara Leyli gərək, bana səni gərək, səni.

Əgər bəni öldürələr, külüm gögə savuralar,
Toprağum anda çağura, bana səni gərək, səni.

Yunusdurur bənüm adum, gün gəldikcə artar odum,
İki cəhanda məqsudum – bana səni gərək, səni.

**195**

Dilsüzlər xəbərini qulaqsuz dinləyəsi,
Dilsüz-qulaqsuz sözin can gərək anlayası.

Dinləmədin anladuq, anlamadın eylədük,
Gerçək ərün bu yolda yoqluqdur sərmayəsi.

Biz sevdük aşiq olduq, sevüldük mə'şuq olduq,
Hər dəm yeni dirlikdə, sizdən kim usanası?!

Yetmiş iki dilcədi, araya sınur düşdi,
Ol baqışı biz baqduq, yermədük amü xası.

Miskin Yunus, ol vəli yerdə, gögdə toptolı,
Hər bir taş altda gizlü bin İmran oğlı Musi.

**196**

Nəsihət qəndilindən bir işarət göründi,
Tənüm içində canum andan yana süründi.

Nəfsümün əjdərhası döndi bana həml etdi,
Qənaət hay deməzsə yerü gögi yer imdi.

Qənaəti yar edin, uyma nəfs diləginə,
İrəsin həqiqətə, yerün buldun, tur imdi.

Qənaət dedügini əgər sən dutmaz isən,
Nəfsünə uyar isən, sərgərdan ol yor imdi.

Yunus Həqq *təcəllisin* şe'r *dilindən* söylər,
Canda göhər var isə Həqdən yana yür imdi.

**197**

Padişəhlər padişahı ol ğəni,
Əmr ilə verib idi bizə canı.

Odu su vü toprağı, (yeli) bilə,
Anun ilə bünyad eylədi təni.

Yaratdı yetmiş iki dürlü dili,
Arada üstün qodı müsülmanı.

Biz müsülman Mühəmməd ümmətinə,
Xəl'ət verdün bizə dinü imanı.

Can nurdandur, nura qarışısar
Eyb eyləmə surət olursa fani.

Zəkəriyyə ağaca sığınmağın,
Bıçğuyilə iki dəldürdün anı.

Əyyubun qurda yedürdün tənini,
Səbr ilə buldı ol dəxi dərmanı.

Yə'qubı ağladub aldun gözlərin,
Yusifi Misrün sən etdün sultanı.

Qamuya söz söylədür ibrət içün,
Yunusı da söylədür ol Sübhanı.



**198**

Bu nə güləcək yerdür, ağlasana (key) qatı,
Düşdün dünya zövqinə, unutdun axirəti.

Malı-mülki qoyuban qanda gedərsin, miskin?
Anca yatasın sində görincə qiyaməti.

İki fəriştə enə, gələ qarşuna tura,
Günahlarunı yaza, sala boynuna biti.

Günahlarun tartalar, andan sirata iltələr,
Zəbanilər dutalar, fəğanlar ola qatı.

Ata oğuldan bezə, baqmaya ana qıza,
Şol gün gəlisər başa, unutma ərəsatı.

Miskin Yunus, sən dəxi gerçəklərdən olı gör,
Ərənlər peş' edinmiş səbr ilə qənaəti.

**199**

Ömrüm, bəni sən aldadun, ah, nedəyin, ömrüm, səni,
Bəni *dəprəniməz qodın*, ah, nedəyin, ömrüm, səni?!

Bənüm varum həp sən idün, canum içində can idün,
Həm sən bana sultan idün, ah, nedəyin, ömrüm, səni?!

Könlüm sana əglər idüm, gül deyübən yiylər idüm,
Ğəribsəyüb ağlar idüm, ah, nedəyin, ömrüm, səni?!

Gedər imiş bunda gələn, dünya işi cümlə yalan,
Ağlar ömrin yavı qılan, ah, nedəyin, ömrüm, səni?!

Xeyrüm-şərüm yazılısar, ömrüm ipi üzülisər,
Gedüb surət bozulısar, ah, nedəyin, ömrüm, səni?!

Bari qapuban qaçmasan, köçkünci kibi köçməsən,
Ölüm şərabın içməsən, ah, nedəyin, ömrüm, səni?!

Bir gün ola sənsüz qalam, qurda-quşa ögün olam,
Çüriyübən topraq olam, ah, nedəyin, ömrüm, səni?!

Miskin Yunus, bilməzmisin, yoqsa nəzər qılmazmısın,
Ölənləri anmazmısın, ah, nedəyin, ömrüm, səni?!

### 200

Kimə könül verür isəm bənüm ilə yar olmadı,
Halum bilüb, dərdüm sorub, bana vəfadar olmadı.

(Həqdən) məgər təqdir idi, aşiq oldı könlüm sana,
Hiç kimsələr bənciləyin eşqə giriftar olmadı.

Eşqdən şikayətüm yoqdur, kəndü tale'ümdəndürür,
Kəndü yolın aramayan adəm dəgül, ər olmadı.

Eşq bir ulu xəl'ətdürür, bir neçəyə verür Çələb,
Bir neçələr qaldı məhrum, eşqdən xəbərdar olmadı.

Eşq bir ulu nəzərdürür, aşiq canlar ərənlərdür,
Eşqə düşməyən könüllər virandurur, şər olmadı.

İbrahimə Nəmrud odın eşqdür gülüstan eyləyən,
Eşqdən nəzər olıcegəz gülzar oldı, nar olmadı.

Həqq yaratdı yeri-gögi ol Əhmədün dostlığına,
"Lövlak" ana dəlil oldı, ansuz yer-göğ var olmadı.

Eşqdə qəhrlər çoq olur, aşiqlərə ğeyrət gərək,
Yunus, aşiq oldun isə, aşiqlərdə ar olmadı.



### 201

Müsülmanlar, zəmanə yatlu oldı,
Həlal yenməz, haram qiymətlü oldı.

Oquyan Qur'ana qulaq tutulmaz,
Şeytanlar səmirdi qüvvətlü oldı.

Həramiylə xəmr tutdı cəhanı,
Fəsad işlər edən hörmətlü oldı.

Kimə kim Tanrıdan xəbər verürsən,
Qaqır başın salar, höccətlü oldı.

Şagird ustad ilə ərbedə qılur,
Oğul ata ilə izzətlü oldı.

Fəqirlər miskinlikdən çəkdi əlin,
Könüllər yıquban heybətlü oldı.

Peyğəmbər yerinə keçən xocalar,
Bu xəlqün başına zəhmətlü oldı.

Dutulmaz oldı Peyğəmbər hədisi,
Xəlaiq cümlə Həqdən utlu oldı.

Yunus, gəl aşiq isən tövbə eylə,
Nəsuhə tövbə övci qutlu oldı.

### 202

Gəldi keçdi ömrüm bənüm şol yel əsüb keçmiş kibi,
Hələ bana şöylə (gəldi) şol göz açub yummış kibi.

İşbu sözə Həqq tanuqdur, bu can gövdəyə qonuqdur,
Bir gün (ola) çıqa gedə qəfəsdən uçmış quş kibi.

Miskin Adəm oğlanını bənzətmişlər əkinciyə,
Kimi bitər, kimi yitər yerə toxum saçmış kibi.

Bu dünyədə bir nəsnəyə yanar içüm, göynər özüm,
Yigid ikən ölənlərə gög əkini biçmiş kibi.

Bir xəstəyə vardun isə, bir içim (su) verdün isə,
Yarın anda qarşu gələ Həqq şərabın içmiş kibi.

Bir miskini gördün isə, bir əskicə verdün isə,
Yarın anda sana gələ Həqq könlegin geymiş kibi.

Yunus Əmrə, bu dünyada iki kişi qalur derlər,
Məgər Xızr İlyas ola abi-həyat içmiş kibi.

**203**

**Minacat**

Ya ilahi, gər sual etsən bana,
Budurur cəvabum anda uş sana.

Bən bana zülm eylədüm, etdüm günah,
Neylədüm, netdüm sana, ey padişah?

Gəlmədin dedün haqumə kəm deyü,
Toğmadın dedün "əsa Adəm" deyü.

Sən əzəldə bəni asi yazasın,
Toldurasın aləmə avazəsin.

Bənmi düzdüm bəni, sən düzdün bəni,
Pür eyb, neşə gətürdün, ey qəni?

Gözüm açub gördügüm zindan içi,
Nəfsü həva pür tolu şeytan içi.



Həbs içində ölməyəyin deyü ac,
Mismilü murdar yedüm bir-iki qaç.

Nəsnə əksüdimi mülkündən sənün,
Keçdimi hökmüm (ya) hökmündən sənün?

Rizqimi yeyüb səni acmı qodum,
Ya yeyüb öynüni möhtacmı qodum?

Qıl kibi köpri gərərsin keç deyü,
Gəl səni sən tuzağumdan seç deyü.

Qıl kibi köpridən adəmmi keçər?!
Ya düşər, ya tayanur, yaxud uçar.

Qullarun köpri yaparlar xeyr içün,
Xeyri budur kim, keçərlər seyr içün.

Ta gərək bünyadı möhkəm ola ol,
Ol keçənlər aydalar uş toğrı yol.

Tərzi qurarsın həvasət dartmağa,
Qəsd edərsin bəni oda atmağa.

Tərəzi ana gərək baqqal ola,
Ya bəzirgan tacirü əttar ola.

Çün günah murdarların murdarıdur,
Həzrətündən yaramazlar karıdur.

Sən gərək lütf ilə anı örtəsin,
Bəs nə hacət murdar' açub dartasın?!

Sən təmaşa qılasın, bən xoş yanam,
Haşalillah səndən, ey Rəbbül-ənam.

Sən basirsin, xud bilürsin halımı,
Pəs nə hacət dartasın ə'malımı.

Keçmədimi intiqamun öldürüb,
Çüridüb gözümə topraq toldurub?

Dəgmədi hiç Yunusdan sana ziyan,
Sən bilürsin aşikara vü nihan.

Bir avuç toprağa bunca qiylü qal
Nəyə gərək, ey Kərimi-zülcəlal?!

Ey Kərimi-ləmyəzəl, ey padşahi-layəzal,
Səltənət külli sənündür kim, sana yoqdur zəval.

İmamül müttəqin oldur, xitamül-mürsəlin ol şah,
Nizamül-aləmin oldur, hüma(m)ül əkməlin ol şah.



## FATEH NÜSXƏSİNDƏ OLMAYAN ŞEİRLƏR

### 204

Əcəb-əcəb nə nəsnədür bu dərd ilə fəraq bana,
Canumı sərxoş eylədi, eşq ağusı tiryək bana.

Kimün kim rənci var isə dərdinə dərman istəsün,
Kəsdi bənüm bu rəncümi, dərman oldı bu dərd bana.

Eşq odına yan der isən, könüllərə gir der isən,
Qarangular aydın ola, nə qəndilü çıraq bana.

Gögdən enən dört kitabı gündə bin gəz oqur isən,
Ərənlərə münkir isən didar ıraq səndən yana.

Miskin Yunus, ərənlərə təkəbbür olma, topraq ol,
Topraqdan bitər küllisi, gülüstandur topraq bana.

### 205

Ol kişinün yoqdur yeri, işbu cəhan heyran ana,
Deməsün kim, bən şadıyam, ya şadılıq qandan ana?!

Şəddad yapdı uçmağını, girmədin aldı canını,
Bir dəm aman verdürmədi yed' iqlimi dutan ana.

Deməsün kim, müsülmanam, Çələb əmrinə fərmanam,
Dutmaz isə Həqq sözini, faidə yoq dindən ana.

Ayıtmasun, çün gün toğar ətüm, tənüm üşütməyə,
Çün vücudın dəlük dəgül, şö'lə irməz gündən ana.

Ər tonını geyübəni toğru yola gəlməz isə
Çıqarsun ol tonın, yoqsa nöqsan irər tondan ana.

Ol kişi kim sağırdurur, söyləmə Həqq sözün ana,
Gər der isən zaye' olur, nəsib yoqdur sözdən ana.

Ol kişi kim yol əridür, ğərib könüllər yarıdur,
Bir söz deyəm, tutar isə yegdür şəkər-baldan ana.

Yunus sənün qulındurur, bəllü biləsin sən anı,
Qo söyləyənlər söyləsün, nə yapışur dildən ana?!.

**206**

Bənəm ol eşq bəhrisi, dənizlər heyran bana,
Dərya bənüm qətrəmdür, zərrələr ümman bana.

Qaf tağı zərrəm dəgül, ayü günəş bana qul,
Həqdür əslüm, şəkk dəgül, mürşiddür Qur'an bana.

Çün dosta gedər yolum, mülki-əzəldür elüm,
Eşqdən söylər bu dilüm, eşq oldı seyran bana.

Yoğikən ol barigah var idi ol padişah,
Ah bu eşq əlindən, ah, dərd oldı dərman bana.

Adəm yaradılmadın, can qalıba girmədin,
Şeytan lə'nət olmadın ərş idi seyran bana.

Yaradıldı Mustafa, yüzi nur, könli səfa,
Ol qıldı Həqqə vəfa, andandur ehsan bana.

Şəriət əhli ıraq, irəməz bu mənzilə,
Bən quş dilin bilürəm, söylər Süleyman bana.

Yunus, bu xəlq içində əksiklidür, Həqq bilür,
Divanə olmış çağrur, dərvişlik böhtan bana.



**207**

Nə bilsün bu eşqi usanlar uyalar,
Nə varsun bu yola azıqsuz yayalar.

Gəlün biz varalum Yusifi görəlüm,
Ki yüzi nurından bin aclar toyalar.

Xərabətilərdən göründi çün kim eşq,
Nedərlər bu arı, bu rəngi yuyalar?!

Mələklər tağında, sadiqlər bağında,
Əcəlsüz nə gün var, ömürlər sayalar.

Biz bizi qoyalum, anlar biz olalum,
Birligi tuyanlar ikilik qoyalar.

Yunus, sən bir olğıl, könüldə sirr olğıl,
Ki dərviş olanlar bu sirdən tuyalar.

**208**

Bu dünyayə könül verən son ucı peşman olısar,
Dünya bənüm dedükləri həp ana düşman olısar.

Ey dostını düşmən dutan, ğeybət, yalan söz söyləmə,
Bunda ğammazlıq eyləyən anda yeri dar olısar.

Çünki olısar yeri dar, qazanclu qazancı qədər,
Mö'minlərə gəldi xəbər, aşiqlər didar görisər.

Məqsudımuz didar idi, şeyxümüz gerçək ər idi,
Əvvəl dəxi ol var idi, axır dəxi var olısar.

Əvvəl, axır oldur əbəd, həm dillərdə "kufuvən əhəd",
Övliya keçdi bir saət, ya dünya kimə qalısar?!.

Alun övliya əlüni, toğrı varun Həqq yolunı,
Mə'ni budur bəllü bəyan, bildüm deyən bilməyisər.

Yunus, imdi bildüm demə, miskinlügi əldən qoma,
Kimdə miskinlik var isə, Həqq didarın ol görisər.

**209**

Tənqri içün canum canı cəfayisə tapdur yetər,
Sənün fəraqundan betər əzab dəxi varmı betər?!

Eşqün odı yürəgümdə yanduğına aləm tanuq,
Qanda bir od yanar isə, nişanı var – dütün dütər.

Eşqün çəri saldı bənüm könlüm evi iqliminə,
Canumı əsir eylədün, nedər bana yağı tatar?!

Əcəl salam iqlimlərə, vəsyət qılam aşiqlərə,
Mə'şuqədən deyəm saqın, oynar aşiq könlün atar.

Əcəb bu bənüm dərdümə nə içün dərman bulınmaz?
Kim bulısar dərman ana, kişiyi kim bəri dutar?

Rəsmidürür sultanlarun – qullar günah eyləyicək,
Ya ədəblər ol qulını, ya məzada verür satar.

Yunus, şikayət eyləmə yardan cəfa gördüm deyü,
Cümlə aşiqlər hacəti mə'şuqi qatında bitər.

**210**

Həqq bir könül verdi bana, hə demədin heyran olur,
Bir dəm gəlür şadi olur, bir dəm gəlür giryan olur.

Bir dəm sanasın qış kibi, şol zəmhəri olmış kibi,
Bir dəm bəşarətdən toğar, xoş bağıla bustan olur.



Bir dəm gəlür söyləyəməz, bir sözi şərh eyləyəməz,
Bir dəm dilindən dürr dökər, dərtlülərə dərman olur.

Bir dəm çıqar ərş üzərə, bir dəm enər təhtüssəra,
Bir dəm sanasun qətrədür, bir dəm taşar ümman olur.

Bir dəm cəhalətdə qalur, hiç nəsnəyi bilməz olur,
Bir dəm talar hikmətlərə, Calenusü Loğman olur.

Bir dəm div olur ya pəri, viranələr olur yeri,
Bir dəm uçar Bilqeys ilə sultani-insü can olur.

Bir dəm varur məscidlərə, yüz sürər anda yerlərə,
Bir dəm varur deyrə girər, İncil oqur röhban olur.

Bir dəm gəlür İsa kibi ölmişləri diri qılur,
Bir dəm girər kibr evinə Fir'ovn ilə Haman olur.

Bir dəm dönər Cəbrayilə, rəhmət saçar hər məhfilə,
Bir dəm gəlür gümrah olur, Miskin Yunus heyran olur.

**211**

Bir dəm yüzüm sürə duram, hər dəm ayum yeni toğar,
Hər dəm bayramdurur bana, yayum – qışum yeni bahar.

Bənüm ayum ışığına bulutlar kölgə qılmaya,
Xoş gedilməz doluluğı, nurı yerdən gögə ağar.

Anun nurı qaranğuyı sürər könül hücrəsindən,
Bəs qaranğulıq nurilə bir hücrəyə netə sığar?!

Bən ayumı yerdə gördüm, nə istərəm göğ yüzində?
Bənüm yüzüm yerdə gərək, bana rəhmət yerdən yağar.

Sözüm ay, gün içün dəgül, sevənlərə bir söz yetər,
Sevdügüm söyləməz isəm sevmək dərdi bəni boğar.

Nola Yunus sevdiyisə, çoqdur Həqqi sevicilər,
Sevənləri gördiyidi, anun içün boynın əgər.

## 212

Yar yürəgüm, yar gör ki, nələr var,
Bu xəlq içində bizə gülər var.

Qo gülən gülsün, Həqq bizüm olsun,
Ğafil nə bilür Həqqi sevər var.

Bu yol uzaqdur, mənzili çoqdur,
Keçidi yoqdur, dərin sular var.

Girdük bu yola eşqilə bilə,
Ğürbətlik elə bizi salar var.

Hər kim mərdanə, gəlsün meydanə,
Qalmasun cana, kimdə hünər var.

Yunus, sən bunda meydan istəmə,
Meydan içində mərdanələr var.

## 213

Dost, sənün eşqün oqı key qatı taşdan keçər,
Eşqünə düşən kişi can ilə başdan keçər.

Dünü – güni zar olur, eşqün ilə yar olur,
Əndişəsi sən olan cümlə təşvişdən keçər.

Eşqünə düşənlərin yürəgi yanar olur,
Kəndüyi sana verən dügəli eşdən keçər.

Dünyanun məhəbbəti ağulı aşa bənzər,
Axırın sanan kişi ağulı aşdan keçər.

Başında əqli olan axrətə əməl etməz,
Hurilərə aldanmaz, göz ilə qaşdan keçər.

Gerçək aşiq ol ola can verməgə ol evə,
Dost ilə bazar içün necə bin başdan keçər.



Ariflərə bu dünya xəyalü düş kibidür,
Kəndüyi sana verən xəyalü düşdən keçər.

Yunusun könli gözi toludur Həqq sevgüsi,
Söhbət ixtiyar edən yadü bilişdən keçər.

## 214

Eşq ilə gələn ərənlər içər ağuyı nuş edər,
Topuğa çıqmayan çaylar dəniz ilə savaş edər.

Biz bu yoldan üşənmədük, ərənlərdən usanmaduq,
Kimsəyi yavuz sanmaduq, hər nə edər qolmaş edər.

Qolmaşa verdük sözini, söz ilə dögdük yüzini,
Yaban canavarı kibi bilənlər andan şəş edər.

Bu söhbətə gəlməyənlər, Həqq nəfəsi almayanlar,
Sürün anı bundan getsün, turur isə çoq iş edər.

Cahildür, mə'nidən almaz, oturur qərarı gəlməz,
Öləcəgini hiç sanmaz, yüz bin yıllıq təşviş edər.

Tağ nə qədər yüksək isə yol anun üstindən aşar,
Yunus Əmrəm yolsuzlara yol göstərür vü xoş edər.

## 215

Dürlü-dürlü cəfanun adını eşq vermişlər,
Bu cəfaya qatlanan dosta xəlvət irmişlər.

Eşqdürür dürlü bəla, döndürür haldan hala,
Dost əlindən piyalə key məlamət olmışlar.

Kimə kim eşq ulaşa, hər dəm qaynaya taşa,
Eyü, dirlik həm yavuz dört yanında turmışlar.

Hər kim eşq əri isə, eşqə müştəriyisə,
Eşq anun yarı isə canına od urmışlar.

Miskin Yunusun canı başında sərəncamı,
Eşqə münkir adəmi bu meydandan sürmişlər.

### 216

Bu dünyanun məsəli bir ulu şərə bənzər,
Vəli bizüm ömrümüz bir tezbazara bənzər.

Hər kim bu şərə gəldi, bir ləhzə qərar qıldı,
Gerü dönüb getməgi gəlməz səfərə bənzər.

Bu şərün əvvəl dadı şəhdü şəkərdən şirin,
Axır acısını gör, şol zəhrimara bənzər.

Əvvəl könül almağı xublara nisbət edər,
Axır yüz döndərməgi əcuz məkkara bənzər.

Bu şərün xəyalları, dürlü-dürlü halları,
Aldamış ğafilləri, cadu əyyara bənzər.

Bu şərdə xəyallarun həddi vü şüməri yoq,
Bu xəyalə aldanan otlar davara bənzər.

Bu şərin sultanı var, cümləyə ehsanı var,
Sultan ilə bilişən yoğ ikən vara bənzər.

Kəndü miqdarın bilən bildi kəndü halini,
Vəli dəxi eşq ilə əvvəl bahara bənzər.

Biçarə Yunusı gör, dərd ilə heyran olmış,
Anun hər bir nəfəsi şəhdü şəkərə bənzər.



### 217

Eşidün, ey yarənlər, eşq bir günəşə bənzər,
Eşqi olmayan könül misali taşa bənzər.

Taş könüldə nə bitər, dilində ağu dütər,
Necə yumşaq söyləsə, sözi savaşa bənzər.

Eşqi var könül yanar, yumşanur muma dönər,
Taş könüllər qararmış, sarb qatı qışa bənzər.

Ol sultan qapusında, ol həzrəti tapusında,
Aşiqlərün yılduzı hər dəm çavuşa bənzər.

Keç, Yunus, əndişədən, gərəksə bu bişədən,
Ərə eşq gərək öndin, andan dərvişə bənzər.

### 218

Bilürmisiz, ey yarənlər, gerçək ərənlər qandadur?
Qanda baqsam anda hazır, qanda istəsəm andadur.

Eşqsüzlərə bənüm sözüm bənzər qaya yanqusına,
Bir zərrə eşqi olmayan, bəllü bilün, yabandadur.

Yalancılıq eyləməgil, eşqə yalan söyləməgil,
Bunda yalan söyləyənün anda yeri zindandadur.

Ey kəndözini bilməyən, söz mə'nisini bulmayan,
Həqq varlığın istər isən, uş elm ilə Qur'andadur.

Allah bənüm dedügünə vermiş, verür eşq varlığın,
Kimdə ki var bir zərrə eşq, Çələb varlığı andadur.

Necələr aydur Yunusa, qocaldun sən, eşqi qoğıl,
Eşq bizə yenilə gəldi, hənuz dəxi turvandadur.

## 219

Övliyaya, münkirlər Həqq yolına asidür,
Ol yola asi olan könüllərün pasıdur.

Tartduq bu eşq cəfasın ta irincə mə'şuqa,
Zira ki ol dost bənüm dərdimün dəvasıdur.

Hənuz bu yer olmadın, göglər yaradılmadın
Övliyalar vətəni padişah qəl'əsidür.

Mövlana Xudavəndgar bizə nəzər qılalı,
Anun görklü nəzəri könlümüz aynasıdur.

Geyiklünün ol Həsən söz ayıtmış kəndüdən,
Qüdrət dilidür söylər, kəndünin söz nəsidür?!

Miskin ol, brə, miskin, gedə səndən kibrü kin,
Ruzgar gəlür keçər bəs, kimə nə qalasıdur?!

Oquyuban yazmadın, yanıluban azmadın,
Yunus, bu eşq sözini kim bildi, biləsidür?!

## 220

Miskin adəm oğlanı nəfsə zəbun olmışdur,
Heyvan, canavar kibi otlamağa qalmışdur.

Hərgiz ölümin sanmaz, öləsi günin anmaz,
Bu dünyadan usanmaz, ğəflət ögin almışdur.

Oğlanlar ögüt almaz, yigidlər tövbə qılmaz,
Qocalar taət qılmaz, sarp ruzgar olmışdur.

Bəglər azdı yolından, bilməz yoqsul halindən,
Çıqdı rəhmət gölindən, nəfs gölinə talmışdur.

Yunus sözi alimdən, zinhar, olman zalimdən,
Qorqa durın ölümdən, cümlə doğan ölmişdür.



## 221

Ey dost, sənün eşqün odı cigərüm parə baş qılur,
Eşqündən yanar yürəgüm, yanduğum bana xoş gəlür.

Eşqün odına yandığum, ağlamaq oldı güldigüm,
Dost, sana zari qıldığum münkirlərə savaş gəlür.

Söylər isəm sözüm savaş, söyləməzsəm cigərüm baş,
Cəhan toludurur qəllaş, hər birindən bir taş gəlür.

Gör necə taşlar atılur, dost içün başlar tutılur,
Gəlür könülə batılur, halimüzə haldaş gəlür.

Bizüm halümüzdən bilən, kimdür eşqə münkir olan?
Bizüm sevdügümüz Həqdür, bu xəlqə göz ü qaş gəlür.

Necə-necə səlatinlər zəbun olur eşq əlində,
Hər kim bu yola düşərsə, ol bu yola yavaş gəlür.

Ərənlər buna qalmadı, vardı yoluna, turmadı,
Həqqi gerçək sevənlərə cümlə aləm qardaş gəlür.

Miskin Yunus, bil sözüni, dosta açub şol gözüni,
Qanğı bürcdən baqar isən ol sultana günəş gəlür.

## 222

Yer yüzində gəzər idüm, uğradum mülkətlər yatur,
Kimi ulı, kimi kiçi, key quşağı bərklər yatur.

Kimi yigid, kimi qoca, kimi vəzir, kimi xoca,
Gündüzləri olmış gecə, ancılayın çoqlar yatur.

Toğrı varurdı yolları, qələm tutardı əlləri,
Bülbülə bənzər dilləri, danişman yigidlər yatur.

Ulu-kiçi ağlaşmışlar, sərvər yigidlər düşmişlər,
Baş ucında yay sınışlar, quruluban oqlar yatur.

Atlarınun izi tozılu, önləri təbilbazılu,
Elə-günə hökmi yazılu şu möhtəşəm bəglər yatur.

Gecə-gündüz oğlancuqlar söylər ikən bülbül kibi,
Ayrılmışlar, anaları sinlərini bəklər yatur.

Əlləridür xınalu həb, qaravaşları şəkərləb,
Qarğu kibi uzun boylu, gül yüzlü xatunlar yatur.

Əl bağlamışdur qamusı, Həqq Çələbdəndür umusı,
Bakirə qızdur kimisi, alınmaduq çoqlar yatur.

Yunus bilməz kəndü halin, Çələbdür söylədür dilin,
Bir necəsi yeni gəlin, ağ, dəgirmi yüzlər yatur.

**223**

Sabahın sinliyə vardum, gördüm cümlə ölmiş yatur,
Hər biri biçarə olmış, ömrin yavı qılmış yatur.

Vardum bunlarun qatına, baqdum əcəl heybətinə,
Necə yigid muradına irməyübən ölmiş yatur.

Yemiş qurd-quş bunı, gələr neçələrin bağrın dələr,
Şol ufacıq növrəstələr gül kibicə solmış yatur.

Duzağa düşmiş tənləri, Həqqə ulaşmış canları,
Görməzmisin sən bunları, növbət bizə gəlmiş, yatur.

Əsilmiş inci dişləri, dökilmiş sarı saçları,
Qamu bitmiş təşvişləri, əmrü nəmdə irmiş yatur.

Getmiş gözinün qarası, hiç işi yoqdur turası,
Kəfən bezinün parası süngügə sarılmış yatur.

Yunus, gerçək aşiq isən, mülkə surət bəzəməgil,
Mülkə surət bəzəyənlər qara topraq olmış yatur.



**224**

Elm elm bilməgdür, elm kəndin bilməgdür,
Sən kəndüni bilməzsin, ya necə oqumaqdur?!

Oqumaqdan mə'ni nə, kişi Həqqi bilməkdür,
Çün oqıdun bilməzsün, ha bir qurı əməkdür.

Oqıdum bildüm demə, çoq taət qıldum demə,
Əri Həqq bilməz isən, əbəs yerə yelməkdür.

Dört kitabun mə'nisi bəllüdür bir əlifdə,
Sən əlif dersün, xoca, mə'nisi nə deməkdür?

Yunus Əmrə der, xoca, gərəksə var bin Həccə,
Həpisindən eyücə bir könülə girməkdür.

**225**

Netə ki bu könlüm evi eşq əlündən taşa gəlür,
Neçə yüksək yürür isəm, eşq başumdan aşa gəlür.

Neçə ki ayduram razum söyləməyəm kimsənəyə,
Gedər bu səbrü qərarum, dost önümə düşə gəlür.

Hey necə səbr eyləyisər dost yüzini görən kişi?!
Ol Həqiqət gördüm deyən kəndözindən şaşa gəlür.

Mə'şuqənün təcəllisi dürlü-dürlü rənglər olur,
Bir şivədə yüz bin könlümuş həmişə cuşa gəlür.

Ol dost ilə bənüm işüm bulud ilə güneşləyin,
Bir dəm hicabı sürilür, bir dəm hicab başa gəlür.

Əcəb genə Miskin Yunus eşqdən artuq sevdi məgər,
Zira ki bu eşqdən yegrək hiç yoqdurur başa gəlür.

## 226

Ey padişah, ey padişah, hər dəm işin düzədürür,
Dünya anun bustanıdur, sevdügini üzədürür.

Yavuzlıq eyləmə saqın, əcəl sana səndən yaqın,
Neçələrün əslin-kökin yurd eyləyüb bozadurur.

Sən anda varursın, anda çoq yarağ eyləgil bunda,
Canlar baqi dəgül təndə, de bir qaç gün gəzədürür.

Sorucı gəlür yer yırtub sorar Tənqrin kimdür deyü,
İşbu canum anı tuyub, süngüklərüm sızadurur.

Ey Tənqriyi bir bilənlər, can Həqqə qurban qılanlar,
Öli dəgüldür bu canlar, eşq gölində yüzədürür.

Bən gördüm ərənlər uçdı, eşq qədəhin tolu içdi,
Həqq qatında nazı keçdi, şöylə yüzi yerə durur.

Ərənlərün qulı isən, ölümün anadur, Yunus,
Neç' ərənlər gəldi keçdi, növbət şimdi bizədürür.

## 227

Sənünlə birligüm səndən ırılmaz,
Həyat sənünlədür, sənsüz dirilməz.

Bənüm münacatum səndən yanadur,
Sana varur yolum sənsüz varılmaz.

Sənsin gözlərüm içrə bilə baqan,
Sən bilə baqmasan yolum görilməz.

Sən ayru, bən səni qanda bulayım?
Sənsüz bu həqq nəfəs ömrüm sürilməz.

Səfər qılsam bana yoldaş olursın,
Qərar etsəm genə sənsüz durılmaz.



Varlığum səndəndür, bən bir alətvən,
Sün' issi sunmasa alət qurılmaz.

Alətü hərəkət cümləsi səndən,
Anunçün işinə kimsə qırılmaz.

Birlikdən ötə hiç şərikün yoq(dur),
Kim nöqsan irgürə hökmün yuyılmaz.

Aləm xəlqi zəbun əmrün içində,
Kimdür ki, qullığa boynı burılmaz.

Bu bənvən dedügüm əgər bən isəm,
Neçün bu bənlügə əlüm urılmaz?

Yarənlər səladur, qapu açıqdur,
Bu qapuya gələn məhrum sürilməz.

Yunus bu tövhidə ğərq oldı qaldı,
Gerü gəlməkligə əqli dirilməz.

## 228

Yarəb, bu nə dərtdür dərman bulınmaz,
Ya bu nə yaradur zəxmi bəlürməz?!

Bənüm ğərib könlüm eşqdən usanmaz,
Varur eşqə düşər, hiç bana dönməz.

Dönər könlüm, bana ögüt verür çoq,
Aşiq olan könül eşqdən usanmaz.

Aşiq ki cana qaldı, aşiq olmaz,
Canın tərk etməyən mə'şuqi bulmaz.

Eşq bazarıdur bu, canlar satılur,
Sataram canumı, hiç kimsə almaz.

Aşiq bir kişidür, bu dünya malın,
Axirət qorqusın bir pula saymaz.

Bu dünya ol axirətdən içərü,
Aşiqün yeri var, kimsənə bilməz.

Aşiq öldi deyü səla verürlər,
Ölən heyvan olur, aşiqlər ölməz.

Bəgüm, aşiq isən var sən yolınca,
Bunda başlar yitər, qanlar sorulmaz.

Ərənlər meydanı ərşdən uludur,
Salarlar çövganı, topı bəlürməz.

Yunus bu tövhidə ğerq oldı getdi,
Gerü gəlməkligə əqli dirilməz.

### 229

Əgər dilüm bəndə isə kimsə bana nəsnə deməz,
Könlüm gər rəvəndə isə aləmdə qərar eyləməz.

Əgər gözüm baqar isə, baqduğına aqar isə,
Gördügin bənüm der isə oda düşər, ar eyləməz.

Əgər əqli başda isə, könül də ol tuşda isə,
İkisi bir işdə isə düşman bana kar eyləməz.

Düşman bənüm nəfsümdürür, təmə' ilə hirsimdürür,
Təmə' ilə hirsə uyan könüllərdə yer eyləməz.

Könüllərdə yer eyləmək Mühəmmədə gəlmişdürür,
Mustafaya ümmət olan tamuda qərar eyləməz.

Oldur bu işləri düzən, cümlə nəqşləri yazan,
Can gövdədən gedicəgiz ya neçün dillər söyləməz?!

Öldürən ol, dirgürən ol, Yunus, imdi Həqq ilə ol,
Həqdən artuq hiç kimsənə yoq nəsnəyi var eyləməz.



### 230

Bən dərvişəm deyən kişi, işbu yola ar gərəkməz,
Dərviş olan kişilərün könli gendür, dar gərəkməz.

Dərviş könülsüz gərəkdür, sögənə dilsüz gərəkdür,
Dögənə əlsüz gərəkdür, xəlqə bərabər gərəkməz.

Xəlqə bənzətməyə eşin, sürə könlindən təşvişin,
Yüz bini birdür dərvişün, arada əğyar gərəkməz.

Əgər dərviş isən, dərviş, cümlə aləm sana biliş,
Füzulluğı xülqə dəgiş, arada əğyar gərəkməz.

Dərviş olan kişilərün miskinlikdür sərmayəsi,
Miskinlikdən özgə bizə malü mülkü şər gərəkməz.

Ər əlüni aldun isə, ərə könül verdün isə,
İqrar ilə gəldün isə bəs ərə inkar gərəkməz.

Yunus, sən gördün bir əri, arturma gördügün biri,
Şudur, budur deyübəni dərviş tarümar gərəkməz.

### 231

Bu bir əcaib haldur, bu hala kimsə irməz,
Alimlər də'vi qılur, vəli dəgmə göz görməz.

Elm ilə, hikmət ilə kimsə irməz bu sirrə,
Bu bir əcaib sirdür, elmə, kitaba sığmaz.

Aləm elmin oquyan, dört məzhəb sirrin tuyan,
Aciz qaldı bu yolda, bu eşqə əl uramaz.

Bu eşqün sirri əcəb bu eşqi qıldı tələb,
Məgər ki verə Çələb anı dəgmə göz görməz.

Anı ol kişi görür, ol əcəlsüzin ölür,
Bu nəsibi ol alur, anlar ki cana qalmaz.

Hər kim qaldı canuna irməyisər xanına,
Vardı düşdi həşrdə, dəxi bir cana qalmaz.

Hədisdür Mustafadan, eşq ilə iqrar dedi,
Bində bir arif bunı baqub oquya bilməz.

Yunus, canunı bərk et, bildüklərini tərk et,
Fəna olmayan surət şahuna vasil olmaz.

**232**

Sufiyəm xəlq içində, təsbih əlümdən getməz,
Dilüm mə'rifət söylər, könlüm hiç qəbul etməz.

Boynumda icazətüm, riya ilə taətüm,
Əndişəm ayruq yerdə, gözüm yolu gözətməz.

Söylərəm mə'rifəti, saluslanuram qatı,
Miskinligə dönməgə könlümdən kibr getməz.

Xoş dərvişəm, səbrüm yoq, dilümdə inkarum çoq,
Qulağumdan girəni hərgiz içüm eşitməz.

Aləm çıraqdur, sədr könlüm bunı gözədür,
Nedəyüm, Həqq qorqusı hərgiz içümdən bitməz.

Görənlər əlüm öpər, tacü xirqəyə baqar,
Şöylə sanurlar bəni, zərrəcə günah etməz.

Taşumda ibadətüm, söhbətüm, xoş taətüm,
İç bazarda gəlicək bin yıllıq əyyar etməz.

Görənlər sufi sanur, səlam verür, utanur,
Anca iş qoyar idüm, əl irübən güc yetməz.



Taşum dərviş, içüm boş, dilüm datlu, sözüm xoş,
İlla etdügüm işi dinin dəgşürən etməz.

Yunus, əksikligüni Allahuna ərz eylə,
Anun kərəmi çoqdur, sən etdügin ol etməz.

**233**

Yenə gəldi eşq elçisi, yenə doldı meydanumuz,
Yenə təfərrücgah oldı sağlı-sollı dört yanumuz.

Yenə məhfillər düzüldi, yenə badyalar quruldı,
Yenə qədəhlər sunuldı, əsrük oldı bu canumuz.

Ev içi eşq ilə toldı, ulu-kiçi aşiq oldı,
Canlarumuz heyran oldı, tağıldı pərişanumuz.

Bir neçəmüz Həqqi aldı, bir neçəmiz Həqdən toldı,
Bir neçə Süleyman oldı eşq təxtinə binənümüz.

Bir neçəmüz Leyli oldı, bir neçəmüz Məcnun oldı,
Bir neçəmüz Fərhad oldı eşqdən xəbər tuyanumuz.

Meydanumuz meydan oldı, canlarumuz heyran oldı,
Hər dəm ərş seyrangah oldı, həzrət oldı rəvanumuz.

Düşmüş idük, ol qaldırdı, birligin bizə bildirdi,
İçimüzə eşq toldurdı, dürüst oldı imanumuz.

Sorar isən eşq qandadur, qanda istərsən andadur,
Həm könüldə, həm candadur, hiç qalmadı gümanumuz.

Yunus eşqün vəsfin söylər, gerçəklərə xəbər eylər,
Məhrumlarun canı göynər, əşkər oldı pünhanumuz.

234

Ğeyridür hər millətdən bu bizüm millətümüz,
Hiç dində bulunmadı dinü diyanətimüz.

Bu dinü diyanətdə, dünyə vü axirətdə,
Yetmiş iki millətdə ayrıdur ayatumuz.

Zahir suya yunmadın, əl-ayaq dəprətmədin,
Baş sücuda varmadın qılınur taətümüz.

Nə Kə'bə vü nə məscid, nə rüku'ü nə sücud,
Həqq ilə daim becid olur münacatumuz.

Gərək Kə'bə var(a)lum, gər məscidə gir(ə)lüm,
Gərək suyla yuyınalum, çün bilə illətümüz.

Su nə qədr arıda, çün yavuz fe'lün bilə,
Məgər bizi pak edə Həqdən inayətümüz.

Kimün sözin kim bilə, əql irməz bu halə,
Yarın anda bəllü ola müsülman, mürtəddümüz.

Yunus, canun yenilə kim dostlığun anıla,
Ansuzın bir ün gələ, biləsin qüdrətimüz.

235

Eşidün, ey yarənlər, qiymətlü nəsnədür eşq,
Dəgmələrə bitiməz, hörmətlü nəsnədür eşq.

Həm cəfadur, həm səfa, Həmzəyi atdı Qafa,
Eşq ilədür Mustafa, dövlətlü nəsnədür eşq.

Tağa düşər kül eylər, könüllərə yol eylər,
Sultanları qul eylər, cür'ətlü nəsnədür eşq.



Kimə kim eşq urdı oq, ğüssəyilə qayğı yoq,
Fəryadilə ahı çoq, firqətlü nəsnədür eşq.

Dənizləri qaynadur, mövcə gəlür oynadur,
Qayaları söylədür, qüvvətlü nəsnədür eşq.

Aqilləri şaşırur, dəryalara düşürür,
Necə cigər bişirür, key odlu nəsnədür eşq.

Miskin Yunus neyləsün, dərdin kimə söyləsün,
Varsun dostı toylasun, ləzzətlü nəsnədür eşq.

236

Mə'ni evinə talduq, vücud seyrini qılduq,
İki cəhan seyrini cümlə vücudda bulduq.

Bu çizginən gögləri, təhtüssəra yerləri,
Yetmiş bin hicabları cümlə vücudda bulduq.

Yedi yer, yedi gögi, tağları, dənizləri,
Uçmağ ilə tamuyı cümlə vücudda bulduq.

Gecə ilə gündüzi, gögdə yedi yılduzı,
Lövhdə yazılı sözi cümlə vücudda bulduq.

Musa ağduğı Turı, yoqsa Beytül-mə'murı,
İsrafil çalan surı cümlə vücudda bulduq.

Tövrat ilə İncili, Fürqan ilə Zəburı,
Bunlardağı bəyanı cümlə vücudda bulduq.

Yunusun sözləri Həqq, cümləmüz dedük səddəq,
Qanda istərsən anda Həqq, cümlə vücudda bulduq.

**237**

Kim dərvişlik istər isə deyəm ana netmək gərək,
Şərbəti əlündən qoyub ağuyı nuş etmək gərək.

Gəlmək gərək tərbiyətə, cümlə bildüklərin qoya,
Mürəbbisi nə der isə, bəs ol anı dutmaq gərək.

Tuta səbrü qənaəti, təhəmmül eyləyə qatı,
Tərk eyləyə surətini, bildügin unutmaq gərək.

Dünyadan könlüni çəkə, əliyilə arpa əkə,
Unına yarı kül qata, günəşdə qurutmaq gərək.

Deyəm ana necə edə nəfsi diləgin bu yolda,
Qaçan kim iftar eyləyə, üç gündə bir ətmək gərək.

Böylədür dərviş dirlügi, qoya cümlə əyyarlığı,
Andan bulısar ərlügi, qəhrlər çoq yutmaq gərək.

Baqma dünya sevüsinə, aldanma xəlq güvüsinə,
Dönüb didar arzusına, ol Həqqə yüz tutmaq gərək.

Yunus, imdi nədür dersin, ya kimün qeydini yersin,
Bir kişi bu sözi desin, ana güci yetmək gərək.

**238**

Nedəlüm bu dünyayı, neyləyüb netmək gərək?
Daima eşq ətegin qomayub dutmaq gərək.

Çələbüm bu dünyayı qəhr içün yaratmış,
Gerçəgin gələnlərün qəhrini yutmaq gərək.

Ol yarınki yollara anda yoldaş istəyən,
Bu dünyada dostını qılavuz dutmaq gərək.



Uçmaq, uçmaq dedigün, qulları yeltədigün,
Uçmağun sərmayəsi bir könül utmaq gərək.

Ərənlərün ahına dağ, taş qatlanamadı,
Qalqanı dəmür isə oqları atmaq gərək.

Yunus, ər nəzərində tazə güllər açılmış,
Gerçək ər bülbül isə nəzərdə ötmək gərək.

**239**

Bu dünyəyə gələn kişi axır yenə getsə gərək,
Müsafirdür, vətəninə bir gün səfər etsə gərək.

Və'də qılduq ol dost ilə biz bu cəhanə gəlmədin,
Pəs nə qədər əglənəvüz, ol və'dəmüz yetsə gərək.

Biz də varavuz ol elə qaçan ki və'dəmüz gələ,
Kişi varacağı yerə könlini bərkitsə gərək.

Könül necə bərkitməyə dost elinə gedən yola,
Aşiq kişilər canunı bu yola sərf etsə gərək.

Can nəyə ulaşur isə, əql də ana xərc olur,
Könül nəyi sevər isə dil anı şərh etsə gərək.

Əcəbmidür aşiq kişi mə'şuqini zikr edirsə?
Eşq başundan aşıcağaz könlüni zar etsə gərək.

Yunus, imdi sevər isən, andan xəbər vergil bizə,
Aşiqün oldur nişanı, mə'şuqın ayıtsa gərək.

**240**

Əya, könül, açğıl gözün, fikrin yavlaq uzatmağıl,
Baqğıl kəndü dirligünə, kimsə eybin gözətməgil.

Şöylə dirilgil xəlq ilə ölicəgiz söyləşələr,
Baqi dirlik budur, canum, yavuz ad ilə getməgil.

Dilər isən bu dünyayı axirətə dəgşürəsin,
Dünü gün qılğıl taəti, ayağ uzadub yatmağıl.

Gördün ki bir dərviş gəlür, yüz ur anun qədəminə,
Səndən "şey'-lillah" edicək qaşun, qarağun çatmağıl.

Söylədigün kələciyi eşitdigün kibi söylə,
Kəndözindən zirəklənüb bir qaç söz dəxi qatmağıl.

Dünya çərbü şirindürür, adəm gərəkdür yeyəsi,
Kəm nəsnəyə təmə' edüb kəsüb kəmirüb yutmağıl.

Nəfsə uyub beş barmağun bir gəzdən iltmə ağzuna,
Kəs birisin ver miskinə, gərək ola, unutmağıl.

Yunus, kim öldürür səni, verən alur yenə canı,
Yarın görəsin sən anı, ər nəzərindən getməgil.

**241**

Bir nəzərdə qalmayalum, gəl dosta gedəlüm, könül,
Həsrət ilə ölməyəlüm, gəl dosta gedəlüm, könül.

Gəl gedəlüm can turmadın, surət tərkini urmadın,
Araya düşmən girmədin gəl dosta gedəlüm, könül.

Gəl gedəlüm, qalma ıraq, dost içün qılalum yaraq,
Şeyxün qatındadur duraq, gəl dosta gedəlüm, könül.

Tərk edəlüm elü şəri, dost içün qılalım zari,
Ələ gətürəlüm yarı, gəl dosta gedəlüm, könül.

Bu dünyayə qalmayalum, fanidür aldanmayalum,
Bir ikən ayrılmayalum, gəl dosta gedəlüm, könül.

Biz bu cəhandan köçəlüm, ol dost elinə uçalum,
Arzu həvadan keçəlüm, gəl dosta gedəlüm, könül.



Qılavuz olğıl sən bana, güniləlüm dostdan yana,
Baqmayalum öndən sona, gəl dosta gedəlüm, könül.

Bu dünya olmaz paydar, aç gözüni, canun uyar,
Olğıl bana yoldaşü yar, gəl dosta gedəlüm, könül.

Ölüm xəbəri gəlmədin, əcəl yaqamız almadın,
Əzrayil həmlə qılmadın gəl dosta gedəlüm, könül.

Gerçək ərənə varalum, Həqqin xəbərin soralum,
Yunus Əmrəyi alalum, gəl dosta gedəlüm, könül

**242**

Dərvişlik dedükləri xirqə ilə tac dəgül,
Könlin dərviş eyləyən xirqəyə möhtac dəgül.

Xirqənün nə suçı var sən yolına varmazsan?!
Varğıl yolınca yüri, ər yolı qalmac dəgül.

Dersün şeyxün yolına yalın ayaq, baş açuq,
Ər var dirlik dirilmiş, yalın ayaq, ac dəgül.

Durmış mə'rifət söylər ərənə Yunus Əmrəm,
Yol əriylə yoldadur, yolsuza yoldaş dəgül.

**243**

Canlar fəda yoluna, bu can qayusı dəgül,
Sən can gərəksin bana, cəhan qayusı dəgül.

Canlar içində cansın, sən bir abi-heyvansın,
Bizə dinü imansın, iman qayusı dəgül.

Yudum yarəmi, sildüm, yarəm kimdəndür bildüm,
Bana yarum qayusı, yarəm qayusı dəgül.

Eşqün beni faş etdi, saqlayam derdüm vəli,
Çün səni əyan gördüm, pünhan qayusı dəgül.

Dərman olamı bana, dərdüm bənüm kim ona?!
Dərdlü varayım sana, dərman qayusı dəgül.

Gəlün aşiq olalum, eşqə cövlan uralum,
Əsrük olub yatmışam, cövlan qayusı dəgül.

Eşqün oqı dəmrəni doqınur yürəgümə,
Eşq içün bən öləyim, dəmrən qayusı dəgül.

Canü könüli nətdüm eşqün odına atdum,
Sidqi dəxi unutdum, güman qayusı dəgül.

Eşqün bürcindən uçdum, cövlan uruban keçdüm,
Bən dost ilə buluşdum, cövlan qayusı dəgül.

Bəhr-ümmana talmışam, anda sədəf bulmışam,
Cövhər alub gəlmişəm, ümman qayusı dəgül.

Turdığum yer Tur ola, baqduğum didar ola,
Nə hacət Musa bana, sən-bən qayusı dəgül.

Bu Yunusı andılar, karvan köçdi dedilər,
Bən mənzilə irişdüm, karvan qayusı dəgül.

**244**

Müşkili həll eyləmək dəgmənün işi dəgül,
Bir kişiyə ver könül, bu yolda naşı dəgül.

Övliyanun könlindən kəsmə "şey'un-lillah"ı,
Sana himmət ol eylər, göz ilə qaşı dəgül.

Ər oldur kim, mənzilin hər dəm göstəri tura,
Dəgmə arif bu düşi yoramaz, işi dəgül.



Həqq təcəlli qılmağa, can əslini bulmağa,
Könüldən sür sivayı nəzəri taşı dəgül.

Bu kəlamun mə'nisi övliyanun xanıdur,
Yedirməgil cahilə ki, zira aşı dəgül.

Yunus bir toğan idi, qondı Tapduq qolına,
Avın şikara gəldi, bu yuva quşı dəgül.

**245**

Sənün bən deməkligün mə'nidə üsul dəgül,
Bir qapu qullarına şaşı baqmaq yol dəgül.

Sən sana yarar isən, bu sözdən tuyar isən,
Qancaru baqar isən deməgil sən ol dəgül.

Yetmiş iki millətün həm mə'şuqı oldurur,
Aşiqi mə'şuqından ayırmaqlıq fal dəgül.

Küfrini atar ikən imanun urma, saqın,
Hirs bizümlə düşməndür, bilişlüdür, el dəgül.

İşbu sözdən bir xəbər müxtəsərdür, müxtəsər,
Et bir əri ixtiyar, qəhətlikdən bol dəgül.

Paşa, bu quş dilidür, bunı Süleyman bilür,
Sana derəm, ey xoca, bu dil təhi dil dəgül.

Sağa-sola baqmadın xoş söylər Tapduq Yunus,
Ol gerçəgə aşiqlər külli sağdur, sol dəgül.

**246**

Təhi görmə kimsəni, hiç kimsənə boş dəgül,
Əksiklüg ilə nəzər ərənlərə xoş dəgül.

Könlüni dərviş eylə, dost ilə biliş eylə,
Eşq əri, şol mə'nidə dərviş içi boş dəgül.

Dərviş bilür dərvişi, Həqq yolına turmışı,
Dərvişlər Hüma quşı, çaylaqü bayquş dəgül.

Dərvişlik əsli candan, keçdi iki cəhandan,
Xəbər verür sultandan, bəllüdür, yad quş dəgül.

Ey Yunus, Həqqi bilən söyləməz hərgiz yalan,
İkilik ilə gələn toğrı yol bulmış dəgül.

**247**

Bir gəz könül yıqdun isə bu qılduğun namaz dəgül,
Yetmiş iki millət dəxi əlin-yüzin yumaz dəgül.

Qan' ərənlər gəldi keçdi, bunlar yurdı qaldı, köçdi,
Pərvaz urub Həqqə uçdı, Hüma quşıdur, qaz dəgül.

Yol oldur ki, toğrı vara, göz oldur ki, Həqqi görə,
Ər oldur alçaqda tura, yücədən baqan göz dəgül.

Toğrı yola getdün isə, ər ətəgin tutdın isə,
Bir xeyir də etdün isə birinə bindür, az dəgül.

Yunus bu sözləri çatar, sanki balı yağa qatar,
Xəlqə məta'larun satar, yüki göhərdür, tuz dəgül.

**248**

Qanı bana səbrü qərar, sənün sözüni dinləyəm?
Qanı bana əqlü bili, tuydurmadın səni sevəm?

Qanı bana ol hövsələ ki, halumı bilməyələr?
Qanı bana zoru qüvvət kim, sənün eşqünə toyam?!

İzzətü ərkan, eyü ad eşq yolına nöqsandurur,
Bən neдərəm eyü adı, çün tərbiyət eşqdən yerəm.



Gerçək sana aşiq isəm, arlanmaqlıq nə'mdür bənüm?
Şükranə canumı verəm, gər məlamət tonın geyəm.

Zöhdü taət üsuli-din eşq həddindən taşradurur,
Nisbət dəgüldürür bana səcdə vü rüku'ü qiyam.

Dost surəti gözgüdürür, baqan kəndü yüzin görür,
Gəlsün o kəndüsüz gələn, bən razumı ana derəm.

Can göziylə baqan görür Yunus göziylə gördügin,
Yoqsa yaban gözi ilə kimsənəyə nə söyləyəm?!

**249**

Dostdan xəbər gəldi bana, turayım andan varayım,
Qurbanlığa bu canumı verəyim, andan varayım.

Şol bir-iki arşun bezin nə yeni var, nə yaqası,
Qaftan edübən əgnümə sarayım, andan varayım.

Canalıcı xud gəlisər, əmanəti ver deyisər,
Bən əmanəti issinə verəyim, andan varayım.

Getdi canum, qaldum eylə, naçar olub girdüm yola,
Dostlar şad olduğın bilə görəyim, andan varayım.

Münkərü Nəkir gəlisər, yer-gög ün ilə tolısar,
Bən bunlara cəvabını verəyim, andan varayım.

Yazuğum çoq, günah öküş, yürür idüm dünyada xoş,
Etdüklərimün hesabın sorayım, andan varayım.

Bəslədigüm nazük təni tərk etmiyəm derdim anı,
Qara toprağa bən anı qarayım, andan varayım.

Bən bu ömür xırmanunı dögdüm gətürdüm uş yenə,
Yunus aydur bu dükkanı dirəyim, andan varayım.

## 250

Gər razunu söylər isəm, kimsə dilüm bilməz bənüm,
Əgər səbr eylər isəm, könlüm qərar qılmaz bənüm.

Ey dustlar, ey uslular, siz ayıdun, bən nedəyim,
Ol dost yüzin görəlidən əqlüm başa gəlməz bənüm.

Bunun kibi tərtib ilə bənüm işüm varmaz başa,
Əlümdən iş qaldıyısa canumdan iş qalmaz bənüm.

Nə dəlüyəm, nə usluyam, bənzər nəyə bənüm işüm?
Eşq dənizinə ğərq olub könlüm, canum toymaz bənüm.

Məhəbbətin odı bənüm yüregümə düşdi yanar,
Dənizə ğərq olur isəm, söynüb xəta qılmaz bənüm.

Yıl on iki ay bu eşq güli od içində bitübdürür,
Yandığumca artar qoqum, dövrüm keçüb, solmaz bənüm.

Cümlə Həqqə yol vardılar, səbr ilə Həqqə irdilər,
Eşqün əsli oddandurur, səbrüm ilə olmaz bənüm.

Necə dedüm bu könlümə, var səbr eylə dək otur,
Şol dəm dəxi bədtər olur, ögüdümi almaz bənüm.

Bu Yunusun çün surəti ölüb topraq olur isə,
Batinümdən eşq sevgüsi, bilün ki, hiç getməz bənüm.

## 251

Bən bəndə buldum çün Həqi, şəkkü güman nə'mdür bənüm?!
Ol dost yüzin görməz isəm, bu gözlərüm nə'mdür bənüm?!

Gəlsün münacat eyləyən, doqsan bin hacət söyləyən,
Taşra ibadət eyləyən görsün (ki), dost nə'mdür bənüm.



Musa olub Tura çıqam, nur oluban gözdən baqam,
Söz oluban dildən çıqam, surü nəğm nə'mdür bənüm?!

Musa varur Tura çıqar, anda varur nura baqar,
Dostdan ğeyri zərrə qədər bu gözlərüm görməz bənüm.

Uş bən bəni cəm' eylədüm, ol dosta iman eylədüm,
Birliginə qıldum qamət, riya taət nə'mdür bənüm?!

Ol dost bana ümmi demiş, həm adumı Yunus qomış,
Dilüm şəkər, gövdəm qamış, bu söyləyən nə'mdür bənüm?!

Ümmi bənəm, Yunus bənəm, doqquz atam, dörtdür anam,
Eşq odına düşüb yanam, suqü bazar nə'mdür bənüm?!

## 252

Cümlə aləm tərkin urub, bən dost tərkin urımazam,
Andan ayru buçuq saət bən ansuzın durımazam.

Andan ayru diriligüm dirlik dəgüldürür bənüm,
Qədim odur, görür bəni, bən ölüyəm, göriməzəm.

Huri gəlüb aydur isə könül bana vergil deyü,
Dostdan artuq kimsənəyə bən könlümi verimezəm.

Dost deyü keçdi bu ömrüm, başarmadum dost qullığın,
Qoyam başara ol bəni, bən hiç iş başarımazam.

Bir gəzdən ol oldum əxi, bəndən ümid yoqdur bana,
Bən ol isəm pəs ol qanı, bən bu sirrə irimezəm.

Dostlar ögüt verür bana, getgil anun yaqınından,
Dəxi yaqın varam məgər, andan ayruq varımazam.

Dəgmələr aydur Yunusa, qatlan bu gün, yarın deyü,
Cəhd edəyim bugünümi yarına irgürimezəm.

## 253

Ol qadiri-“kün-fəyəkun” lütfedici rəhman bənəm,
Kəsmədin rizqini verən cümlələrə sultan bənəm.

Nütfədən adəm yaratan, yumurtadan quş dürədən,
Qüdrət dilüni söyləyən, zikr eyləyən sübhan bənəm.

Kimini zahid eyləyən, kimini fasiq eyləyən,
Eyblərini örtüci ol dəlilü bürhan bənəm.

Bir qulına atlar verüb, avratü mal, ciftlər verüb,
Həm yoq birinin bir pulı, ol rəhimü rəhman bənəm.

Bənəm əbəd, bənəm bəqa, ol qadiri-həyy mütləqa,
Xızr ola yarın səqqa, anı qılan ğüfran bənəm.

Dört dürlü nəsnədən hasil, bilün, bənəm üşdə dəlil,
Od ilə su, toprağü yel bünyad qılan yəzdan bənəm.

Ətə dəri, sünğük çatan, tən pərdələrini dutan,
Qüdrət işüm çoqdur bənüm, həm zahirü əyan bənəm.

Həm batinəm, həm zahirəm, həm əvvələm, həm axirəm,
Həm bən olam, həm ol bənəm, həm ol kərimü xan bənəm.

Yoqdur arada tərcüman, andağı iş bana əyan,
Oldur bana verən lisan, ol dənizə ümman bənəm.

Bu yeri gögi yaradan, bu ərşi kürsi durıdan,
Bin bir adı vardur, Yunus, ol sahibi-Qur’an bənəm.

## 254

Ey dost, eşqün dənizinə girəm, ğərq olam yüriyəm,
İki cəhan meydan ola, dövranum sürəm yüriyəm.

Girəm dənizə ğərq olam, nə əlif, nə mim, dal olam,
Dost bağında bülbül olam, güllərin dərəm yüriyəm.



Bülbül olubanı ötəm, könül olam canlar utam,
Başumı əlümə alub yolına varam yüriyəm.

Bülbül olubanı gedəm, ey necə könüllər güdəm,
Yüzüm eşq ilə dəmbədəm toprağa sürəm yüriyəm.

Şükür gördüm didarunı, aşdum vüsalun yarını,
Bu bənlük, sənlük şərüni tərkini uram yüriyəm.

Yunusdur eşq avarəsi, biçarələr biçarəsi,
Səndədür dərdüm çarəsi, dərmanum soram yüriyəm.

## 255

Səndən gəlür cövrü cəfa, bən ahü vah etməyəyim,
Düşmişəm eşqün odına, yanub necə dütməyəyim?!

Uş yürürəm yana-yana, top cigərüm döndi qana,
Eşqündən oldum divana, uyuyuban yatmayayum.

Sənün eşqün dənizinə düşübəni ğərq olayım,
Kimsənəm yoq əlüm ala, qoma bəni batmayayım.

Səkiz uçmağun hurisi gəlür isə bir araya,
Hərgiz manəndün olmaya, sən’ anlara qatmayayım.

Yunus Əmrə, sən bu sözi yüz bin der isən az ola,
Eşidənlər aşiq ola, igən də uzatmayayım.

## 256

Ey yarənlər, aydun bana, bən necəsi dolanayım?!
Nə dürlü tədbir edəyüm, ya necə sağınc sanayım?!

Canumda ol büt bitübdür, könülümi ol dutubdur,
Hey bəni ol avutubdur, ayruq nəyə bağlanayım?!

Öylə edübdür ol bəni, seçəməzəm dündən güni,
Alsun təni, utsun canı, qo'n bən ana alınayım.

Bən göhəriyəm, qanum ol, bən bir qulam sultanum ol,
Əqlümü canum, könlüm ol, andan neçün usanayım?!

Ansuzlığum bana haram, andandurur nəqdüm təmam,
Buncılayın lütfü kərəm qanda bulub dinləyəyim?!

Oldur bana Yunus deyən, oldur bənüm bağrım dələn,
Oldur bəni bənsüz qoyan, həm bən olam, bu bən nəyəm?!

**257**

İlk adum Yunus idi, adumı aşiq taqdum,
Tərk edüb udü ədəb şöylə xəbər bıraqdım.

İzzətə qalmış ikən aşiqlik nə'mdür bənüm?!
Bən kəndü əlüm ilə yüzümə qara yaqdum.

Nə assı var əlümdə təkyə qılam bən ana,
Aşiqllər xanmanını buşla boynuma taqdum.

Bənüm kibi bəndəkar kəm sağınc ilə bayar,
Bir pula gücüm yetməz, məta'um dərdüm çatdum.

İsa yarım ignəylə yol bulmadı həzrətə,
Bənüm bunca mətahla qanda sığısar rəxtüm?!

Aşiqlər məzhəbində şərmsar oldı Yunus,
Aşiq mə'şuqə irdi, bən dünyaya qayıqdum.

**258**

Girdüm eşqün dənizinə, bəhrileyin yüzər oldum,
Gəşt edübən dənizləri Xızrləyin gəzər oldum.

Cəmalunı gördüm düşdə, çoq aradum yayda, qışda,
Bulımadum tağda-taşda, dənizləri süzər oldum.



Sordum dəniz maligünə, ıraq dəgül salığuna,
Girdüm könül sınuğuna, könülləri düzər oldum.

Viran könlüm eylədüm şər, buncılayın şər qanda var?!
Xəznəsindən aldum göhər, dükkan yüzin bozar oldum.

Bən ol dükkandar qulıyam, göhərlər ilə tolıyam,
Dost bağının bülbüliyəm, budaqdan gül üzər oldum.

Ol budaqda bitər iman, iman bitsə gedər güman,
Dün-gün işüm budur həman, nəfsümə bir tatar oldum.

Canum bu tənə girəli nəzərüm yoqdur altuna,
Düşdüm ayaqlar altına, topraqlayın tozar oldum.

Tənüm topraq tozar yolca, nəfsüm əglər bəni öncə,
Gördüm nəfsün bürci yücə, qazma aldum qazar oldum.

Qaza-qaza endüm yerə, gördüm nəfsün yüzi qarə,
Hörməti yoq peyğəmbərə, bəndlərini bozar oldum.

Bu nəfs ilə dünya fani, bu dünyaya gələn qanı,
Aldamış bu dünya bəni, işləründən bezər oldum.

Yunus durdı girdi yola, qamu qürbətləri bilə,
Kəndi cigərüm qanıyla vəsfi-halum yazar oldum.

**259**

Bu cəhana gəlmədin mə'şuq ilə bir idüm,
"Qul huvallah" sifətlü bir binişan nur idüm.

Ol dəm ki birlik idi, nətəsi dirlik idi,
Ol payansuz qüdrətdə nə Musa, nə Tur idüm.

Bilə idüm həzrətdə, ol biqiyas qüdrətdə,
Nə şəriküm var idi, nə kimseylə yar idüm.

Yer, göğ yaradılmadın "qalu bəla" denmədin,
Lövh qələm çalınmadın me'raca qadir idüm.

Neçə gəz gəldüm getdüm, dəlim surət yaratdum,
Bu şimdiki surətdə Yunusa aldar idüm.

**260**

Bəni bunda veribiyən bilür bən nə işə gəldüm,
Qərarum yoq bu dünyada, gedərəm yumışa gəldüm.

Dünyayə çoq gəlüb getdüm, ərənlər ətəgin tutdum,
Qüdrət ününi eşitdüm, qaynayuban cuşa gəldüm.

Sərt söz ilə könül yıqdum, od oldum canları yaqdum,
Sirrümi bu xəlqə çaqdum, aləmə təmaşa gəldüm.

Bən oldum İdrisi dərzi, Şit oldum doqıdum bezi,
Davudun görklü avazı ah edüb nalişə gəldüm.

Aşiq oldum şol ay yüzə, nisar oldum bal ağıza,
Nəzər qıldum qara gözə, siyah olub qaşa gəldüm.

Musa oldum Tura vardum, qoç oldum qurbana gəldüm,
Əli olub qılıc saldum, meydana gürəşə gəldüm.

Dəniz kənarında ova, quyuda işləyən qova,
İsa ağzındağı dua oldum bilə, işə gəldüm.

Ay oldum aləmə toğdum, bulut oldum gögə ağdum,
Yağmur olub yerə yağdum, nur oldum günəşə gəldüm.

Qalü qildən keçənlərə, yolda gözin açanlara,
Anlayuban seçənlərə vaqyə oldum düşə gəldüm.

Bənəm ol dərdlü dərmanı, bənəm ol mə'rifət kanı,
Bənəm Musayi-İmrani, Tur tağundan aşa gəldüm.

Yolum sana oldu duraq, sabahın söyləyəndür Həqq,
Yunus Əmrə dilündə Həqq olub, dilə düşə gəldüm.



**261**

Dost baqalı yüzimə bən şəhi görüb gəldüm,
Ol yücə yücəsinə bigüman irüb gəldüm.

Əsrükligümə baqma, adum dəlüyə daqma,
Əsrükligüm əzəldən, işrəti sürüb gəldüm.

Əzəldən biləyidüm, "ələst"də "bəli" dedüm,
Ol qədimi dənizdən sel olup aqüb gəldüm.

İşrətünə irmişəm, səla deyü durmuşam,
Canı, dinü imanı şükranə verüb gəldüm.

Eşq bana İsa oldı, ərənlər dua qıldı,
Neçə gəzin topraqdan bən uri turub gəldüm.

Mənsur aydur "ənəl-həqq", der surətün oda yaq,
Deyniz dara gəlsünlər, bən darı qurub gəldüm.

Sorman Yunusdan xəbər, dost qandasa anda var,
Xəbərin görən verür, bən anı görüb gəldüm.

**262**

Ey bana dərviş deyən, nə'm ola dərviş bənüm?!
Dərvişlik yaylasında hərəkətüm qış bənüm.

Dərviş adın edindüm, dərviş tonın tonandum,
Yola baqdum utandum, həp işüm yanlış bənüm.

Xirqəm, tacum gözlərüm, fasid işlər işlərəm,
Hər yanumdan gizlərəm, bin bir fasid iş bənüm.

Yoldan xəbər sorarlar, ayduram inanurlar,
Qəlbüm safi sanurlar, vay, nə düşvar iş bənüm.

İçərümə baqarsan buçuq pullıq nesnə yoq,
Taşramun qavğasundan aləmlər tolmış bənüm.

Yunus aydur, yarənlər, ey gerçəgüm ərənlər,
Bu yolda olan hallar Allaha qalmış bənüm.

**263**

Dənizlər olsa bir qədəh, susalığum qanmaz bənüm,
İnildülərüm kəsilməz, gözüm yaşı dinməz bənüm.

Gəl varalum bizüm ilə ta girəsin bağçalara,
Daim ötər bülbülləri, gülüstanum solmaz bənüm.

Bizüm elün bağçaları daim tazədür gülləri,
Mə'murdurur bustanları, əğyar gülüm dərməz bənüm.

Mənsur qədəhin necə gəz mə'şuqə sundı əlümə,
Dört yanumdan od urdılar, kimsə halum bilməz bənüm.

Yana-yana kül oluban sən mə'şuqənün yolına,
Gündə bin gəz yanar isəm, dostdan yüzüm dönməz bənüm.

Canum eşqün külüngine Fərhad olub dutdum başum,
Daim tağları kəsərəm, Şirinüm hiç sormaz bənüm.

Yunus aydur, ey sultanum, eşqün ilə yandı canum,
Gər qılur isən dərmanum, hərgiz canum ölməz bənüm.

**264**

Bən bir əcəb elə gəldüm, kimsə halum bilməz bənüm,
Bən söylərəm, bən dinlərəm, kimsə dilüm bilməz bənüm.

Bənüm dilüm quş dilidür, bənüm elüm dost elidür,
Bən bülbüləm, dost gülümdür, bilün, gülüm solmaz bənüm.

Ol dost bana gəlsün demiş, sundum qədəh, alsun demiş,
Aldum qədəh, içdüm şərab, ayruq könlüm ölməz bənüm.



Nə Turum var, nə turağum, hiç yerdə yoqdur qərarum,
Həqqə münacat etməgə bəllü yerüm olmaz bənüm.

Sor turdığum yeri bana, gəlürsən göstərəm sana,
Bir zərrəcə Həqdən ayru gözüm nesnə görməz bənüm.

Tur tağında bir təcəlli gör Musayə nələr qıldı,
Yunus aydur, Həqq qatında sözüm gerü qalmaz bənüm.

**265**

Hər qancaru dönər isəm, eşq ilədür işüm bənüm,
Oldur könlümdə təşvişüm, həm eşqdür yoldaşum bənüm.

Eşqsüzlərə göynər özüm, anunçün faş olur razum,
Göricəgiz aşiqləri qaynar içüm-taşum bənüm.

Bu eşq bizə rəhmanidür, həm canımuzun canıdur,
Anun içün şeytan ilə hər dəm bu savaşum bənüm.

Bənüm canum bir quşdur kim, gövdəm anun qəfəsidür,
Dostdan xəbər gəlicəgiz bir gün uçar quşum bənüm.

Gəldüm dünyayı seyr etdüm, ya bu gün, ya yarın getdüm,
Bən bunda əglənəməzəm, bunda bitməz işüm bənüm.

Yunus aydur, bən aşiqəm, həm aşiqəm, həm sadiqəm,
Bu ayruq aşiqlər kibi yoqdur arayişüm bənüm.

**266**

Gedərəm əqlüm başumdan şaşuban,
Yanaram eşqün odına düşübən.

Od bıraqdun canuma, dün-gün yanar,
Yanaram yalab-yalab tutuşuban.

Eşqdən nə var əgər sındum isə,
Eşq ilə kim sınmadı uğraşuban.

Aşiq olğıl mə'şuqın didarına,
Mə'şuq olğıl eşq ilə sarmaşuban.

Yunus, canun eşqə ver şükranəyə,
Kimsələr bulmaz yarun istəşübən.

**267**

Bu ömrüm yoq yerə xərc etmişəm bən,
Canumı gör nə oda atmışam bən.

Kimsənə kimsəyə etməmiş ola,
Anı kim kendümə bən etmişəm, bən.

Əməlüm rəxtüni derdüm götürdüm,
Qamu assum ziyana satmışam bən.

Cəhanda bir sınuq saqsıdan ötrü
Göhərlərüm yabana atmışam bən.

Əməlüm nə ki varsa həp riyadur,
Əcəbdür ixlası unutmışam bən.

Gecəyə irəsini kimsə bilməz,
Tuli-əməl başın uzatmışam bən.

Dügəli ömrümi xərcinə sürdüm,
Ziyandan bəllüdür nə utmışam bən.

Biçarə Yunusun çoqdur günahı,
Anun dərgahına yüz tutmışam bən.

**268**

Əcəb oldı halum bu eşq əlindən,
Görəməzəm yolum bu eşq əlindən.

Bu qamu aləmün tacı ikən uş,
Ayaqlarda giləm bu eşq əlindən.



Ğərib bülbülləyin zari qıluram,
Aqar gözdən selüm bu eşq əlindən.

Xəzəl yapraqləyin bənzüm sarardı,
Qararuban öləm bu eşq əlindən.

Yarın məhşərdə bən yırtam yaqamı,
Neçə zara gələm bu eşq əlindən.

Nedərəm bən yarun vəslindən ayruq?!
Büküldi qədd-balam bu eşq əlindən.

Yunus, sən Tapduğuna qıl dualar,
Demə kim, nə qılam bu eşq əlindən.

**269**

Könül, usanmadun sən bu səfərdən,
Çələbüm saqlasun səni xətərdən.

Kişi kim kişinün qəhrin çəkincə,
Gedüb görünməmək yegdür nəzərdən.

Toğalı bağrumı doğradı ğürbət,
Sızar tamar cigər qanı tamardan.

Vətən oldı dikən, ğürbət gülüstan,
Ağu içmək yeg oldı neyşəkərdən.

Yunus gögsin açub dosta gedərkən,
Çələbüm saqlasun anı xətərdən.

**270**

Əgər eşqi sevərsən can olasın,
Qamu dərdinə həm dərman olasın.

Əgər dünya sevərsən mübtəlasın,
Mə'ni sirrinə qandan irəsin?!

Cəhan köhnə saraydur, sən yenisin,
Neçə bir əskiyə həsrətlənəsin?

Ağudur, bal dəgül dünya muradı,
Neçə bir ağuya barmaq banasın.

Qanadsuz quşləyin qaldun yabanda,
Qanadlu quşlara qanda irəsin?!

Sana ərdən əsa gərək bu yolda,
Tayanursan əsaya tayanasın.

Sözi bu Yunusın gözəllərədür,
Əgər aşiq olursan oyanasın.

### 271

Dinü millət qodurdı ol bənüm canum alan,
Anı tuyan kişiyə nə könül qalur, nə can.

Tuymayanlar halumı "dinin qodı" der bana,
Nəyilə din bəsləsün cansuz, könülsüz qalan?!

Surətümdə varlığum könül ilə can idi,
Cümləsin yəğmaladı bana eşq bağışlayan.

Eşqün sərhəngi bəni qomadı hiç nəsnədən,
Nə islamda, nə dində anılmaz küfrü iman.

Şərtü fərz olmaz anda canı eşqə qalanda,
Cəvabsuz dil söylənür, necə bilsün bu lisan?!

Əldən iş bıraqdurdı, nctəliksüz baqdurdı,
Dostlıq ticarətində anılmaz assı, ziyan.

Bəni bənlikdən qodı, varlıq dəftərin yudı,
Xövfü rəca göstərməz xeyrü şər əldən qoyan.

Sorman Yunusdan xəbər, dost qandasa anda var,
Yüz bin göhərdən fariğ eşq dənizinə talan.



### 272

Ərənlərə mühibb ikən yə münkir olduğun nədən?
Key saqıngıl datlu canun oqları çıqmadın yaydan.

Qəhr ərənlər atıdur, ğeyrət dəxi xəl'ətidür,
Ərənlər yayı qatıdur, oqları keçər qayadan.

Bizə mühibb olanları Həqdən dilərüz anları,
Dönüb münkir olanları tez çıqarurlar aradan.

Bunda əl-ayaq öpilür, görənün canı qapılur,
Ğərib müsafir yapılur zaviyə məscidxanədən.

Ağu içərsə nuş olsun, süci içərsə xoş olsun,
Yunus ilə yoldaş olsun gəlsün Allahuna gedən.

### 273

Ol vəqtin bir olasın, ayrulıqdan qalasın,
Cansuz gəl bu qapuya baqi dirlik bulasın.

Can tuta gəlür isən, canum vardur der isən,
Canı şümar edərsən, külli sağıncılasın.

Bunda nə sağınc, şümar, ya bunda kim qalur var,
Çün böylə düşdi səfər, gərək yolda qalasın.

Dərd ilə gəlməyincə dərmana irişilməz,
Bir can yolda qor isən, bin-bin canlar bulasın.

Qalma fani sağınca, qəsdilə baqma gəncə,
Yüz bin iki cəhanda ol dənlü sən olasın.

Tadarsan eşq tadundan, keçəsin zahir dindən,
Ayrulığun adından ol vəqt qurtılasın.

Ya Yunus, qanı əqlün, kəksüzin söylər dilün?!
Payanı yoq bu yolın, yazıda tolanasın.

## 274

Taşdun yenə, dəli könül, sular kibi çağlarmısın?
Aqdun yenə qanlu yaşum, yollarumı bağlarmısın?

Nedəm əlüm irməz yarə, bulınmaz dərdümə çarə,
Oldum elümdən avarə, bəni bunda əglərmisin?

Yavu qıldum bən yoldaşı, onulmaz bağrumun başı,
Gözlərümün qanlı yaşı, ırmağ olub çağlarmısın?

Bən topraq oldum yolına, sən aşuru gözədürsin,
Şu qarşuma gögüs gərüb taş bağırlu tağlarmısın?

Hərami kibi yoluma arqurı enən qarlı tağ,
Bən yarumdan ayru düşdüm, sən yolumı bağlarmısın?

Qarlı tağlarun başunda salqım-salqım olan bulut,
Saçun çözüb bənüm içün yaşın-yaşın ağlarmısın?

Əsridi Yunusun canı, yoldayım, ellərüm qanı?
Yunus düşdə gördi səni, sayrumısın, sağlarmısın?

## 275

Əcəb şu yerdə varm' ola şöylə ğərib bənciləyin?
Bağrı başlu, gözi yaşlu, şöylə ğərib bənciləyin?

Gəzdüm Urum ilə Şamı, Yuqaru elləri qamu,
Çoq istədüm, bulımadum şöylə ğərib bənciləyin.

Kimsələr ğərib olmasun, həsrət odına yanmasun,
Xocam, kimsələr olmasun şöylə ğərib bənciləyin.

Söylər dilüm, ağlar gözüm, ğəriblərə göynər özüm,
Məgər ki gögdə yıldızum şöylə ğərib bənciləyin.



Neçə bu dərd ilə yanam, əcəl irə bir gün öləm,
Məgər ki sinümdə bulam böylə ğərib bənciləyin.

Bir ğərib ölmüş deyələr, üç gündən sonra tuyalar,
Sovuq suyıla yuyalar, şöylə ğərib bənciləyin.

Hey Əmrəm Yunus biçarə, bulunmaz dərdümə çarə,
Var imdi gəz şərdən şərə şöylə ğərib bənciləyin.

## 276

Ey könlümün əglencəsi, ayıt bana neyləyəyin?
Eşqündən oldum avarə, dərdüm kimə söyləyəyin?

Mülki-fənadan keçəyin, ol dost elinə uçayın,
Talayın eşq ümmanına, dənizlərin boylayayın.

Eşqün od urdı canuma, gəlsün aşiqlər yanuma,
Çəkəyin eşqün xanını, aşiqləri toylayayın.

Girdüm eşqünün bağına, baqdum soluma-sağuma,
Dürlü çiçəklər dərübən güllərini yiyləyəyin.

Aşiq olayın ol gülə, düşsün aləmə ğülğülə,
Həzar dəstan olubanı dost bağını yaylayayın.

Yırtam yaqamı elü şər, dün – güni qılam ahu zar,
Aqıdayın göz yaşını, zarılıqlar eyləyəyin.

Yunus aydur, ərənlərün dirligini dirilmədün,
Gücüm yetdügincə barı soylarını soylayayın.

## 277

İlahi, bir eşq ver bana, qandalığum bilməyəyin,
Yavu qılayın bən bəni, istəyübən bulmayayın.

Şöylə heyran eylə bəni, bilməyəyin dündən güni,
İstəyəyin daim səni, ayruq nəqşə qalmayayın.

Al gedər bəndən bənlügi, doldur içümə sənlügi,
Dirligümdə öldür bəni, varub anda ölməyəyin.

Gəlürsə göynügüm dilə, kim sögə bana, kim gülə,
Barı yanayın dərd ilə, halum dilə gəlməyəyin.

Uş yürürəm yana-yana, cigərüm ğərq oldı qana,
Eşqün bir oq urdı cana, necə zari qılmayayın?!

Sənün qoqun tuydı canum, tərkini urdı cəhanun,
Hərgiz bəlürməz məqamun, səni qanda istəyəyin?

Bülbül olayın ötəyin, dost bağçasında yatayın,
Gül oluban açılayın, ayruq dəxi solmayayın.

Mənsurləyin dara bəni, əyan göstər anda səni,
Qurban qılayın bu canı, eşqə münkir olmayayın.

Eşqdürür dərdün dərmanı, eşq yolında qodım canı,
Yunus Əmrə aydur bunı, bir dəm eşqsüz olmayayın.

## 278

Bu dərvişlik yolına eşq ilə gələn gəlsün,
Ya dərvişlik nəydügin bir zərrə tuyan gəlsün.

Hələ biz işbu yola gəlmədük riyayilə,
Bu məlamətlik tonın bizümlə geyən gəlsün.

Gözüylə gördügüni örtə ətəgiyilə,
Bu yol key incə yoldur, yürəgi tuyan gəlsün.

Ulu-kiçi ərənlər demiş, bizi sevənlər,
Qayıqmasun gerüyə, ol şaha gələn gəlsün.

Hər kim sevər Allahı, rəhmət qılur vallahi,
Dil sevgisiylə olmaz, eşq ilə göyən gəlsün.



İşbu sözi aydandan bizə nişan gərəkdür,
Söz müxtəsəri budur, canına qıyan gəlsün.

Yunus sözilə kimsə qəbulyətə keçmədi,
Budü vücud dərmiyan ortaya qoyan gəlsün.

## 279

Ey yarənlər, ey qardaşlar, qorqaram bən öləm deyü,
Öldügümi qayramazam etdügümi bulam deyü.

Bir gün görinür gözümə, eybim uralar yüzümə,
Əndişədən dəli olmışam, nedəm bən, nə qılam deyü.

Əgər gerçək qul imişsəm, ana qullıq qılayıdum,
Ağlayadum bu dünyədə, yarın anda güləm deyü.

Həmin gəldüm bu dünyəyə nəfsümə qullıq eyləyü,
Eyü əməl işləmədüm əzabdan qurtılam deyü.

Ey biçarə Miskin Yunus, günahun çoq, neyləyəsin?
Sığındum ol Allahuma, dedi həm əfv edəm deyü.

## 280

Hər kimə kim dərvişlik bağışlana,
Qalbı gedə, pak ola gümüşlənə.

Nəfəsindən misk ilə ənbər dütə,
Budağundan elü şər yemişlənə.

Yaprağı həm dərtliyə dərman ola,
Kölgəsində çoq xeyirlər işlənə.

Aşiqün gözi yaşı həm göl ola,
Ayağundan saz bitüb qamışlana.

Cümlə şair dost bağçası bülbüli,
Yunus Əmrə arada durraclana.

## 281

Əqlüm başuma gəlmədi eşq şərabın tatmayınca,
Qandalığum bilimədüm gerçək ərə yetməyincə.

Kəndi bilişiylə kişi hiç irişə mi mənzilə?!
Allaha irəməz qalur ər ətəgin tutmayınca.

Var din, iman gərək isə, dirlik diril bu dünyədə,
Yarın anda bitməz işün bu gün bunda bitməyincə.

Çün bülbüldür aşiq gülə, nəzər Həqdən olur qula,
Bir kələci gəlməz dilə könüllərdə yanmayınca.

Könlümdəki bu razumı sağınmaz derdüm sözümi,
Aşiq nə qatlanur sözə eşq məta'ın satmayınca.

Biçarə Yunusun sözin key aşiq gərək anlaya,
O quş dilidür, neyləsün, ögütləməz ötməyincə.

## 282

Bir şaha qul olmaq gərək hərgiz mə'zul olmaz ola,
Bir eşik yastanmaq gərək kimsə əldən almaz ola.

Bir quş olub uçmaq gərək, bir kənara keçmək gərək,
Bir şərbətdən içmək gərək içənlər ayılmaz ola.

Çevik bəhri olmaq gərək, bir dənizə talmaq gərək,
Bir göhər çıqarmaq gərək hiç sərraflar bilməz ola.

Bir bağçaya girmək gərək, xoş təfərrüc qılmaq gərək,
Bir güli yiyləmək gərək hərgiz ol gül solmaz ola.

Kişi aşiq olmaq gərək, mə'şuqəyi bulmaq gərək,
Eşq odına yanmaq gərək ayruq oda yanmaz ola.

Yunus, imdi var dək otur, yüzüni həzrətə götür,
Özün kibi bir ər gətür hiç cəhana gəlməz ola.



## 283

Bir söz deyəyin sana, dinlə canun var isə,
Kəm təmə'lig eyləmə əqlün sana yar isə.

Mə'nidə gətürmişlər, qardaşdan yar yegrəkdür,
Oğuldan dəxi tatlu əgər toğrı yar isə.

Gördün yarun əgridür, nə'n var isə ver qurtul,
Uslulardan ögüttür eşittügün var isə.

Yarın sana müqabil, tapusında sücud qıl,
Çıqar cigərün yedür, əgər çarən var isə.

Ansuz sözün gör nədür, çoq söz heyvan yükidür,
Arifə bir söz yetər, təndə göhər var isə.

Ətmək yeyüb tuz basmaq ol namərdlər işidür,
Ətmək anı qomaya tuzun həqqi var isə.

Eylik ərün yarıdur, ölürsə uçmaq yeridür,
Səndən sonra söylənir nə dirligün var isə.

Yunus Miskin dəlüdür, həm sözindən bəllüdür,
Ayıblaman, yarənlər, əksüklügi var isə.

## 284

Aləm düşmən olur isə bəni dostdan ırımaya,
Dost qanda isə bən anda, düşmənlik ayırmaya.

Dost əhli bizüm ilə həm, dost bundadur, bizə nə ğəm?!
Yüz bin cəhd edərsə düşmən, dost məhfili turmaya.

Düşmən bana nedə bilə, işüm-gücüm dostdan yana,
Dost məqamı can içində, düşmən əli irməyə.

Sultanlar acizdür anda, nə könüldədür, nə canda,
Məhrumdur iki cəhanda, kim dost yüzin göriməyə.

Kimə kim dost qapu aça, düşməni əlündən qaça,
Yunus ağzı göhər saça, dəgmə arif dərimeyə.

**285**

Əşkərə qıldum bu gün pünhanumı,
Can verübən buldum ol cananumı.

Can, könül heyran qalıbdur mə'şuqə,
Mə'şuq ilə sürərəm dövranumı.

Dərd gərəkdür, dərd gərəkdür, dərd gərək,
Kim, gərək dərdə verəm dərmanumı.

Biməkanam anun içün dünyədə,
Kimsənə bilməz bənüm məkanumı.

Anı buldumü nedərəm ayruğı?!
Yəğmaya verdüm bu gün dükkanumı.

Top bənüm, çövganı aldum, çalaram,
Kim ala bu topdan meydanumı?!

Yer bənümdür, gög bənümdür, ərş bənüm,
Gör necəsi gərmişəm sayvanumı.

Yunus oldıysa adum bəs nə əcəb,
Oquyalar dəftərü divanumı.

**286**

Ey yarənlər, aydamazam canum nəyə talduğını,
Dil ilə vəsf edəməzəm könlümi kim alduğını.

Könlüm tolu, sığmaz dilə, aşiqdür ol kim, hal bilə,
Eşq neçəyi verdi yelə, anlayamaz nolduğını.



Eşqdən xəbər bilənlərün, eşq dərdilə tolanlarun,
Küfri iman olanlarun ayıblaman güldügini.

Ağlamaq, gülmək aşiqə, dirilmək, ölmək aşiqə,
Qəhrilə lütfi bir bilür, bilməz mə'lul olduğını.

Eşq Yunusı eylədi lal, Yunus qanı eşqə həlal,
Qo'n varın etsün paymal, görməsün ayrılduğını.

**287**

Ərənlərün könlində ol sultan dükkan açdı,
Necə bizüm kibilər anda qonuban köçdi.

Cümlə ərənlər uçdı, tağlar, yazılar keçdi,
Eşq qazanına düşdi, qaynayubanın bişdi.

Bu dünyənün məsəli bənzər murdar gövdəyə,
İtlər murdara düşdi, Həqq dostı qodı qaçdı.

Aşiq mi deyəm ana can tərkini urmadı?!
Aşiq ana deyələr kim, məlamətə düşdi.

Yenə əsridi Yunus Tapduq yüzin görəldən,
Məgər anun könlindən bir cür'ə şərbət içdi.

**288**

İstər idüm Allahı, buldum isə nə oldı?!
Ağlar idüm dünü gün, güldüm isə nə oldı?!

Ərənlər meydanında yuvarlanur top idüm,
Padişah çövganında qaldum isə nə oldı?!

Ərənlər söhbətində dəstə qızılgül idüm,
Açıldum ələ gəldüm, soldum isə nə oldı?!

Alimlər, üləmalar mədrəsədə buldıysa,
Bən xərabat içində buldım isə nə oldı?!

Eşit Yunusı, eşit, yenə dəlü oldı xoş,
Ərənlər mə'nisinə taldum isə nə oldı?!

**289**

Andan bərü kim eşqün bənümlə yoldaş oldı,
Rəhman yolına bəni göstərməgə baş oldı.

Canum üzərə turdı, rəhman çərisin dərdi,
Şeytan elini urdı, key yəğma taraş oldı.

Eşq nəfs elinə aqdı, nə bulduyısa yaqdı,
Kibr qəl'əsin yıqdı, anda çoq savaş oldı.

Dost yüzin əyan gördüm, sirr xəbərlərin sordum,
Dedi gizli, bilməzsün, uş söylədüm faş oldı.

Eşq aldı əlüm bənüm, göstərdi toğrı yolum,
Həqqə şükür kim, halum bayağıdan xoş oldı.

Anlar ki göz açdılar, bu dünyədən keçdilər,
Axrətə ulaşdılar, mənzilləri ərş oldı.

Bunlar bunda qaldılar, dünyəyə aldandılar,
Yalancılar aldılar, həp bunlar qolmaş oldı.

Ölənlər halin bilməz, göz açub ögin dərməz,
Miskin Yunus Əmrənün məgər bağrı baş oldı.

**290**

Yenə yüzini gördüm, yenə yürəgüm yandı,
Dost, sənün eşqün odı yürəgümə dayandı.

Görklü yüzüni görən, könlini sana verən,
Bəllü tapunda turan nə toydı, nə usandı.



Göhərdür sənün özün, günəşdən arı yüzün,
Şəkərdən datlu sözün, hər kim gördi utandı.

Şu könlüm ğərib idi, cigərüm kəbab idi,
Görklü yüzüni gördüm, içüm-taşum bəzəndi.

Yunus Əmrə biqərar, şol xub yüzə intizar,
Səndən ayrılmaz nəzər, vardı yaqıldı yandı.

**291**

Eşq ilə istər idük, yenə bulduq ol canı,
Gönlək edinmiş, geyər surət ilə bu təni.

Girmiş surətdə gəzər, cümlə işləri düzər,
Gerü kəndüyə söylər göhər ilə bu kanı.

Bu dünya bir bazardur, surətlər dükkan olmış,
Bu dükkana girübən oldur satan bu kanı.

Bir neçələr qayrayur, bunca malum qaldı der,
Verən oldur, alan ol, sormaz nədür ziyanı.

Yunus, imdi sən səndən ayru dəgülsin candan,
Sən səndə bulmaz isən, qanda bulasın anı?!

**292**

Həlal qıldı mə'şuqa aşiq kəndü qanını,
Mə'şuq nəqşindən oqur eşq əri Qur'anını.

Yardan ayru olunca asılub ölmək yegdür,
Aşiq kəndü bırağur boynına orğanını.

Getməz aşiq gözindən hərgiz mə'şuq xəyalı,
Netəkim Zəlxa verür Yusifun nişanını.

Dirlik budur aşiqə mə'şuq yolında ölə,
Sorarlar isə aydam aşiqün bürhanını.

Bilqeys ilə Süleyman eşqə düşdi bir zaman,
İstəyüb bulmadılar bu dərdün dərmanını.

Gögdəki Harut, Marut eşq içün endi yerə,
Zöhrə yüzin göricək unutdı Rəhmanını.

Gəzaf görmən siz eşqi, kimə uğradıyısa,
Sultanı iltür başdan, yitirür xanmanını.

Fərhad bu eşq yolında başın külüngə tutdı,
Xosrov Şirin dərdindən dosta verdi canını.

Leyliylə Məcnun işi əcəbdürür bu xəlqə,
Əbdürrəzzaq tərk etdi eşq içün imanını.

Zəmanə vəfaları cəfa gəlür Yunusa,
Bir toğrı yar bulıcaq fəda qılur canını.

**293**

Baqduğum yüzdə gördüm Tapduğumun nurını,
Məqsudum bu gün bildüm, nedərəm bən yarını.

Yarınum bu gün bana, xoş bayram, dügün bana,
Düşdə gəlür ün bana, eşidün əxbarını.

Dostun xəbəri bilə nəfsün sana yar eylə,
Baq dosta yarağ eylə bu vücudun şərini.

Vücuda gəlməyincə kimsə Həqqi bilmədi,
Bu vücuddan göstərdi dost bizə didarını.

Ərün didarın gördüm, güman tərkini vurdum,
Dost bağçəsinə girdüm görməgə gülzarını.



Dostun yüzi gül bana, aşiqəm bülbül ana,
Qayqımazam dört yana, çün buldum eşq ərini.

"Əlestu bi Rəbbikum" Həqdən nida gəlicək,
Mö'minlər "bəli" deyüb etdilər iqrarını.

Yunus, küfür əlindən şikayətə gəldilər,
Ey sultanım gerçək ər, kəs gedər zünnarını.

**294**

Ey yarənlər, kim eşitdi aşiq tövbə etdügini?
Ya kim eşitdi dənizə od düşübən tütdügini?

Şahum, sənün eşqün odı düşdi könül dəryasına,
Əcəblərlər qaynayuban mə'rifətlər bitdügini.

Yüz bin İsa ilən Musa eşqündə sərgərdan gəzər,
Əcəblərlər bəni dəxi eşq nəhəngi yutduğını.

Yüzgəçlik ögrənməyən qul qo girməsün bu dənizə,
Eşq dəryası dibsizdürür, əcəbləmən batduğını.

Sərraflığı ögrənməyən bu göhəri buncuq sanur,
Varur verür yoq nəsnəyə, bilməz nəyə satduğını.

Hər kim anun didarını bunda əyan görməz isə,
Yarın ol sərgərdan gəzə, hiç bilməyə netdügini.

Yunus aydur, ər qulıyam, Tapduğumuz dost yüzidür,
İşbu sözə inanmayan edə bilsün etdügini.

**295**

Ey yarənlər, ey qardaşlar, görün bəni netdüm əxi,
Ərə irdüm, əri buldum, ər ətəgin dutdum əxi.

Canum bir gözsüz can idi, içi dolu sən-bən idi,
Dutdum miskinlik ətəgin, bən mənzilə yetdüm əxi.

Qorqar oldum bir Tənqridən, bezar oldum yatlu xudan,
İşbu işüm sağınc ilə bən yoluma getdüm əxi.

Gedərdüm könlümdən kini, kin tutanın yoqdur dini,
Ey yarənlər, bən bu sözi uludan eşitdüm əxi.

Anladum kəndü halumı, gözlədüm toğrı yolumı,
Dutdum ulular ətəgin, həzrətə bən yetdüm əxi.

Aşiq isən, Miskin Yunus, həzrətə dutğıl yüzini,
Anlayana göhərdürür, söz sərrafa satdum əxi.

**296**

Severəm bən səni candan içərü,
Yolum ötməz bu ərkandan içərü.

Nərəyə baqarsam könlüm tolusın,
Səni qanda qoyam bəndən içərü?!

O bir dilbərdürür, yoqdur nişanı,
Nişan yoqdur binişandan içərü.

Bəni sorma bana, bəndə dəgülvən,
Surətüm boş yürir tondan içərü.

Bəni bəndən alana irməz əlüm,
Qədəm kim basa sultandan içərü?!

Təcəllidən nəsib irdi kiminə,
Kiminün məqsudi bundan içərü.

Kimə dəgdi isə ol dost nəzəri,
Anun şö'ləsi var gündən içərü.

Sənün eşqün bəni bəndən alubdur,
Nə şirin dərd bu dərmandan içərü.



Şəriət, təriqət yoldur varana,
Həqiqət, mə'rifət andan içərü.

Süleyman quş dilin bilür dedilər,
Süleyman var Süleymandan içərü.

Unutdum din, diyanət qaldı bəndən,
Bu nə məzhəbdürür dindən içərü?!.

Dinün tərk edənün küfrdür işi,
Bu nə küfrdür imandan içərü?!

Keçər ikən Yunus şəş oldı dosta,
Ki qaldı qapuda andan içərü.

**297**

Yort, ey könül, sən bir zaman asudə, fariğ, xoş yüri,
Qorqma, qayurma kimsədən, ğüssə vü ğəmdən boş yüri.

Həqiqətə baqar isən, nəfsün sana düşman yetər,
Var imdi ol nəfsün ilə urış, savaş, toqış, yüri.

Nəfsdür əri yolda qoyan, yolda qalur nəfsə uyan,
Nə işün var kimsə ilə, nəfsünə qaqı, buş, yüri.

Dilər isən bu dünyənün şərrindən olasın əmin,
Tərk eylə bu kibrü kini, xirqəyə gir, dərviş yüri.

İstər isən bu dünyədə əbədi sərxoş olasın,
Eşq qədəhin tolu götür, yıl on iki ay sərxoş yüri.

Kimsə bağına girməgil, kimsə gülini dərməgil,
Var kəndü mə'şuqun ilə bağçada əl alış yüri.

Könüllərdə ig olmağıl, məhfillərdə çig olmağıl,
Çig nəsnənün nə tadı var, gəl eşq odına biş yüri.

Yunus, imdi xoş söylərsin, dinləyənə şərh eylərsin,
Xəlqə nəsihət satınca ər ol, yolınca qoş yüri.

**298**

Bən yürürəm yana-yana, eşq boyadı bəni qana,
Nə aqiləm, nə divana, gəl gör bəni eşq neylədi?!

Gəh əsərəm yellər kibi, gəh tozaram yollar kibi,
Gəh aqaram sellər kibi, gəl gör bəni eşq neylədi?!

Aqar sulayın çağlaram, dərdlü cigərüm dağlaram,
Şeyxüm anuban ağlaram, gəl gör bəni eşq neylədi?!

Ya əlüm al qaldur bəni, ya vəslünə irdür bəni,
Çoq ağlatdun, güldür bəni, gəl gör bəni eşq neylədi?!

Bən yürürəm eldən-elə, şeyx soraram dildən-dilə,
Ğürbətdə halum kim bilə, gəl gör bəni eşq neylədi?!

Məcnun oluban yürürəm, ol yarı düşdə görürəm,
Oyanub mə'lul oluram, gəl gör bəni eşq neylədi?!

Miskin Yunus biçarəyəm, başdan-ayağa yarəyəm,
Dost elindən avarəyəm, gəl gör bəni eşq neylədi?!

**299**

Bu eşq dənizinə talan hacət dəgül ana gəmi,
Ya xud (biz) qanda bulalum bu söhbət ilə bu dəmi?!

Dünyalığum yoqdur demə, bu ğüssəyi öküş yemə,
Mə'şuqı gər sevdün isə gedər könlündəki ğəmi.

Bən sevdügüm mə'şuqəyi sən dəxi bir görsəyidün,
Verməyədün bu ögüdi, fəda qılaydun bu canı.

Aşiq kişi bilməz ögüt, zira assı qılmaz ögüt,
Unutur ol kibrü kini, tərk eylər gedər dükkanı.



Gerçək aşiq olanlarun yüzində nişanı olur,
Dünin-günin turmaz, aqar gözləri yaşunun qanı.

Bu cümlə aləm sevdügi şol din ilə imandurur,
Eşqsüz gərəkməz vallahi, şol diniyilə imanı.

Yunus, yüzün qaldırmağıl aşiqlərün ayağından,
Eylə fəda yüz bin canı, andan bulasın Sübhanı.

**300**

Yoq yerə keçirdüm güni, ah, nedəyim ömrüm, səni?
Sənünlə olmadum ğəni, ah, nedəyim ömrüm, səni?

Gəldimü keçdüm, bilmədüm, ağlayub ğüssə yermədüm,
Səndən ayrılam demədüm, ah, nedəyim ömrüm, səni?

Xeyrüm, şərrüm yazılısar, ömrüm ipi üzülisər,
Surət bəndən bozulısar, ah, nedəyim ömrüm, səni?

Gedüb gerü gəlməyəsin, gəlüb bəni bulmayasın,
Bu bənligə sərmayəsin, ah, nedəyim ömrüm, səni?

Qanı sana güvəndigüm, güvənübən yuvandığum?
Qaldı külli qazandığum, ah, nedəyim ömrüm, səni?

Miskin Yunus, gedisərsin, əcəb səfər edisərsin,
Həsrət ilə qalısarsın, ah, nedəyim ömrüm, səni?

**301**

Bir saqidən içdük şərab, ərşdən yücə meyxanəsi,
Ol saqinün məstləriyüz, canlar anun peymanəsi.

Eşq odına yananlarun külli vücudı nur olur,
Ol od bu oda bənzəməz, hiç bəlürməz zəbanəsi.

Bizüm məclis məstlərinün dəmləri "ənəl-Həqq" olur,
Bin Həllaci-Mənsur kibi ən kəminə divanəsi.

Ol məcls kim bizdə vardur, anda cigər kəbab olur,
Ol şəm'ə kim bizdə yanar, ayü günəş pərvanəsi.

Ol məclisün aşiqləri İbrahim Ədhəm kibidür,
Bəlx şəhrincə yüz bin ola hər guşədə viranəsi.

Yunus, bu cəzbə sözlərün cahillərə söyləməgil,
Bilməzmisin cahillərin necə keçər zəmanəsi?!

**302**

Çıqdum ərik dalına, anda yedüm üzümi,
Bostan issi qaqıyub der nə yersin qozumı.

Ağrılıq yapdı bana, böhtan eylədüm ana,
Çərçi də gəldi aydur, qanı, aldun qızumı.

Kərpic qoydum qazğana, poyrazilə qaynatdum,
Nədür deyü sorana bandum verdüm özini.

İplik verdüm çulxaya sarub yumaq etməmiş,
Becid-becid ısmarlar gəlsün alsun bezini.

Bir sərçənin qanadın qırq qatıra yüklədüm,
Cift dəxi çəkəmədi, şöylə qaldı qazanı.

Bir sinək bir qartalı salladı urdı yerə,
Yalan dəgül, gerçəkdür, bən də gördüm tozını.

Bir küt ilə güreşdüm əlsüz, ayağum aldı,
Gürəşüb basamadum, göyündürdi özümi.

Qaf tağından bir taşı şöylə atdılar bana,
Öylelik yola düşdi, bozayazdı yüzümi.



Balıq qavağa çıqmış zift turşusın yeməgə,
Leylək qoduq toğurmış baq a şunun sözini.

Gözsüzə fısıldadum, sağır sözüm eşitmiş,
Dilsüz çağırub söylər dilümdəki sözümi.

Bir öküz boğazladum, qaqıldum sərə qodum,
Öküz issi gəldi aydur, boğazladun qazumı.

Bundan da qurtulmadum, nedəsini bilmədüm,
Bir çərçi gəldi aydur, qanı, aldun gözgümi.

Tosbağaya uğradum, gözsüz səbük yoldaşı,
Sordum səfər qancaru, Qeysəriyə azimi.

Yunus, bir söz söylədün hiç bir sözə bənzəməz,
Münafiqlər əlindən örtər mə'ni yüzini.

**303**

Düşdi önümə hübbül-vətən, gedəm hey dost deyü deyü,
Anda varan qalur həman, qalam hey dost deyü deyü.

Gələ şol Əzrayil duta, assı qılmaz ana – ata,
Binəm şol ağacdan ata, gedəm hey dost deyü deyü.

Xəlvətlərdə məşğul olam, daim açılam gül olam,
Dost bağında bülbül olam, ötəm hey dost deyü deyü.

Şol bir beş-on arşun bezi kəfən edələr əgnümə,
Dökəm şol dünyə tonların, geyəm hey dost deyü deyü.

Məcnun oluban yüriyəm, yücə tağları büriyəm,
Mum olubanı əriyəm, yanam hey dost deyü deyü.

Günlər keçə, yıl çevrilə, üstümə sinləm obrula,
Tən çüriyə topraq ola, tozam hey dost deyü deyü.

Yunus Əmrə, var yolına, münkirlər girməz yolına,
Bəhri olub dost gölinə talam hey dost deyü deyü.

## 304

Hər kim bana əğyar isə Həqq Tanrı yar olsun ana,
Hər qancaru varur isə bağü-bahar olsun ana.

Bana ağu sunan kişi şəhdü-şəkər olsun aşı,
Gəlsün qolay cümlə işi, əli irər olsun ana.

Önümcə quyı qazanı Həqq təxtin ağdursun anı,
Ardumca taşlar atana – güllər nisar olsun ana.

Acı dirligüm istəyən tatlu dirilsün dünyədə,
Kim ölümüm istər isə bin yıl ömür versün ana.

Hər kim dilər bən xar olam, düşman əlində zar olam,
Dostları şadü düşmanı dostü əğyar olsun ana.

Miskin Yunus, bu dünyədə güldügini istəməyən,
Ağladuğum istəyənə – gözüm bınar olsun ana.

## 305

Ey padişahi-ləmyəzəl, qıldum yönüm səndən yana,
İşbu yüzüm qarasiylə vəsl istərəm səndən yana.

Sənsin bu gözümdə görən, sənsin dilümdə söyləyən,
Sənsin bəni var eyləyən, sənsin həmin öndən sona.

Sən kim dedün, ya Rəbb, bana, bən yaqınam səndən sana,
Çün yaqınsın bəndən bana, görklü yüzün göstər bana.

Necə yaqınsın bana sən, müştaqü həsrət sana bən?!
Dün-gün səni gözləyübən göremezəm qaldum tana.

Hər gələn oldur, gedən ol, görinən oldur, görən ol,
Ülvi vü süfli cümlətən oldur, gör, görinən bana.

Yunus, bu sirrü Həqdürür, bu dilə gəlmək yoqdurur,
Bilməsi bunun zövqdürür, əql ilə fəhm irməz ana.



## 306

Allah deyəlüm daim, Allah görəlüm neylər,
Yolda turalum qaim, Allah görəlüm neylər.

Allah deyü qıl zari, oldur qamunun varı,
Andan umalum yarı, Allah görəlüm neylər.

Çıqarmayalum dildən, ayrılmayalum təndən,
Ta azmayalum yoldan, Allah görəlüm neylər.

Aclıq sonı toqlıqdur, toqlıq sonı yoqlıqdur,
Bu yollar qorqulıqdur, Allah görəlüm neylər.

Sən sanmaduğun yerdə şayəd açıla pərdə,
Dərman irişə dərdə, Allah görəlüm neylər.

Gündüz olalum saim, gecə olalum qaim,
Allah deyəlüm daim, Allah görəlüm neylər.

Adı-sanı dillərdə, sevgüsi könüllərdə,
Şol qorqulu yollarda Allah görəlüm neylər.

Adü sanı unutdum, küfrümi suya atdum,
Miskinligə əl qatdum, Allah görəlüm neylər.

Hər dəm talalum bəhrə, aldanmayalum dəhrə,
Səbr eyləyəlüm qəhrə, Allah görəlüm neylər.

Ar-namusı bıraqdum, kilümi suya atdum,
Dərvişligə əl qatdum, Allah görəlüm neylər.

Məcnun kibi avarə, aşiq oluban yarə,
De, Yunus – sən biçarə, Allah görəlüm neylər.

Yunus, sən anı sanma bu eşq sana səndəndür,
Can qamuya andandur, Allah görəlüm neylər.

Netdi bu Yunus, netdi, bir toğrı yola getdi,
Pirlər ətəgin tutdı, Allah görəlüm neylər.

## 307

Neçə yıllar ömür sürdüm, anca ağlayuban güldüm,
İşdə, əcəl, sana gəldüm, əsənlədüm, dünyam, səni.

Sürdüm ömrümi keçürdüm, canum Həzrətə uçurdum,
Əcəl şərbətin içürdüm, əsənlədüm, dünyam, səni.

Yürür idüm sağ-səlamət, təqdir eylədi məlamət,
Əcəl qıldı xoş məlalət, əsənlədüm, dünyam, səni.

Gələn keçərmiş, nedəlüm, gəlün axrətə gedəlüm,
Bu fənayı tərk edəlüm, əsənlədüm, dünyam, səni.

Xeyrü şər etdügün işlər, ol görünən dürlü düşlər,
Bitdi bu qamu təftişlər, əsənlədüm, dünyam, səni.

Dünü gün edərdüm zikir, qılur idüm Həqqə şükür,
Əcəl irdi, bizi oqur, əsənlədüm, dünyam, səni.

Bən bir dərviş idüm, dostum Həqdən yana oldı qəsdüm,
Əcəl duzağına basdum, əsənlədüm, dünyam, səni.

Yarənlərüm, qardaşlarum Həqqə layiq yoldaşlarum,
Əsən qalsun razdaşlarum, əsənlədüm, dünyam, səni.

Ey Yunus Əmrə biçarə, yüzün dutğıl toğrı yarə,
Ölümə yoğ imiş çarə, əsənlədüm, dünyam, səni.

## 308

Eylə sanman siz bəni kəndözümdən gəlmişəm,
Ya kəndü əlüm ilə bu qəfəsə girmişəm.

Uşadam bu qəfəsi, oda yaqam həvəsi,
Zəif qılam bu nəfsi ta əslümə ulaşam.



Bilməzəm əslüm nədür, ata xud bəhanədür,
Zira ana qarnında qan ilə dirilmişəm.

Qan dəgül bənüm aşum, hirsü həva yoldaşum,
Həzrətə uçar quşum, məgər tənə girmişəm.

Gah mö'minəm taətdə, dəmbədəm münacatda,
Gah rindəm xərabatda, bən bir əcəb qolmaşam.

Hikmət ilə baq bana, ta əyan olam sana,
Zira bən bu surətdə yüz bin dürlü gəlmişəm.

Yunus, bədən bəndində qalmayasın zindanda,
Bən qanda, zindan qanda, kimün malın almışam?!

## 309

Ey yarənlər, dinmən bana, bən yenə noldum bilməzəm,
Elmü əməl sorman bana, divanə oldum, bilməzəm.

Eşqüm bəni yaqubdurur, könlüm dosta aqubdurur,
Çün heyranü məst olmışam, bən bəni bilməzəm.

Eşqün ilə bulanığam, gəh əsrügəm, gəh ayığam,
Nə uyuram, nə oyanuğam, dəmbəstə qaldum, bilməzəm.

Şeyx oldı deyü nəsihət bəndən istəməsin (kimsə),
Bən sanur idüm bilürəm, uş şimdi bildüm bilməzəm.

Aşiq Yunus, sən canunı eşq yolında eylə fəda,
Şeyx ilə buldum bən bəni, ayruq cəhanı bilməzəm.

## 310

Dinü millətdən keçər eşq əsərini tuyan,
Məzhəbü din mi bilür kəndözin yoğa sayan?!

Eşq kimə irdiyisə kəndüdən ğeyri qomaz,
Eşqdən zərrə ayrılmaz kəndüligindən tuyan.

Uçmaqdan umusı yoq, tamudan qorqusı yoq,
Kəndözin yavı qılub xeyrü şər əldən qoyan.

Ol bənəm dersə, reva bənligin bilsə xəta,
Tərk eyləyübən riza, əql qoyub eşqə uyan.

Eşq əhlini sorarsan nə məzhəb, nə millətdir,
Yolda qalandur, saqın, gecə vü gündüz sayan.

Küfrü iman ol yolda assı, ziyana keçməz,
Assı, ziyandan fariğ varlığı lövhin yuyan.

Yunus, sən səni gedər, hər nedərsə dost edər,
Əczüni bil, əbsəm ol, var eşq rənginə boyan.

### 311

Dərvişlərün yolına sidq ilə gələn gəlsün,
Həqdən özgə nəsnəyi könlindən sürən gəlsün.

Dərvişlər dedükləri bir dükənməz kan olur,
Xasü am, qulü sultan – bu kandan alan gəlsün.

Dərviş tolınur toğar, hər nəfəs gögə ağar,
Bən deyəyin toğrıyı, canına qıyan gəlsün.

Dərvişlik bir loqmadur yer ilə gögdən ulu,
Bu əzəmət loqmayı yudub sinürən gəlsün.

Dərvişün gözi açuq, düni güni oyanuq,
Bu sözə Tanrum tanuq – baqmadın görən gəlsün.

Dərvişün qulağı səq, Həqdən eşidür səbəq,
Dəprənmədin dil-dodaq sözi eşidən gəlsün.

Dərvişün əli uzun, çıqarur münkir gözün,
Şərqə, ğərbə düpdüzin sunmadın irən gəlsün.



Dərvişlər Həqqün dostı, canlarıdur Həqq məsti,
Eşq şəm'ini yaqdılar, pərvanə olan gəlsün.

Bu Miskin Yunusı gör, dərvişlik ilə gəldi,
Nəfsindəndür şikayət, nəfsün öldürən gəlsün.

### 312

Çələb nurdan yaratmış canını Mühəmmədün,
Aləmə rəhmət saçmış adını Mühəmmədün.

Dostum demiş yaratmış, həm anun qeydin yemiş,
Ümmətdən yana qomış yönini Mühəmmədün.

Mühəmməd bir dənizdür, aləmi tutub durur,
Yetmiş bin peyğəmbərlər gölində Mühəmmədün.

Dünya malın dutmamış, hiç əmanət artmamış,
Tərzi biçüb tikməmiş tonını Mühəmmədün.

Tanrı arslanı Əli sağında Mühəmmədün,
Həsən ilə Hüseyni solında Mühəmmədün.

Yılda yetmiş bin hacı hər biri niyyət edər,
Varur ziyarət edər nurını Mühəmmədün.

Yunus Dədəm eşqlüdür, əksiglüdür, miskindür,
Hər kim yeməz məhrumdur xanını Mühəmmədün.

### 313

Eşqün könlüm yəğmaladı, nolsam gərək şimdən gerü,
Bir od bıraqdun canuma, yansam gərək şimdən gerü.

Əvvəl oda düşüb yanar, ömür keçər dövran dönər,
Gün gəldükcə bənzüm solar, solsam gərək şimdən gerü.

Nə əcəb sərgüzəştlər, bağrum tolu sərzənişlər,
Turmaz aqar qanlu yaşlar, aqsa gərək şimdən gerü.

Dedüm, Yunus dəlü olmış, mə'rifət bəhrinə talmış,
Ol dənizdə göhər bulmış, alsam gərək şimdən gerü.

**314**

Ey eşq dəlüsi olan, nə qaldun pərakəndə?
Ol səni dəlü qılan yenə səndədür, səndə.

Dünya axirət ol Həqq, yer-gög toludur mütləq,
Hiç gözlərə görinməz, kim bilür nə nişanda.

Gər meyxanəyə vardum, ansuz yer görəmədüm,
Yenə ana sataşdum, girdüm isə külxanda.

Hər kim aradı cismin, cisminde buldı xəsmin,
Nə dünya-axrət ana, nə assı, nə ziyanda.

Bir neçəsinə qaç der, bir neçəsinə tut der,
Qaçanla bilə qaçar, bilə turur turanda.

Bir necə qullarını giriftar edən oldur,
Mədəd edüb irişən genə bilə zindanda.

Aydurlar Miskin Yunus, neçün dəlü oldun sən?
Nə əqlü fəhm qalsun işbu sirri duyanda?!

**315**

Aşiqləri tamuya yandurmaya,
Uçmağına bunlar baş endürməyə.

Yedi tamu bir aha qatlanmaya,
Yedi dəniz eşq odın söndürməyə.



Buyruğın tutmaz isən Adəmləyin,
Üç yüz yılda yaşunı dindürməyə.

Bin yıl cəfa çəkməyincə Nuh kibi
Tufanında gəmiyə bindürməyə.

Qurban olmayınca İsmayıl kibi,
Kimsə içün gögdən qoç endirməyə.

Çobanlıq etməyincə Musiləyin
Kəlimün deyüb Tura göndərməyə.

Xülqün olmayınca Mühəmməd kibi
Həqq didarını sana göstərməyə.

Yunus, qoğıl sən bu qurı də'vayı,
Vay ana ki, Allah oyandurmaya.

**316**

İçümdə bir dərd oldı, deyəyin dərvişlərə,
Dərvişlərün qədəmi qutludur hər işlərə.

Hər kimün ki dərdi var, dərman istəyü gedər,
Bənüm dərmanum sənsin bağrumdağı başlara.

Eşqdən səbəq alursın, həm key qatı bilürsin,
Netə rəva görürsin xidməti dərvişlərə?!

Eşqünün cəfasından dünin-günin ağlaram,
Aqan bınar nə misal gözdən enən yaşlara?!

Cana tuzaq quralum, şayəd eşq ələ girə,
Eşqi necə avlarlar soralum tutmışlara.

Şöylə həvai gəlür, duzaq elmin kim bilür,
Necə duzaq quralum bu qonmaduq quşlara?!

Yunus, könlün alanı sən kimə söyləyəsin,
Sorar isən sor imdi sən anı bulmışlara.

### 317

Aşiqi-zində qulun hökmi keçər canlara,
Əksilməz nöqlü şərab eşq xanın yeyənlərə.

İşbu cəhanı xərab daim işidür tələb,
Xərablıqlar göstərür kəndüyi bulanlara.

Eşq dildə gənəz olur, eşq bilici az olur,
Dünyə, axrət tərk gərək aşiqin deyənlərə.

Dünyayı əldən bıraq, olmağıl Həqdən ıraq,
Sərmayə kəndüsi olmış varlıqlar yuyanlara.

Bundan ulusı məqam nə şad(i) vardur, nə ğəm,
Ödlər sıdurmaq gərək səladur deyənlərə.

Gəl imdi Miskin Yunus yolunda yalan olma,
Bilürsin, eşq aldanmaz yalan söyləyənlərə.

### 318

Kimsəyi düşman tutmazuz, əğyar dəxi yardur bizə,
Qanda issızlıq var isə məhəllə vü şərdür bizə.

Adumuz miskindür bizüm, düşmanımuz kindür bizüm,
Biz kimsəyə kin tutmazuz, qamu aləm birdür bizə.

Pişrov bizə Qur'andurur, vətən bizə cənnətdürür,
Ol tamuyı Həqq yandurur, ol güli gülzardur bizə.



Biz axirət ğəmin içün dünü gün yahu deyicək,
Həqdən yana yönəlicək dənizdə yol dardur bizə.

Dünya bir avratdur qarı, yoldan iltür necələri,
Sürün getsün ol əğyarı, anı sevmək ardur bizə.

Dünya haramdur xaslara, leykin həlaldur xamlara,
Bu dünyayı dost tutmazuz, ol dünyamuz vardur bizə.

Yunus aydur, Allah derüz, Allah ilə qapılmışuz,
Dərgahına yüz tutuban həman bir iqrardur bizə.

### 319

Bir əcaib eşq gəldi bəndə bu hal üstinə,
Gögsümi təxt edindi, oturdı can üstinə.

Sən sultansın, bən qulam, sən gülsin, bən bülbüləm,
Hökmün aləmə yetər, nə kim var qul üstinə.

Əvvəl bahar olıcaq, ağaclar tonanıcaq,
Görincə mədh edərlər bülbüllər gül üstinə.

Görürsin aşiqləri, gəzərlər xəlq içində,
Kişi var görməz gözi, oturmış yol üstinə.

Sözlər eşitdüm deyü, Yunus, nüktə etməgil,
Dəxi yegrək aydur, var, əl vardur əl üstinə.

### 320

Getdi bu qış zülməti, gəldi bahar yaz ilə,
Yeni nəbatlar bitdi, mövc urdı həp naz ilə.

Yenə mürğzar oldı, uş yenə gülzar oldı,
Tər nəğmə düzər oldı musiqidə saz ilə.

Xoş xəbər gəldi dostdan, yaratdı bağü bustan,
Elm oqır həzar dəstan bülbülləri raz ilə.

Kim görmişdür bayquşun gülistana girdügin,
Leyləklər zikr edəməz bir lətif avaz ilə.

Ya necə saqlar isən dürdanə göhər olmaz,
Kəklik kəkliklə uçar həmişə, baz baz ilə.

Əl quşı əldən-ələ, gül quşı güldən-gülə,
Bayquş viranə sevər, şahinlər pərvaz ilə.

Qanda ki bir gövdə var, kərkəslər anda üşər,
Tutilər evin şəkkər bulalar qəfəs ilə.

Hər şəxsün kəndi tuşın kəndüyə tuş eylədi,
Sadiqlər iqrar ilə, sufilər namaz ilə.

Cahil, münafiq, münkir cümlə əqlinə şakir,
Aşiqlər didar sevər, ariflər niyaz ilə.

Dərvişlik dedükləri dildə xəbər dəgüldür,
Həqq ilə həqq olana anda mənzil düzilə.

Bən dərvişin deyənlər, yalan də'vi qılanlar,
Yarın Həqq didarını görməyisər göz ilə.

Elmü əməl nə assı bir könül yıqdun isə,
Arif könül yapduğı bərabər Hicaz ilə.

Ulu divan qurıla, anda qullıq sorıla,
Bin təkəbbür verməyə bir ğərib nəvaz ilə.

Əgrilər əgri ilə, toğrılar toğrı ilə,
Yalan yalanı sevər, ğammazlar ğammaz ilə.



Kimi dükkanda baqar, kimi xoşluqlar sevər,
Kimi bir pula möhtac, kimisi canbaz ilə.

Qula nəsib degicək sultan əldən alamaz,
Zülqərneyn neylədi ya Xızrü İlyas ilə.

Görməzmisin Ədhəmi, təxtini tərk eylədi,
Həqq qatında xas oldı bir əski palas ilə.

Bu dünyayə inanma, dünyayı bənüm sanma,
Neçələr bənüm demiş gedərlər xam bez ilə.

Eşq yağmurı tamlası könül gögindən tamar,
Sevgü yeli götürür yağmurı ayaz ilə.

Yunus, imdi ğəm yemə, nedəm, nə qılam demə,
Gəlür kişi başına əzəldə nə yazıla.

**321**

Sən'ətün yegrəgi çün namaz imiş xoş peşə,
Namaz qılan kişidə olmaz yavuz əndişə.

Tanlacaq turı gəlgil, əlüni suya urğıl,
Üç gəz salavat vergil, andan baqğıl günəşə.

Allah buyruğın dutğıl, namazun qılub getgil,
Namazun qılmayınca zinhar varmağıl işə.

Evündə həlaluna beş vəqt namaz öğrətgil,
Öğüdün dutmaz isə yazuğı yoqdur, boşa.

Namaz qılmaz kişinün qazanduğı həp haram,
Bin qızılı var isə birisi gəlməz işə.

Namaz qılmayana sən müsülmandır deməgil,
Hərgiz müsülman olmaz, bağrı dönmişdür taşa.

Yunus, imdi namazun qomağıl, sən qıla gör,
Ansuzın əcəl irər, ömür yetişür başa.

**322**

Bir ay gördüm bu gecə qamu bürclərdən yücə,
Əsridi əqlüm, canum, bilməzəm halum necə.

Ol ayun şö'ləsindən aləm münəvvər oldı,
Sanasın kim açıldı uçmaqdan bir dəriçə.

Ol Mühəmməd nurıdur, Xəlilullah sirridür,
Könüldəki çırağı yandurdı ulu Xoca.

Müddəi bizi görməz gözinə girərsəvüz,
Gərəksə yüz gəz varsun Kə'bəyə, ulu həccə.

Aşiqlərün sözindən, qan-yaş aqar gözindən,
Bülbüllər söyləşicək növbət dəgməz turraca.

Qurı ağacı nedərlər, kəsüb oda yaqarlar,
Hər kim aşiq olmadı, bənzər qurı ağaca.

Yunusı ögən ögsün, Yunusa sögən sögsün,
Keçə suya salabdur, ta durur ertə gecə.

**323**

Dirlik necə idügin aydayın qıldan qıla,
Iraqa vü yaqına, həm xasü ama bilə.

Xasü am cümlə asi, dost qulıdur cümləsi,
Qullar yol verməyisər şahı kim göri bilə?!



Qissəm uzundur bənüm, netə dükədi biləm,
Qanğı bir əksüklügüm gətüri biləm dilə?

Sənlik-bənlik olıcaq ikilik ilə qalur,
İkilik tutan könül qaçan bir dürlü bula?!.

Dosta get, anun yolı könüllər içrə gedər,
Bu xəlq ilə irmədin girüb görgil könülə.

Yetmiş iki millətin ayağın öpmək gərək,
Anun içün mə'şuqə cümlə millətdə bilə.

Andan gerü dost ilə bilməzəm nolasını,
Şimdiyə dəgin ömrüm keçdi yoq sevdayilə.

Gerçək dostı sevənlər unutdılar kəndözin,
Qanda varurlar isə iltürlər bəni bilə.

Gər aşiq isən, Yunus, vüslət bulaydın bu gün,
Eşq necə qərar qılsun yarınki və'dəyilə?!

**324**

Dostun yüzini göricək artar gözlərümün nurı,
Uçmaq nəzərümə gəlməz, xud həzaran bin huri.

Dost gözümün nuridürür, bu könlümün seyridürür,
Bir dəm ansuz olmazam, canum anunladur diri.

Ol dost iledürür bənüm düni-güni münacatum,
Bən qandasam dost andadur, nedərəm Musa vü Turı?!

Ol dostdurur qamularun hacətini rəva qılan,
Var hacətün anda (yüri), yüzün dərgahına süri.

Əgər gerçək aşiq isən, key bəkləgil sirr sözini,
Bir sözdən oda atdılar miskin Həllaci-Mənsurı.

İşbu sözüm anlamayan aydum sana nəyə bənzər,
Anun kibi öküş adəm tağda yürür süri-süri.

Yunus, gerçək aşiq isən, ırılmadın toğrı turğıl,
Irılmadın toğrı varan ol görisərdür didarı.

**325**

Nə kim sənün cövrün ilə keçürmişəm bən günümi,
Eşqün odı çıqarısar ərşə dəgin dütünümi.

Eşqün odı düşdi bana, bən yanaram, nə ğəm sana,
Yanub içüm, kül olmışam, gözətmə taşra tonumı.

Yanar oda dersəm girəm, yatluğa baş irdürməyəm,
Yüzüm səndən döndürməyəm, çün sana tutdum yüzümi.

Gündüz halum görən kişi kafir isə göynür özi,
Kim nə bilür, bən bilürəm kim, necə keçər dünümi.

Qəsdüm budur şəhrə girəm, fəryadü fəğan qoparam,
Yenə dönübən qorqaram eşidə düşman ünümi.

Yunus aydur kim həqiqət, bən Məcnun olam aqibət,
Nola desəm Məcnun-sifət, xoş tutunuz məcnunumı.

**326**

Gerçək aşiq oldun isə gəl eşq kitabından oqı,
Can gözini açdun isə həqiqət bulasın Həqi.

Dəgmə alimlər oqımaz bu aşiqlər kitabını,
Zira ki yazımış anı, əzəl, əbəd, oldur baqi.

Aşiqlərün ərş yüzindən, mə'şuqı getməz gözindən,
Daima oqur sözindən, zira kim, oldurur fəqih.



Şeyxü danişməndü fəqih, könül yapan bulur Həqi,
Sən bir könül yıqdun isə, gərəksə var yüz yıl oqı.

Yunus, aşiq oldun isə, mə'şuqını buldun isə,
Mə'şuqını bulan kişi yoqdur hiç nəsnədən baqi.

**327**

İşbu vücud bir qəl'ədür, əql içində sultanı,
İşbu könül bir xəzinədür, eşq tutmış, bəklər anı.

Nəzər üzrə dil qapucı, cümləsi əqlə tapucı,
Əqldür işlər yapucı, eylər cümlə abad anı.

Əql başdan iş bitürür, nəzər gözdən baqar görür,
Əql könül içrə turur, ol üç xassə bəslər anı.

Əql təxt eylədi başı, şöylə bilür hər bir işi,
Dünya içrə aqil kişi kimsəyə dəgməz ziyanı.

Başdur bu vücudun şahı, başdur əqlün təxtgahı,
Qatı buşmağıl nigahı, buşudur əqlün düşmanı.

Əgər əqlə buşar isən, başun nəfsə qoşar isən,
Nəfs halinə düşər isən, ol başdağı əql qanı?

Əql getdi, buşu gəldi, əql evin buşu aldı,
İmdi sultan buşu oldı, gözə göstərməz cəhanı.

Əgər təmə' qılur isən, gördügine qalur isən,
Nəfs gümrah qılur isən nəzərün də oldı fani.

Nəzər getdi, təmə' bitdi, nəzər yerin təmə' dutdı,
Baqduq yerdə fitnə qopdı, işlədi nəfsani anı.

Nəzər dəxi gözdə olur, kimdə nə var baqar görür,
Təmə' ana düşman olur, gözdən savar ol nişanı.

İmandurur can çırağı, gövdədürür can turağı,
Kinədür imana yağı, gəlsə gedərür imanı.

Əgər kinə tutur isən, getdi səndən iman dəxi,
Billahi ol Tənri həqqi, yoqdur bu sözün yalanı.

Yunus, eşqün arta dursun, canun göynəb yana dursun,
Ustan eybün örtə dursun, oldur ustadlar sultanı.

**328**

Zehi dərya ki qətrədən görindi,
Nə dəryadur, nə qətrədür, gör indi.

Əcəb qətrə ki, dərya anda məxfi,
Bu məxfi sirri səndədür, sor indi.

Sana gəl, sən səni səndə bulı gör,
Sana baq, səndəki kimdür, gör indi.

Muradı on səkiz bin aləmün sən,
Bu ğəflət pəs sana kimdəndür indi?

Fəna ol kim, bulasın zövqi-vüslət,
Bu sözüm düşmidür sana, yor indi.

Sana səndən yaqındur əşri tap baq,
Yoran mülkini sultan ol yor indi.

Əgər ayinə bin ola, baqan bir,
Görən bir, görinən bin bir görindi.

Əsldə aşiqü mə'şuqə birdür,
Bu birdən gərçi kim yüz bin görindi.

Səladur kimə ğərq olmaq dilərsə,
Yunus, bu bəhrə ğəvvas ol gir indi.



## YUNUS ƏMRƏNİN ADI İLƏ BAĞLANAN ŞEİRLƏRDƏN SEÇMƏLƏR

**1**

Həqq müyəssər etsə varsam, gözəl Kə'bətullah, sana,
Baquban heyranun olsam, gözəl Kə'bətullah, sana.

Qara donuna bürünür, ərşə bərabər görünür,
Sana varmayan yerinür, gözəl Kə'bətullah, sana.

Qara donın heybət oldı, yürəgümə qorqu toldı,
Könlümün həsrəti gəldi, gözəl Kə'bətullah, sana.

Gümüşdən qapı açmışlar, mərmərlərin döşətmişlər,
Altın quşaq quşatmışlar, gözəl Kə'bətullah, sana.

Sağ yanunda altın oluq, Mövlam salsa olsam qonuq,
Bən ölürsəm, Həqq oyanıq, gözəl Kə'bətullah, sana.

Nurdandurur başta tacı, yetmiş bindür varan hacı,
Oldı yürəgümə acı, gözəl Kə'bətullah, sana.

Kə'bənün çevrəsi dağlar, didar görmüş sular çağlar,
Aşiq Yunus durmaz ağlar, gözəl Kə'bətullah, sana.

**2**

Əcəb bu bənüm canum azad olamı, ya Rəbb,
Yoqsa yedi tamuda yana qalamı, ya Rəbb?!

Əcəb bu bənüm halum, yer altında əhvalum,
Varub yatıcaq yerüm əqrəb dolamı, ya Rəbb?!

Can hülquma gəldükdə, Əzrayili gördükdə,
Ya canumı alduqda asan olamı, ya Rəbb?!

Allah olıcaq qazı, bizdən olamı razı,
Görüb Həbibi bizi, şəfi' olamı, ya Rəbb?!

Yunus qəbrə varduqda, Münkər Nəkir gəldükdə,
Bizə sual sorduqda dilüm dönəmi, ya Rəbb?!

3

Canum qurban olsun sənün yoluna,
Adı gözəl, kəndü gözəl Mühəmməd.
Gəl şəfaət eylə kəmtər quluna,
Adı gözəl, kəndü gözəl Mühəmməd.

Mö'min olanlarun çoqdur cəfası,
Axirətdə olur zövqü səfası,
On səkiz bin aləmün Mustafası
Adı gözəl, kəndü gözəl Mühəmməd.

Yedi qat gögləri seyran eyləyən,
Kürsinün üstində cövlan eyləyən,
Me'racında ümmətini diləyən
Adı gözəl, kəndü gözəl Mühəmməd.

Dört çaryar anun gögçək yarıdur,
Anı sevən günahlardan bəridür,
On səkiz bin aləmün sultanıdur,
Adı gözəl, kəndü gözəl Mühəmməd.

Sən Həqq peyğəmbərsin şəksüz, gümansuz,
Sana uymayanlar gedər imansuz,
Aşiq Yunus neylər dünyayı sənsüz,
Adı gözəl, kəndü gözəl Mühəmməd.

4

Sordum sarı çiçəgə, bənzün nədən sarıdur?
Çiçək aydur, ey dərviş, ahum dağlar əridür.

Yenə sordum çiçəgə, sizdə ölüm varmıdur?
Çiçək aydur, ey dərviş, ölümsüz yer varmıdur?!



Yenə sordum çiçəgə, qışın nerdə olursız?
Çiçək aydur, ey dərviş, qışın türab oluruz.

Yenə sordum çiçəgə, tamuya girərmisiz?
Çiçək aydur, ey dərviş, ol münkirlər yeridür.

Yenə sordum çiçəgə, uçmağa girərmisiz?
Çiçək aydur, ey dərviş, uçmaq adəm şəhridür.

Yenə sordum çiçəgə, gül sizün nə'nüz olur?
Çiçək aydur, ey dərviş, gül Mühəmməd təridür.

Yenə sordum çiçəgə, Adəmi bilürmisiz?
Çiçək aydur, ey dərviş, adəm bində biridür.

Yenə sordum çiçəgə, qırqları bilürmisiz?
Çiçək aydur, ey dərviş, qırqlar Allah yarıdur.

Yenə çiçəgə sordum, rəngi qandan alırsız?
Çiçək aydur, ey dərviş, ay ilə gün nurıdur.

Yenə sordum çiçəgə, boynun nədən əgridür?
Çiçək aydur, ey dərviş, qəlbüm Həqqə doğrudur.

Yenə sordum çiçəgə, atan-anan varmıdur?
Çiçək aydur, ey dərviş, bu nə əcəb sorudur?

Yenə sordum çiçəgə, sən Kə'bəyi gördünmü?
Çiçək aydur, ey dərviş, Kə'bə Allah evidür.

Yenə sordum çiçəgə, bağçana girsəm nola?
Çiçək aydur, ey dərviş, qoqla bəni geri dur.

Yenə sordum çiçəgə, sən siratı gördünmi?
Çiçək aydur, ey dərviş, cümlənün ol yolıdur.

Yenə sordum çiçəgə, gözün neçün yaşludur?
Çiçək aydur, ey dərviş, bağırcığum başludur.

Yenə sordum çiçəgə, Yunusu bilirmisin?
Çiçək aydur, ey dərviş, Yunus qırqlar yarıdur.

5

Yalancı dünyayə qonub köçənlər
Nə söylərlər, nə bir xəbər verürlər.
Üzərində türlü otlar bitənlər
Nə söylərlər, nə bir xəbər verürlər.

Toprağa ğərq olmış nazük tənləri,
Söyləmədin qalmış tatlu dilləri,
Gəlün duadan unutman bunları,
Nə söylərlər, nə bir xəbər verürlər.

Kimisi dördində, kimi beşində,
Kimisinün tacı yoqdur başında,
Kimi altı, kimi yedi yaşında,
Nə söylərlər, nə bir xəbər verürlər.

Kimisi bəzirgan, kimisi xoca,
Əcəl şərbətini içmək də güc a,
Kimi aq saqallu, kimi pir xoca,
Nə söylərlər, nə bir xəbər verürlər.

Yunus der ki, gör təqdirün işləri,
Dökülmişdür kirpikləri, qaşları,
Başları ucında hicə taşları,
Nə söylərlər, nə bir xəbər verürlər.

6

Dərdlü, nə ağlayub gəzərsin burda,
Ağladursa Mövlam yenə güldürür.
Necə dərdlü qondı köçdi burada,
Ağladursa Mövlam yenə güldürür.



Bu dərd bənüm munisümdür, yarımdur,
Ərşə çıqan bənüm ahu-zarımdur,
Səni ağladan lütf issi kərimdür,
Ağladursa Mövlam yenə güldürür.

Daim Həqqə cəmalunı dikə dur,
Zikr ilə Mövlayı dildən ana dur,
Qəhri kimə isə lütfi anadur,
Ağladursa Mövlam yenə güldürür.

Sevdaya salma şu ğərib başunı,
Aqıdur gözündən qanlu yaşunı,
Kərimdir, onarur qulun işini,
Ağladursa Mövlam yenə güldürür.

Yunus, sənin gözlərində çoq hal var,
Önündə uğrayub keçəcək yol var,
Gecə-gündüz dur da Mövlaya yalvar,
Ağladursa Mövlam yenə güldürür.

7

Dolab, neçün inilərsin? – Dərdüm vardur, inilərəm,
Bən Mövlaya aşiq oldum, anun içün inilərəm.

Bənüm adum dərdlü dolab, suyum aqar yalab-yalab,
Böylə əmr eyləmiş Çələb, anun içün inilərəm.

Bəni bir dağda buldılar, qolum-qanadum qırdılar,
Dolaba layiq gördilər, anun içün inilərəm.

Dülügərlər bəni yondı, hər əzam yerinə qondı,
Bu inildüm Həqdən gəldi, anun içün inilərəm.

Suyum alçaqdan çəkərəm, dönüb yüksəkdən dökərəm,
Görün şu bən nə çəkərəm, anun içün inilərəm.

Bən bir dağun ağacıyam, nə tatluyam, nə acıyam,
Bən Mövlaya duaçıyam, anun içün inilərəm.

Dərviş Yunus aydur, ahı göz yaşı dökər günahı,
Həqqə aşiqüm, vallahi, anun içün inilərəm.

**8**

Ey yarənlər, ey qardaşlar, nec' edəyin, nedəyin bən,
Sən bənüm qulum dəgülsin der olursa nedəyin bən?

Zəlil, mağbun olsa başum, anda hiç dinməyə yaşum,
Məhşər güni içüm-taşum nar olursa nedəyin bən?

Fəsad ilə dolu içüm, hey, xocam, bağışla suçum,
Key cəhənnəm bənüm içün yer olursa nedəyin bən?

Düni-güni ğeybət sözüm, hər dəm żina eylər gözüm,
Yarın Həqq qatında yüzüm qara olursa nedəyin bən?

Bən fəsad içində qaldum, Yunus aydur artdı dərdüm,
Anda varıcağız qəbrüm dar olursa nedəyin bən?

**9**

Vəqtünüzə hazır olun, əcəl varur gəlür bir gün,
Əmanətdür quşca canun, issi vardur, alur bir gün.

Neçə bin kərrə qaçarsın, yedi dəryalar keçərsin,
Pərvaz uruban uçarsın, əcəl səni bulur bir gün.

İşbu məclisə gəlməyən, anub nəsihət almayan,
Əlifdən beyi bilməyən oqır kişi olur bir gün.

Tutmaz olur tutan əllər, çürür şol söyləyən dillər,
Sevüb qazanduğun mallar varislərə qalur bir gün.

Yunus Əmrəm bunı söylər, eşqün dəryasını boylar,
Şol yücə köşklər, saraylar viran olur qalur bir gün.



**10**

Allah evi ziyarətdür, bən anda varmaq istərin,
Mühəmmədün gözəl nurın gözümlə görmək istərin.

Hacılar dəvə qatarlar, qum dənizinə yatarlar,
Taşı Şeytana atarlar, bən anı urmaq istərin.

Yedi tolanan barısın görməz cəhənnəm surısın,
Döşürüb nəfsüm çərisin bən anı qırmaq istərin.

Əcəb Allahun işinə, yazmış qübbənün başına,
Həcərül-əsvəd taşına yüzümi sürmək istərin.

Yunus aydur sözüm həqdür, hiç irizqüm-malum yoqdur,
Çoqdur günahum, çoqdur, boynumdan ırmaq istərin.

**11**

Yoqdur bəndə əməl taət, bən nedəyin, neyləyəyin?
Qopıcaq ruzi-qiyamət bən nedəyin, neyləyəyin?

Dost bana sual edicək, əqlüm başumdan gedicək,
Hicab dərdi ğərq edicək bən nedəyin, neyləyəyin?

Həlalinə ola hesab, haramına ola əzab,
Asiyə olıcaq iqab bən nedəyin, neyləyəyin?

Yetmiş bin zəbani yidə, tamuyı həşrdə ilədə,
Mücrimlərə heybət edə, bən nedəyin, neyləyəyin?

Bir gəz cəhənnəm silkinə, asilərə edə kinə,
Ya Rəbb, iricək ol günə bən nedəyin, neyləyəyin?

Aşiqlər məqsudə irə, ariflər dost yüzin görə,
Şöylə mücrim, yüzi qarə bən nedəyin, neyləyəyin?

Yunus Əmrəm, dərdün qatı, xeyrə keçməz bir taəti,
Olmazsa Həqq inayəti bən nedəyin, neyləyəyin?

## 12

İnilərüm dünü gün, dərtlü olanlar inilər,
Eşidən inlədügüm sayru vü sağlar inilər.

Bu inildüm yarası dostum əlindədür bənüm,
Bu həlavətdən dadan dərtlü damaqlar inilər.

Görməmisin suyı kim dost yüzini görmək içün,
Dünü gündüz durmayub aqaru çağlar inilər.

Göstərür kəndözini, pünhana vermiş özini,
Görən o dost yüzini gözləri ağlar, inilər.

Hər kimə bir gəz görünsə pərdədən sahibcəmal,
Qaynadur aşiqlərün bağrını, toğrar inilər.

Yarəmüz dostdan olub, yürürüz məstan olub,
Şəhr içi dəstan olub hər aşiqlər inilər.

Bülbüləm, gülzarə qarşu zari qılduğum içün,
Eşidüb əhvalümi bağça vü bağlar inilər.

Bu biçarə *Miskin* Yunus yarəlidür, Həqq bilür,
Hər sabah yarəsini şeyxinə söylər inilər.

## 13

Xocam, aşiq olanlarun işi ah ilə zar olur,
Həsrətindən ol mə'şuqun gözi yaşı bınar olur.

Düni güni qılur zari, yə'ni görmək dilər yari,
Eşitməzlər bu xəbəri, eşqsüzlər bixəbər olur.

Aşiq isən didarına, qoma bu güni yarına,
Girənlər eşq bazarına kəndözindən bizar olur.



Tərk eylə sən bənligüni, anun eşqində qıl tələb,
Bu eşq içində olanun qan bahası didar olur.

Qanı gerçək aşiq, qanı, gəlün istəyəlüm anı,
Biçarə Yunusun canı dost yolına isar olur.

## 14

Ol aləm fəxri Mühəmməd nəbilər sərvəridür,
Ver səlavat eşq ilə, ol günahlar əridür.

Həqq anı ögdi yaratdı, sevdi "həbibüm" dedi,
Yer yüzində cümlə çiçək Mustafanun təridür.

Cəbrayil də'vət qılınca me'raca Mühəmmədi,
Me'racında dilədügi ümmətinün varıdur.

Sən ana ümmət olı gör, o səni məhrum qomaz,
Hər kim anun ümmətidür, səkiz cənnət yeridür.

Hər kim anun sünnət ilə fərzini qaim tutar,
Nə deyəm ki, aqibət son hesabdan bəridür.

Suçlu-suçsuz, günahkar şəfaət andan umar,
Ol cəhənnəmdə yananlar münkirün inkarıdur.

Yunus Əmrəm işbu sözi can içində söylədi,
Söyləyən biçarə Yunus, Tapduq Əmrəm sirridür.

## 15

Yenə seyr eylədi könlüm, dostun cəmalın arzular,
Hicrə qatlanımaz könül, dostun cəmalın arzular.

Hər kim uğrarsa bu dərdə bulur himməti ərdə,
Açılı vericək pərdə dostun cəmalın arzular.

Kim ki gerçək mürid ola, bel bağlayub gəlsün yola,
Şol yürəkdə ki dərd ola, dostun cəmalın arzular.

Dostum bəni dəlü qıldı, əqlümi-fikrümi aldı,
Xəyali gözümdə qaldı, dostun cəmalın arzular.

Əvvəl derdi könlüm bana, atlar, donlar gərək bana,
Mövlam bir dərd verdi bana, dostun cəmalın arzular.

Yunusun sözi yerincə, inilər canın verincə,
Ta ölüb sinə girincə dostun cəmalın arzular.

**16**

Nola gəlsən şimdən gerü fəsadı tərk etsən, könül,
Gah ağlasan günahuna, gah qənaət etsən könül.

İşün-gücün fəsad ilə, yaqdı bəni hirs odilə,
İltsən yarı bir uğurdan yanar oda atsan, könül.

Neçə bir bən sana uyam, özümi bəlaya qoyam,
Nola gəlsən sən də bənüm ögüdümi dutsan, könül.

Dünyə xəlqün düşmanıdur, məqsud ol canlar canıdur,
Bilün ki, dünyə fanidür, dünyəyi tərk etsən, könül.

Yunus Miskin qalmaz cana, verür canını qurbana,
Gəlsən sığınsan Sübhana, toğrı yola getsən, könül.

**17**

Anub qiyamət günini ağlaşalum ol gün içün,
Ol gün məlamət günidür, ağlaşalum ol gün içün.

Ol gündə yerlər yarıla, cümlə ölənlər dirilə,
Cümlə günahlar sorıla, ağlaşalum ol gün içün.



Ol gündə gög çatlayısar, insan necə qatlanısar,
Ol gündə kim qorqmayısar, ağlaşalum ol gün içün.

Ah o günün qorquları qoca qılur mə'sumları,
Necə olur mücrimləri, ağlaşalum ol gün içün.

Ol gün qatı əfğan ola, erkək-dişi üryan ola,
Cümlə cigər büryan ola, ağlaşalum ol gün içün.

Ey Yunus Əmrə, gir yola, hal bilməz, qardaş nə ola?
Məgər dərman Həqdən ola, ağlaşalum ol gün içün.

**18**

Ey bənüm qutsuz nəfsüm, qanda varasın bir gün,
Əcəl avlayub yudar, ələ girəsin bir gün.

Gəlüb gögsünə qona, dutuşub canun yana,
Bir qədəh şərbət suna, içüb qanasın bir gün.

Görməgə gələnləri, xatirün soranları,
Sevgüli yarənləri görməz olasın bir gün.

Yarənlərün gələlər, səni tə'cilləyələr,
Soyalar tonlarunı, üryan olasın bir gün.

Tap timar eylə tənə, yaraq eylə bu cana,
Şol yılana, çıyana nəsib olasın bir gün.

Münkirü Nəkir gələ, hallərün düşvar ola,
Dilüncə sual sora, cəvab verəsün bir gün.

Yunus Əmrəm, nedəsin, qaçub qanda gedəsin?
Ərənlər söhbətinə gəlməz olasın bir gün.

19

Biz dünyadan gedər olduq, qalanlara səlam olsun,
Bizüm içün xeyir-dua qılanlara səlam olsun.

Əcəl bükə belümüzi, söylətməyə dilümüzi,
Xəstə ikən halumuzi soranlara səlam olsun

Tənüm ortaya açıla, yaqasız könlək biçilə,
Bizi bir arı vechilə yuyanlara səlam olsun.

Əzrayil alur canumuz, qurur tamarda qanumuz,
Yuyıcağaz kəfənümüz saranlara səlam olsun.

Gedər olduq dostumuza, irəmədük qəsdümüzə,
Namaz içün üstümüzə turanlara səlam olsun.

Sözdür söylənür araya, kimsə döyməz bu yaraya,
İltüb bizi məqbərəyə qoyanlara səlam olsun.

Bunda hər gələnlər gedər, hərgiz gəlməz yola gedər,
Bizüm halumuzdan xəbər soranlara səlam olsun.

Aşiq oldur Həqqi sevə, Həqq dərdünə qıla dəva,
Bizüm içün xeyir-dua qılanlara səlam olsun.

Aşiq Yunus söylər sözi, qan-yaş ilə toldı gözi,
Bilməyən nə bilsün bizi, bilənlərə səlam olsun.

20

Sən bu yalancı dünyada şöylə qalammı sanursın?!
Şöylə ğafil gəzmək ilə Həqqi bulammı sanursın?!

Bir obaya avan qonar, bir neçələr sinək sanur,
Ölüm avan işi kibi sinəm qalammı sanursın?!



Bir kişi qul satun alur, qulluq edər azad bulur,
Qulluq etsənə xocana, məhrum qalammı sanursın?!

Bir kişi dərtlü olursa yürür dərdə dərman arar,
Əzrayil gəlicəgiz dərdə dərman bulammı sanursın?!

Yunus Miskin, bu ögidi sən sana versən yeg idi,
Şimdi zaman adəmisi ögit alamı sanursın?!

21

İçün-taşun murdar ikən eşq neyləsün sənün ilə?
Könlün gözü uyur ikən eşq neyləsün sənün ilə?

Aşiqlərə yoldaş olub, sadiqlərə yar olmadun,
Ölməzdən öndən ölmədün, eşq neyləsün sənün ilə?

Dünyə gözün rövşən edüb, könül gözün kor eylədün,
Zülmət dolıcaq könlünə eşq neyləsün sənün ilə?

Bizə gerçək dərviş gərək, cəhan doldı də'va ilə,
Yalan də'va edər isən, eşq neyləsün sənün ilə?

Dərvişligi sanma həmən surət düzmək ilə olur,
Dildə isə sənün işün, eşq neyləsün sənün ilə?

Yunus Əmrə, xoş dərd ilə surə gör gəl dövranunı,
Doğrı yola getməz isən, eşq neyləsün sənün ilə?..

22

Yenə yaz günləri gəldi, söylə, bülbülcügüm, söylə,
Cümlə çiçəklər zeyn oldı, söylə, bülbülcügüm, söylə.

Qış çıqıcaq irdi bahar, canunı ğəflətdən uyar,
Cənnətə döndi hər diyar, söylə, bülbülcügüm, söylə.

Yaşil ton geydi ağaclar, pervaz urub uçar quşlar,
Nəfəsün canlar bağışlar, söylə, bülbülcügüm, söylə.

Eşq ilə eyləgil cuşı, gedər könlündən təşvişi,
Çıquban gülzara qarşı söylə, bülbülcügüm, söylə.

Bülbül aşiqdür gülə, aşiqün halın kim bilə?
Gülə qarşu xoş eşq ilə söylə, bülbülcügüm, söylə.

Qüdrət xəznəsi açıldı, aləmə rəhmət saçıldı,
Hüllə tonları biçildi, söylə, bülbülcügüm, söylə.

Şeyxüm andadur, bən bunda, canum qərar qılmaz təndə,
Zarılığım dünü gündə söylə, bülbülcügüm, söylə.

Qanadun aça bilürsin, açuban uça bilürsin,
Dəryalar keçə bilürsin, söylə, bülbülcügüm, söylə.

Yuvandan yavrun aldılar, səni divanə qıldılar,
Zaman böylə olur dedilər, söylə, bülbülcügüm, söylə.

Keçdi ya ömrümün varı, qor gedərsin bu gülzarı,
Yunusun munisi, yarı, söylə, bülbülcügüm, söylə.

23

Durdum vardum sinlərə, dua qıldum bunlara,
Gördüm kəfənlər yatur bulaşuban qanlara.

Kimi qız, kimi gəlin, dünyadan çəkmiş əlin,
Gördüm ölənlər halin, deyəm eşidənlərə.

Yatur şeyxü danişmən, çürümiş sünükü tən,
Yoldaş olursa iman ya nə ğüssə bunlara?!

Yatur yigidü qoca, nə ertə bilür, nə gecə,
Nə qapu var, nə baca, girmiş goristanlara.



Gördüm oğlancuqları uçmaqdadur canları,
Nə sorı var, nə hesab, girmiş gülüstanlara.

Aşiq Yunus gör nedər, dünyadan köçmiş, gedər,
Çağıru namazadur, səladur gələnlərə.

24

Dostdan xəbər kim gətürdi, sorun səhər yellərinə,
Həqq Çələbüm bititməsin ayrulığın qullarına.

Vay bu ayrılıq fəraqı, dünya kimə qaldı baqi,
Həqq Çələbüm olmış saqi, qədəh sunar qullarına.

Ol qədəhün içi tolı, anı içən olur dəli,
Ol xocanun talibləri bel bağlamuş yollarına.

Xocanun talibi çoqdur, hiç bundan kəmtəri yoqdur,
Şunun (kim) mürşidi Həqdür, uymaz nəssün allarına.

Nəfsünə müxalif kişi turmaz aqar gözi yaşı,
Bunda nəfsə uyan kişi talmaz Kövsər göllərinə.

Kövsər hövzına talanlar ölməzdən öndin ölənlər,
Nəfsini düşman bilənlər qonar Tuba tallarına.

Tuba talından uçanlar, yücə məqamlar keçənlər,
"Şəraben təhur" içənlər banmaz dünya ballarına.

Bu mə'nidən kimsə almaz, anda varan yenə gəlməz,
Bu dünyayə kimsə qalmaz, gələn köçər ellərinə.

Ey Miskin Yunus neyləsün, dərdini kimə söyləsün,
Bir dəm təcrübə eyləsün bu dünyanun hallərinə.

**25**

Sən bu cəhan mülkinə gəldüm gəlmədüm demə,
Dut övliya ətegin, zinhar, əlündən qoma.

Bil ki, bu ömür keçdi, bir neçə yılun aşdı,
Eşqdür qaynadı-taşdı, yenməzsin, bəgüm, demə.

Eşq biqərar dənizdür, canunı eşqə yüzdür,
Dənizdə bəhri vardur, yüzdüm yüzmədüm demə.

Key dərin dənizdürür, bir zəman cövlan urur,
Bir gün gəmi ğərq olur, bildüm bilmədüm demə.

Yerdəki xəlaiqlər, dənizdəki balıqlar,
Yunus, dəniz mövcinə taldum talmadum demə.

**26**

Adum-adum iləri, beş aləmdən içəri,
On səkiz bin hicabı keçdüm bir tağ içində.

Yetmiş bin hicab keçdüm, gizlü pərdələr açdum,
Ol dost ilə buluşdum, gördüm bir dağ içində.

Gözlər kibi görmədüm, söz kibi söyləşmədüm,
Musiləyin münacat etdüm bir dağ içində.

Göglər kibi gurladum, yellər kibi inlədüm,
Sular kibi çağladum, aqdum bir dağ içində.

Bir döşək döşəmişlər, nur ilə bəzəmişlər,
Dedüm bu kimin ola, sordum bir dağ içində.

Ayrılmadum pirümdən, ayrılmadum şeyxümdən,
Eşqdən bir qədəh aldum, içdüm bir dağ içində.



Vardum, iləri vardum, lövhi əlümə aldum,
Ayətlərin oqıdum, yazdum bir dağ içində.

Qəlbdən böyük dağ olmaz, ol Allaha doyulmaz,
Söhbətinə qanılmaz, irdüm bir dağ içində.

Açdum Məkkə qapusın, duydum ol dost qoqusın,
Ərənlərün həpisin gördüm bir dağ içində.

Yunus aydur gəzərəm, dost elidür bazarum,
Ol Allahun didarın gördüm bir dağ içində.

**27**

Şol cənnətün ırmaqları aqar Allah deyü-deyü,
Çıqmış İslam bülbülləri, ötər Allah deyü-deyü.

Salınur Tuba dalları, Qur'an oqır həm dilləri,
Cənnət bağınun gülləri qoqar Allah deyü-deyü.

Kimi yeyüb kimi içər, həp mələklər rəhmət saçar,
İdris nəbi hüllə biçər, biçər Allah deyü-deyü.

Həp nurdandur dirəkləri, gümüşdəndür yapraqları,
Uzanduqca budaqları bitər Allah deyü-deyü.

Aydan arıdur yüzləri, miskü ənbərdür sözləri,
Cənnətdə huri qızları gəzər Allah deyü-deyü.

Həqqə aşiq olan kişi aqar gözlərinün yaşı,
Pürnur olur içi – taşı, söylər Allah deyü-deyü.

Nə dilərsən Həqdən dilə, qılavuz ol doğru yola,
Bülbül aşiq olmış gülə, ötər Allah deyü-deyü.

Açıldı göglər qapusı, rəhmətlə doldı həpisi,
Səkiz cənnətün qapusı açar Allah deyü-deyü.

Miskin Yunus, var yarına, qoma bu güni yarına,
Yarın Həqqün didarına varur Allah deyü-deyü.

**28**

Arayı-arayı bulsam izüni,
İzinün tozına sürsəm yüzümi,
Həqq nəsib eyləsə görsəm yüzüni,
Ya Mühəmməd, canum arzular səni.

Bir mübarək səfər olsa da getsəm,
Kə'bə yollarında qumlara batsam,
Xub cəmalun bir gəz düşdə seyr etsəm,
Ya Mühəmməd, canum arzular səni.

Zərrəcə qalmadı könlümdə hilə,
Sidq ilə girmişəm bən bu Həqq yola,
Əbubəkr, Ömər, Osman da bilə,
Ya Mühəmməd, canum arzular səni.

Əli ilə Həsən, Hüseyn anda,
Sevgüsi könüldə, məhəbbət canda,
Yarın məhşər güni olur divanda,
Ya Mühəmməd, canum arzular səni.

Ərəfat dağıdur bizüm dağumuz,
Anda qəbul olur bizüm duamuz,
Mədinədə yatar peyğəmbərümüz,
Ya Mühəmməd, canum arzular səni.

Yunus mədh eylədi səni dillərdə,
Dillərdə, dillərdə, həm könüllərdə,
Ağlayu-ağlayu ğürbət ellərdə,
Ya Mühəmməd, canum arzular səni.



**29**

Sən bunda ğəribmi gəldin, neçin ağlarsın, bülbül, hey?
Yorulub izmi yanıldun, neçin ağlarsın, bülbül, hey?

Qarlı dağlarımı aşdun, dərin ırmaqlarmı keçdün?
Yarundan ayrımı düşdün, neçin ağlarsın, bülbül, hey?

Hey, nə yavuz inilərsin, bənüm dərdüm yenilərsin,
Dostı görməkmi dilərsin, neçin ağlarsın, bülbül, hey?

Qəl'əli şəhrünmi yıqıldı, ya namü arunmı qaldı,
Ğürbətdə yarunmı qaldı, neçin ağlarsın, bülbül, hey?

Gülüstanlarda yaylarsın, tazə gülləri yiylərsin,
Yavlaq zarılıq eylərsin, neçin ağlarsın, bülbül, hey?

Uyqudan gözün oyandı, oyandı qana boyandı,
Yandı şol yürəgüm yandı, neçin ağlarsın, bülbül, hey?

Noldu şu Yunusa noldu, eşqün dəryasına taldı,
Yenə baharıstan oldı, neçin ağlarsın, bülbül, hey?

**30**

Dağlar ilə taşlar ilə çağırayın, Mövlam, səni,
Səhərlərdə quşlar ilə çağırayın, Mövlam, səni.

Su dibində mahi ilə, səhralarda ahu ilə,
Abdal olub yahu ilə çağırayın, Mövlam, səni.

Gög yüzində İsa ilə, Tur tağında Musa ilə,
Əlindəki əsa ilə çağırayın, Mövlam, səni.

Dərdi öküş Əyyub ilə, gözi yaşlu Yə'qub ilə,
Ol Mühəmməd məhbub ilə çağırayın, Mövlam, səni.

Həmdü şükri Allah ilə, vəsfi "qul huvəllah" ilə,
Daima zikrüllah ilə çağırayın, Mövlam, səni.

Bilmişəm dünya halını, tərk etdüm qiylü qalını,
Baş açuq, ayaq yalını çağırayın, Mövlam, səni.

Yunus oqır dillər ilə, ol qumrı bülbüllər ilə,
Həqqi sevən qullar ilə çağırayın, Mövlam, səni.

## 31

Şükür, minnət ol Allaha, könlümüzi şad eylədi,
Qəfəsdəği quşca canum qayğudan azad eylədi.

Ol eşqinün bir zərrəsi bıraqdı Mənsur könlinə,
Taşdı "Ənəl-həqq" deyübən çağırdı fəryad eylədi.

Gülə-gülə gəldi dara, eylədilər yara-yara,
Aşiq idi mə'şuqına, xoş dadını dad eylədi.

Ol xuyı xoş, həm buyı xoş, həm güli həm reyhanı xoş,
Allah ana dostum dedi, adın Mühəmməd eylədi.

Yunus, sənün mə'şuqüni sevdi yaratdı ol ğəni,
Boyu əlif, qaşları nun, gözlərini şad eylədi.

## 32
### *Merac*

Mühəmmədə bir gecə Çələbdən endi Buraq,
Cəbrayil aydur, xocam, me'racə qığırdı Həqq.

Aç kəndünə cinanun, behiştü didar sənün,
Səni oqur Sübhanun, nə yatursın, qıl yaraq.



Turdı me'rac qəsdinə, yüridi abdəstinə,
Səcdə qıldı dostına, demədi yaqın-ıraq.

Getdi ibril həzrəti, gətürdi Buraq atı,
Nurdan idi xəl'əti, gözi göhər, yüzi aq.

Qədəm bir taşa basdı, taş qopdı bilə vardı,
Kaf ya mübarək dedi, şöylə qaldı müəlləq.

Taş aydur gələsini, bir qədəm basasını,
Rəsul aydur gəlürəm, buyurur isə ol Həqq.

Göglərə xəbər oldı, yer-gög şadılıq toldı,
Aydurlar Əhməd gəldi, bəzəndi səkiz uçmaq.

Gör Mühəmməd neylədi, gögləri seyr eylədi,
Ümmətini toyladı ərşə hənuz varıcaq.

Çün keçdi fələkləri ün gəldi kim, gəl bəri,
Qaldurdum pərdələri, həmən cəmaluma baq.

Didarum sana əyan, göstərəm bəllü bəyan,
En Buraqdan, ol yayan, ərşümə bas bir ayaq.

Fəriştələr gəldilər Buraqdan endürdilər,
Nə'lini döndürdilər, ol dəm yüridi yayaq.

Üveys yerindən turdı, ərşdə nə'lin döndürdi,
Mühəmməd anı gördi, vüsalə döndi fəraq.

Çün dost dosta qavuşdı, yüz bin kəlam danışdı,
Ümmətiyçün çalışdı, oldur rəsuli-mütləq.

Me'racdan döndi yenə, gerü gəldi evinə,
Gəldi gördi hənuz kim döşəcigi ısıcaq.

Neçə bin yıllıq yola bir dəmdə vara gələ,
Yunus aydur kim ola, Mühəmməddür ol mütləq.

Ümmətə ümmət deyən, ümmət qeydini yeyən,
Əgər ümməti isən, de İslam dininə həqq.

### 33
### *Münacati-Mühəmməd*

Ya Rəbbi Səttarül-üyub, səndən dilərəm ümmətüm,
Ya Həyyü Ğəffaruz-zünub, səndən dilərəm ümmətüm.

Bu dəm münacat eyləyüb, bin dürlü hacət söyləyüb,
Özüm məlamət eyləyüb səndən dilərəm ümmətüm.

Yücə qıldum himmətümi kim, qurtaram ümmətümi,
Əsirgəgil bən yetimi, səndən dilərəm ümmətüm.

Atam-anam istəməzəm, dünya qayğusın yeməzəm,
Ümmətüm əldən qomazam, səndən dilərəm ümmətüm.

Yüzümü yerə uruban, qapulara toğru turuban,
Şükranə canum verübən səndən dilərəm ümmətüm.

Bu dəm ki toğdum anadan, keçdüm bu fani xanadan,
Əl yumışam viranadan, səndən dilərəm ümmətüm.

Şimdi ki başum qalduram, gözüm yaş ilə tolduram,
Ahum cəhanə bildürəm, səndən dilərəm ümmətüm.

Ümmətim içün gəlmişəm, himməti yücə qılmışam,
Milkü canə gəlməmişəm, səndən dilərəm ümmətüm.

Çün bu qonağa qonmışam, himmət atına binmişəm,
Ümmət odına yanmışam, səndən dilərəm ümmətüm.



Gəlməmişəm uçmağ içün, ya hurilər qucmağ içün,
Şol bir avuc toprağ içün səndən dilərəm ümmətüm.

Adum Mühəmməd verəsin, dərdüm yenə sən biləsin,
Ən'amü ehsan qılasın, səndən dilərəm ümmətüm.

Qatlandum ümmət gücinə, baqmazam ayruq ucına,
Qalmağıl ümmət suçına, səndən dilərəm ümmətüm.

Ol Turi-Sina həqqiçün, Məkkə vü Mina həqqiçün,
Şəhri-Mədinə həqqiçün səndən dilərəm ümmətüm.

Sənsin Əhəd, sənsin Səməd, ehsanına yoqdur ədəd,
Bir Yunusa irgür məded, səndən dilərəm ümmətüm.

### 34
### *Cəvabi-Xuda*

Lütf edübən aydur Xuda, ümmətünə çəkmə cəfa,
Bu dəm sana qıldum əta, bağışladum ümmətüni.

Ümməti bəndən dilədün, himmət qılıcın bilədün,
Muştuluq olsun aıydun, bağışladum ümmətüni.

Qaldur başunı, ey Həbib, dərdlülərə sənsin təbib,
Ümmətüni etmə ğərib, bağışladum ümmətüni.

Adunı Əhməd vermişəm, Şeytanı səndən sürmişəm,
Küffarı fəda qılmışam, bağışladum ümmətüni.

Dərdlülərə verdüm dəva, hacətüni qıldum rəva,
Bəni sevən səni sevə, bağışladum ümmətüni.

Döndər yüzüni ərşümə, döşəndi döşək fərşümə,
Gəl bari dura qarşuma, bağışladum ümmətüni.

Ümmətüni həp köçürəm, tezçəg siratı keçürəm,
Kövsər şərabın içürəm, bağışladum ümmətüni.

Neçə gözin yaş edəsin, həm bağrunı baş edəsin,
Ən'amunı faş edəsin, bağışladum ümmətüni.

Ey yerü gögün sərvəri, bilsün səni insü pəri,
Axırzaman peyğəmbəri, bağışladum ümmətüni.

Lütf edübən aydur qəni, asilərə verdüm səni,
Səndən dönəm sanma bəni, bağışladum ümmətüni.

Ümmətün oda yaqmayam, suçın başına qaqmayam,
Sənün sözündən çıqmayam, bağışladum ümmətüni.

Sən yetimlərin başısın, yanmış cigərlər aşısın,
Ümmətünün yoldaşısın, bağışladum ümmətüni.

Yüz bin şükür, sultanumuz, yenə sevindi canumuz,
Çünki dedi Sübhanumuz, bağışladum ümmətüni.

Yunus Əmrəm der zisəfa Peyğəmbəründür müctəba,
Çün Həqq dedi, ya Mustafa, bağışladum ümmətüni.

***



## RİSALƏTUN-NUSHİYYƏ
## ("Nəsihətnamə")

Padişahun hikməti gör neylədi,
Odü su, toprağu yelə söylədi.

Bismillah deyüb gətürdi toprəği,
Ol arada hazır oldı ol dəği.

Toprağ ilə suyı bünyad eylədi,
Ana Adəm deməgi ad eylədi.

Yel gəlüb ardınca dəbitdi anı,
Andan oldı cismi-Adəm, bil bunı.

Od dəxi gəldi vü qızdırdı anı,
Çünki qızdı, cismə ulaşdı canı.

Surətə can girməgə fərman olur,
Padişah əmri ana dərman olur.

Surəti can girdi, pürnur eylədi,
Surət daxi canı məsrur eylədi.

Həmdü şükr etdi, dedi: ey zülcəlal,
Bin bənüm bigi yaratsan nə mühal.

Toprağ ilə bilə gəldi dört sifət:
Səbrü eyü xu təvəkkül məkrəmət.

Suyilə gəldi bilə dört dürlü hal:
Ol səfadur, həm səxa, lütfü vüsal.

Yel ilə gəldi bilə bil dört həvəs:
Oldurur kizbü riya, tizliki nəfəs.

Od ilə gəldi bilə dört dürlü dəd:
Şəhvətü kibrü təmə' birlə həsəd.

Can ilə gəldi bilə uş dört xisal,
İzzətü vəhdət, həya, adabi-hal.

## Fi tərifil əql
### *(Ağlın tərifi)*

Əql padişahun qədimlığı pərtovindəndür. Əql dəxi üç dürlüdür: biri əqli məaşdur; dünya tərtiblərin bildürür. Biri də əqli-məaddur; axirət əhvalın bildürür. Birisi də əqli-küllidür; Allahü-təala mə'rifətin bildirür. İman padişahun hidayəti nurundandur; iman da üç dürlüdür; biri elmül-yəqindür və biri eynül-yəqindür və biri həqqül-yəqindür. Əmma ol iman kim elmül-yəqindür – əqldə yerlüdür və ol iman ki eynül-yəqindür – könüldə yerlüdür və ol iman həqqül-yəqindür – canda yerlüdür. Can ilə olan iman can ilə bilə gedər. Uçmaq – padişahun fəzli pərtovindəndür. Tamu – padişahun ədli pərtovindəndür. Topraq – padişahun nurı pərtovindəndür. Su – padişahun həyatı pərtovindəndür. Yel – ol padişahun heybəti pərtovindəndür. Od – padişahun xişmi pərtovindəndür. Toprağ ilə su uçmaqda yerlüdür. Od ilə yel tamuda yerlüdür. Od ilə və yel ilə gələn toquz kişidür ki, bunlar binbaşlarıdur; binər ərləri vardur, kimə gəlsələr kəndü məqaminə ilətməg yarağində olurlar. Toprağ ilə suyla gələn – on üç kişidür; bunlar dəxi binbaşlarıdur; binər ərləri vardur. Kimə gəlsələr, uçmağa dartarlar. Can ilə gələn dəxi dört kişidür; bunlar can ilə gəldi, can ilə gedər. Bunlarun dəxi binər ərləri vardur. Bunlarun ilə olanlar didara müstəğrəq olasılardur. Toprağ ilə, suylə gələn uçmaqda olasılardur. Od ilə, yel ilə gələn tamuda qalasılardur. Can ilə bilə gələn – həzrətdə müstəğrəqdür. İmdi bilgil ki, qanğı bölükdənsin, qanğısınun sözin dutarsan, anun böligindənsin; vallahu ə'ləm.



## Dastani-ruhü əql və məyatəlləqü bihima minal əhval
### *(Ruh, ağıl və onlarla bağlı əhvalın dastanı)*

Gəl imdi dinlə sözi şərh edəyin,
Birin-birin anı sana deyəyin.

Çü şahun hikməti əqdəmdən idi,
Bu bir qaç sözə şərh Adəmdən idi.

Bu müxtəsər cəhan iki cəhanca,
Dügəli baqar isən yüz bin anca.

Əzim cəhandurur könül cəhanı,
Səni izlər isən bulasın anı.

Xəbər verisərəm nəfsün əlindən,
Ümidün var isə gedəsin andən.

İki sultandurur sana həvalə,
Dilər hər birisi kim mülkət alə.

Biri rəhmanidür can həzrətindən,
Biri şeytanidür ğərəz yetindən.

Gör imdi kim, səni kimə taparsun,
Kimə qapu açub kimə yaparsun.

On üç bin ərdürür rəhmani ləşkər,
Zəbunsız kimsələrdür key ərənlər.

Toquz bindür bu nəfsün həşəratı,
Müdam əyərlüdür bunlarun atı.

Nişanları bu kim, yüzləri qara,
Bu nifrinü şikayət qanda vara.

Saqınğıl kim, bulardan olmayasın,
Ki nəfs divanına yazılmayasın.

Qo nəfsün dilegin can bəslər isən,
Yerün nur, can sözini əslər isən.

Təkəbbür nəfsdür, sultanı bilməz,
Çərisində eyü dirlik dirilməz.

Key arı can gərək şəh həzrətində,
Irılmadın tura sultan qatında.

Qədimdən nəfsdür sultana asi,
Bir orğandur həman anun bəhasi.

Bu nəfs oğlanları toquz kişidür,
Nifaqü şirk anlarun işidür.

Ulu oğlı təmə' eyü iş etməz,
Cəhan mülki anun olursa yetməz.

Bin ər tonlu tururlar qapusında,
Əsir etmiş cəhanı tapusında.

Sevər dünyayı, çün oldur imanı,
Susuzdur dünyəyə, qanmaz rəvanı.

Nəyi sevər isən, imanun oldur,
Necə sevməyəsin, sultanun oldur.

Sevündür bil səni səndən ilədən,
Nə sevər isən, ol yanəyə yidən.

Ki, sevdügündən ötə mənzilün yoq,
Əsil mə'ni budur, söz, kələci çoq.



Bu yolda də'vi sığmaz, mə'ni gərək,
Nəyi kim sevər isən, anı gərək.

Buçuq gün turmayan əqlin qatında,
Nə layiq ola şahun həzrətində.

Görəm bir şəxs gəlür bənzi sararmış,
Dutulmış dili, əqli yavı varmış.

Gəlüb əqlün önində tapu qıldı,
Həqə şükr eylədi, çün anı buldı.

Əgər sən əql isən, gəl bəni gör der,
Timar eylə, bənüm dərdümə ir der.

Ayıtmadun görəyin bir gün anı,
Nə sordun kimsəyə, ol kimsə qanı.

Təmə' karvanıyilə yoldan azdum,
Sana gəldüm, çün ögüm səndə sezdüm.

Bunalub sana gəldüm, halumı bil,
Mədədün var isə gözüm yaşın sil.

Təmə' həbsinə düşdüm çıqamazın,
Qatı bərkdür, divarı yıqamazın.

Key ərənlərdürür zindanı bəklər,
Bəhadurlar, dəmür yürəkli ərlər.

Bin ər tonludurur təmə' çərisi,
Mübarizdür, bəhadur hər birisi.

Ələ girəni zindana ururlar,
Ayağına da dəmür buyururlar.

Sual etdüm bulara nə kişisiz,
Ulunuz kimdürür, kimin eşisiz?

Dedilər qamusı nəfs qullarıdur,
Qamusınun təmə' ulularıdur.

Təmə'darun yeri tamuda olur,
Qaçan tamud' olan asudə olur?!

Yolum aldı bənüm, aldadı tutdı,
Bu gün, yarın ilə ömrüm dükətdi.

Əqil anun sözin çünkim eşitdi,
Təfəkkür eyləyüb kənduyə getdi.

Çü genə gəldi əql ögütlər anı,
Bizə gələnlərün qurtuldı canı.

Bizə gəldünisə əndişə yemə,
Nə qılam deyübəni ğüssə yemə.

Qənaət fəqr ilə uş gələ şimdi,
Baqa dur düşmənə gör nedə şimdi.

Çağırdı muştucı, gəldi qənaət,
Hərir tonlar geyər, binər Burağ at.

Ələmləri yəşil bulundı çıqdı,
Kimsənə əsləməz yavlaq ınıqdı.

Çavuşlar yögşürür sağda vü solda,
Ğirivü zəmzəmədür dəgmə yolda.

Anı gördi qaçar nəfs həşəratı,
Gör imdi netədür xaliq sifatı.



Sınıqdı cümləsi, gerü qayıqmaz,
Dökər oğlın-qızın, ardına baqmaz.

Bunaldı cümləsi, turmadı qaçar,
Qılıc lazım dəgül, iş oldı naçar.

Qılıclar qanludur, ərləri qazı,
Uçar quşlar kibi atları tazı.

Təmə'dən qurtarurlar elü şəhri,
Sıdılar ləşkərin cəbri vü qəhri.

Edərlər hayü hu, nifrinü əfğan,
Mühaldur kimsə andan qurtara can.

Sıyub çərisin elinə aqarlar,
Qavub oğlın-qızın, şəhri yaqarlar.

Ğəzadən gəldi şəh təxtin' oturdı,
Sipahilər qamu tapuya turdı.

Qamu şəhrü qamu el rahət oldı,
Nərəyə varasan pür nemət oldı.

Görünməz oldı ol qızlığu afət,
Mətirbazlar olurlar cümləsi mat.

Həriflər cümləsi taətə məşğul,
Olupdur cümləsi sultanına qul.

Oturur cümləsi xan məclisində,
Fərəhlarü qədəhlər əllərində.

Fərağət oldı bunlar xoş keçərlər,
Sürər saqi şərab, dün-gün içərlər.

Fərəh oldı bular, qayğuları yoq,
Əginləri bütün, qarınları toq.

Nedəm demək ırağ oldı bulardan,
Ki ömrü rizqə oldurur payəndan.

Çü mehmandar kəndüsi oldı sultan,
Ha düşər turmadın xan üstinə xan.

Neçə sənün kibilər yedi toydı,
Bikirdürür dəxi, hiç əksimədi.

Yenür, turmaz, vəli zərrə gedülməz,
Nərədən gəldügini kimsə bilməz.

Ərənlərdür bu dirligə, ərənlər,
Yüzin mə'şuqənün mütləq görənlər.

Həqiqət bunlar ölməzlər qalurlar,
Ki hər dəm yenidən qismət alurlar.

Yunus, cümlə sözün sənün fəridə,
Çü *söz sənündürür, ol sən eşidə.*

Necə sözün var isə sana söylə,
Xasü am könlüni "şey' lillah" eylə.

Ki zira cümlə iş ulularundur,
Təmənna eyləgil, yol bularundur.

**Dastani-Qənaət**

Əgər dinlər isən xəbər verəyin,
Əqil casusı nədür göstərəyin.

Qənaət gəldi oturdı təxt aldı,
Həramilər həman yollarda qaldı.



Tururlar tağ başında, yol ururlar,
Qomazlar yolçıyı, yolda tururlar.

Əql der casusa yort imdi gerü,
Qənaətə xəbər bəndən dəgirü.

De otursun ki, tacü təxt anundur,
İlahi dövlət ilə bəxt anundur.

Neçə tura hərami tağ başında,
Girür bir gün ələ yol savaşında.

Gəbürdürlər ana bulurlar anı,
Ana uyan imansuz verə canı.

Özindən ğeyri kimsəyi bəgənməz,
Yücə yerdə turur, aşağa enməz.

Neçə təxtə binənlər yerə düşdi,
Neçə bənin deyənə singək uşdi.

Sana uğratma kibrün əndişəsin,
Uyarsan kibrə ırağa düşəsin.

Iraq düşənlərün imanı yoqdur,
Ki zira surətində canı yoqdur.

Gərək canlu kişi canın saqına,
Ki təqsir etməyə kəndü həqinə.

Təkəbbür eyləmə kim sevrikəsin,
Sevrükmişlər yolına birikəsin.

Qapu gözət, qapu qo, dip gözətmə,
Ki dövlət qapudadur, qoma getmə.

Dilərsən dövləti qapuda turğıl,
Umarsan xəl'əti tapuda turğıl.

Bəgənmə gəl səni ayruq düşəsin,
Qalub dərmandə ücb ilə qalasın.

Təkəbbür sözi hər nərəyə varə,
Eşidən lənət oqur ol xəbərə.

Saqınğıl olmağıl kibr ilə yoldaş,
Kibir qanda isə anunla savaş.

Qoğıl kibri, vəfa sana nə qıla,
Vay ol gün kim, surət nəqşi yıqıla.

Surət yıqılmadın kibri yıqa gör,
Bu düşvarlıq meqamından çıqa gör.

Dənə kibr issini, hiç raheti yoq,
Nərəyə varur isə zəhməti çoq.

Həqq gedən yolı könli içində,
Görəməz ol anı yaddur elində.

Onat gör Həq yolı könlündə sirdür,
Bu cümlə xaslar könüldə birdür.

Sular kim ol könüldən taşra qala,
Nəsibin aldurur ayruq, nə ə'la.

Könül arı bilür könül xəbərin,
Qamu könüllərin içində varın.

Diriğa cümlə ömrün heyfə vardı,
Təkəbbürlük səni yoldan ayırdı.



Təkəbbür nədür ana uyasın sən?!
Ümidün yoq mı həqqi tuyasın sən?!

Həmişə baquban səni görürsin,
Görüb kəndözini məğrur olursın.

Neçə turmaq bu xam əndişələrdə,
Ölürsin tövbəsiz bu peşələrdə.

Təkəbbür kişinün faidəsi yoq,
Qomazsa kibri peşman olısar çoq.

Hünər gözlə hünər, ərə irəsin,
Ər ilə varasın dostı görəsin.

Təkəbbür kişilər ərə irəməz,
Özinün düşmənidürür, görəməz.

Çü sənsin düşmənün, dostun kim ola,
Ki yavuz xudurur sana həvalə.

Nərədə sığınasın sən bu xuyla,
Könüldə dirligündən nə yuyula.

Neçə bu dirligə yoldaş olasın,
Neçə gəlüb ilerü baş olasın.

Bu hal ilə qılınc yoq hiç arada,
Əcəb sana qılıncun kim yarada.

Gərək sən bilesin düşmən kimisə,
Sənün dövlətünə peşman kimisə.

Oyanıqluq dəgül yolda ğafillik,
Uzatma qo, sığınu bunca yıllıq.

Diriğa kibr işin yavlaq gözətdün,
Könüllərdən səni sən taşra atdun.

Gerü get, etmədün könül bazarın,
Can ilə dinləmədün dost xəbərin.

Neçə bir necə bir dünya işində,
Ki bir dəm olmadun dünya işində.

Qoya dünyayı, qoma yetəməzsin,
Əcəl bağladı yolı, ötəməzsin.

Bu beş günlik ömür bu xərcə yetməz,
Sağırmı qulağun, neçün eşitməz?!

Kibr gəldi səni bulatdı getdi,
Əcəl atı səgirdür, irdi yetdi.

Diriğa sən səni hiç bilimədün,
Necə qulsın ki, qullıq qılımadun.

Əgər sən qul isən bəs qanı bakün,
Neçə bir necə (yə) sinün diləgün?

Nə ussun var, nə xud bəllü dəlüsin,
Nə bunda diri, nə sində ölüsin.

Bu hal ilə qalursan biçərəsin,
İçün şirk ilə tolmış şurü şərsin.

Gümanun yoğımıssa inanaydın,
Bu ğəflət uyqusından oyanaydın.

Neçə kibrü həva uşada səni,
Ölüm əvrəni bir gün yuda səni.



Həvayi-kibr ilə nə başarasın,
Əcəl əli uzun, qanda varasın.

Təqazası zəmanun bir gün irə,
Əcəl xirmənlərini yelə verə.

Yetişmədin sana və'də gözün aç,
Həva vü kibr yolından bəri qaç.

Beş-on gün ömr içün gerü qayıqma,
Bu fani dünyənün nəqşinə baqma.

Sənün bigi bini aldadı dünyə,
İnanmaz görə kimi tutdı binyə.

Ki çapuk oynağıl, utılmayasın,
Həvaya, kibrə sən tutılmayasın.

Qatı dutdun, qo kibri ildən-öndin,
Eşitmədün təvazö nə dedügin.

Təkəbbürlər yeri siccin içində,
Onunçün k'olmadılar din içində.

Ki din dutanlarun siccin məsidür,
Ya kibrü kin olıcaq din nəsidür.

İnanmazsan bana halun görəsin,
Çü ömri kibr ilə yelə verəsin.

Yüri imdi məded istə əqildən,
Əsir olmış kişisin neçə yildən.

Əql ədl issi bir ulu kişidür,
Məded etmək sana anun işidür.

Bu yükdən səni ol qurtarısər bil,
Səadət yoldaşun oldı ayü yıl.

Gəlür əql öninə şərməndə olmış,
Ki qayğu yaşıyilə gözi tolmış.

Səlam verməkligə ögin dərəməz,
Oda-közə düşüb yolın görəməz.

Dəlim keçdi zəman dərdi yerində,
Keçürdi ömrüni nəfs bazarində.

Eşit imdi, nə der gör əql ana,
Ki alçaqluq edər dərdünə dəva.

Sözi dükətmədi alçaqlıq irdi,
Kibr gördi anı tez gerü döndi.

Qılıc tartub gəlür yer alçağından,
Kibr gördi anı, qaçdı tağından.

Tağü yazı qamu ğülğülə toldı,
Kimə cənnət, kimə ərəsat oldı.

Çün alçaqlıq irişdi kibr ərinə,
Baqa dur bir kişiyi bin görinə.

Təkəbbür asidür işə sataşdı,
Tutub tağ başını qışa sataşdı.

Gör alçaqlığı, aqdı ırmağ oldı,
Aqa-aqa dənizə varmağ oldı.

Nə dənlü qüvvəti olursa binar,
İrəməz dənizə, ol yerə sinər.



Aqub su alçağa suya qatılur,
Su suya irdi, dənizə itilür.

Dənizə dəgin ırmağ idi adun,
Qo andan ötəsin, dənizə taldun.

Dəniz olanlara göhər mühal mı?
Sədəflər dürr toludur, zər mühal mı?

Ki hər bir mövcdə bir kan bulasın,
Dürü yaqut ilə mərcan bulasın.

Budur sərmayə ol bəhrə talana,
Arı dirlük gərək göhər bulana.

Çü yüz bin çapuki alçaqlıq utdı,
Məcalsuz bərrü bəhri cümlə tutdı.

Gər alçaq varasın, meydan səninür,
Cəvahir səndə bitər, kan sənindür.

Aşaqlıqdur yerü gögi götürən,
Yedi qat yerdən aşağa turan.

Aşaqlıq üzərədür yer ilə gög,
Ögərsən cümlədən alçaqlığı ög.

Aşaq varan kişi dövlət ilətdi,
Ana kim yetisər uzadı getdi.

Aşaqlıq aləmin bünyadı oldı,
Ki hər nə var isə ana düzüldi.

Kibr aldı əri görünməz oldı,
Dəxi yüksək yerə binəməz oldı.

Aşaqlıqla qənaət xoş yar oldı,
Nə istər isən anlarda var oldı.

Çü məmur oldı şəhr ilə vilayət,
Şad oldı dostumuz, düşmanımuz mat.

Əql dəpə casus xəbər ilətdi,
Gör alçaqlığı gerü nələr etdi.

Nə assı eylədi gör, əxi, kibri,
Diri qalmadı bin arada biri.

Eşitdi əql anı, qatı sevindi,
Beşarət eylədi, tez təxtə bindi.

Şükr qıldı Həqqə ol dövlət issi,
İrürdi dövlətə əqli, bilüsi.

Əgər dövlət gərəksə əqlə danış,
Mürəbbisüz iləri varmaya iş.

Bilüni gəl unut sən uslu isən,
Səadət göstərənə xulu isən.

Yunus, alçaqlığı yavlaq bəgəndün,
Qiyas et sən səni, nə qədər endün.

Fərizədür sana, sən səni saqın,
Kim ola sənciləyin sana yaqın.

Xasü am xərciyə yüz yerə bıraq,
Bunun ğeyri xeyir bu sözdən ıraq.

Xətadur, cümləsini xərci sanma,
Səbil ol hamuya, bir dəm usanma.



**Dastani Buşu, yə'ni qəzəb**

Gəl imdi aydayın buşu xəbərin,
Birin-birin sana könüldə varın.

Bənüm iləyümə kim qatlanisər,
Ki xişmimdən dəniz oda yanisər.

Nərəyə kim varam başlar kesilür,
Kimə buşar isəm oluq dəm ölür.

Kim ola bənciləyin cana qıyar,
Məgər kim bən olam, mərdanə qıyar.

Yaradılmış bana qarşu turamaz,
Bənümlə bir nəfəs həmdəm olamaz.

Hünərümə bənüm kim birikisər,
Yəxud əcəl evinə kim girisər.

Fələk bənüm işüm başarımaya,
Mələk bənüm yolımı varımaya.

Gözümə yüz bin ər zərrə görünməz,
Həzar arslan bana bərrə görünməz.

Buşu derlər bana key bahuduram,
Düzənlik bozmağa hər dəm qaduram.

Nərəyə kim varam ot bitməz anda,
Çü nəqt oldı kimə dərd yetməz anda.

Eşidənlər bənüm qaçar sözümdən,
Ki bən də qorqaram uş kəndözümdən.

Saqın bana uyub sən ğafil olma,
Bənüm sözüm tutub imansuz ölmə.

Dək ayruğa dəgül bənüm qılıncum,
Bəni dəxi dutar bənüm quluncum.

Buşu kimdə isə imanı gedər,
İman gərək isə varını gedər.

Buşu gəlincəgiz iman nə olur,
Oda düşər, yanar ya can nə olur?

Buşu işi həman küfrü zəlaldur,
Nəuzü-billah, ol ayruqsı haldur.

Saqınğıl buşudan ki, gizlüdür ol,
Nərədə sezməzsən anda urur yol.

Görəsin bir kişi sakin surətdə,
Nə bilür kimsə anı nə sifətdə.

Boynında təyləsan, əlində əsa,
Çöpü dəprətməyə yer şöylə basa.

Görəsin ansuzın ol çıqa gəlür,
Üzüb təsbih imamə yıqa gəlür.

Uşatdı əsayı qopdı diraqa,
Yüzi qalmadı hiç kimsəyə baqa.

Sual etdüm sufi, bu necə haldur,
Sənün kibi kişidən bu mühaldur.

Üzr göstərdi kim, bən bir kişiyəm,
Fülan derlər bana fülan eşiyəm.

Bilürəm anı eyü, adı yoqdur,
Ki şərdə hiç anun irşadı yoqdur.



Bənüm kibi kişiyə izzət etməz,
Cəvab verür bana, ögüt eşitməz.

Əsaku urdum (ü) yaqamı dutdı,
Bana qarşu turur, Həqqi unutdı.

Nedəyim buşu tutub almış anı,
Ki məhkum eyləmiş buşu div anı.

Özüni ırlamaz ayruğı sınar,
Ki toğru kim var isə anı qınar.

Saqın, hazırdurur daim, buşudan,
Ki dost əsrügidün buşu unudan.

Kişi kim mə'şuqəyə əsriməyə,
Zəlalət almış anı nə deməyə.

Anı dirlik gərək dost iləyində,
Büğz buşu nolur mə'şuq yolində.

Qaçan dost gələ deyü hazır olğıl,
Sarayunı düzətgil, hazır olğıl.

Olub xudbin oturma döşəgində,
Müdami qaim olğıl eşigində.

Ğafil olma, evünə oğrı gələ,
Qatı uyur isən, divar dələ.

Ev issi uyquda, oğrı qıvanur,
Dutar tə'cil işin, oyana sanur.

Necə gəldiyisə uyutmadı ol,
Bilür bəllü ki, qolayıncadur yol.

Ki hər kim gəldisə bildügin işlər,
Kimi yaylarü kimi anda qışlar.

Ev issüz olıcaq oğrı kəkincə,
Girür çıqar baxınmaz qolayınca.

Evüni qanda idün, oğrı aldı,
Yer, içər, oturur, ev onun oldı.

Olursın taşra sən, ol içərü xoş,
Yəqindür iş ucı uş görəsin uş.

Bu nə haldur sana zülmət içində,
Neçə uyuyasın ğəflət içində.

Keçürdün ömrüni sən buşı ilə,
Həman zülmətdəsin sən bu xu ilə.

Əgər səndən buşu getməyə qala,
Əzrayil ol tamardan canun ala.

Nidi verür sana əlün yuduğun,
Səni unutdururmı oquduğun?!

Sanurmısın ögüdümi dəq içün,
Nəsihətdür sana cümlə Həq içün.

Taşun səccadə vü təsbihü dəstar,
İçün murdarü can belündə zünnar.

Bu vəch ilə necəsi olısar hal,
Ki hiç eyü əməl yoq, toludur qal.

Keçürməz sini taşrağı taətün,
Arı olmaz isə gizlü sıfatün.



Çü batin evlərini oğrı aldı,
Zahirdaği əməl taşrada qaldı.

Qamusından sana ol ola yegrək,
Ki dosta taətün gizlüsi yegrək.

Necəsi olısar bu iş müyəssər,
Çü sultan sözi sındı oldı əbtər.

Ki sultanun önində öd ölümdür,
Əgər zərrəyisə suçdur dəlümdür.

Gələ bir iki tanışıq edəlüm,
Ki xəlvət qandasa ana gedəlüm.

Əya uslu kişi, sən bir xəbər ver,
Nərədə var bizə gizlənəcək yer.

Ki gəzdüm yerü gögi bulımadum,
Nə var zərrəyisəm tolınımadum.

Neçün biganəsin sən iki başdan,
Gərəksə sağışın et iki başdan.

Nə böylə cünbüş ilə ola dirlik,
Nə böylə dirlig ilə ola birlik.

Ömür keçdi, hicabı yırtamadun,
Çü qulluğa ədəblə yortamadun.

Söz ayruqsı gərək sultan qatında,
Kim ana layiq oldır xidmətində.

Qaçan şol bir sipahi mə'zul olur,
Ki sultan qullığında ol qul olur.

Nəsihət nə deyəyin ğeyri bundan,
Qulın deyüməyə qullıq unudan.

Əgər qul olasın sərmayə yetür,
Zehi rüf'ət yedi qat gögdən ötür.

Təmam olsa işün, yer-gög sənindür,
Nə kim dilər isən dilək sənindür.

Ki aləm cisminə sən can olasın,
Yerü göğ olmaya sənsiz, dolasın.

Gər eylə olmadun bəs qanı ol iş,
Gümanü vəhm ilə keçdi yazü qış.

Necə dövran kim, anda rəhli urdun,
Oqıyub əşərü ayət yolda turdun.

Neçə elmü əməl sən bu tapuda,
Neçə yıldan bərüsin bu qapuda.

Sözüm kəndözümədür, nüktə dəgül,
Bilün, can birlig' ikilikdə dəgül.

Heyif ol kişiyə qala bu yoldan,
Edünsün çarə, qurtulsun bu haldan.

Ğafillikdür bizi bu yolda qoyan,
Netə ğafil olur mə'şuqi duyan?!

Süpürmədün sarayı gələ bizə,
Nə fərraş istərüz kim gələ düzə.

Neçün keçməz əcəb yol bu aradən,
Buşu aldı yolı bil hər yanadən.



Buşu xeyli zəmandur yolu almış,
Kimsən' izləməyüb gizlənü qalmış.

Əql casuslara söylər divanda,
Yürün, bulun düzənlik səfi qanda?

Dedi casus düzənlik halin ana,
Buşudan tağulubdur dəgmə yana.

Çü casus bu sözi əqlə irürdi,
Neçə kim varıdı xəbər dəgürdi.

Çü hiç söz qalmadı ulaşdı əqlə,
Buşuyu dutmağa iş düşdi əqlə.

Əql fikr eyləyüb söylədi xəbər,
Buyurdı çavuşa, cəm oldı ləşkər.

Divanda söylənür nə bunca düzgün,
Şikayət buşudandur sözdə hər gün.

Səbr qanı buşu kəkincə ölmiş,
Düzəngilə səfa andaq bozulmış.

Ayudın səbr kim tez dutsun anı,
Xərab etdi elü şəhri, diyarı.

Çıqa gəldi səbr ana oluq dəm,
Sanasın buşuyı İbrahim Ədhəm.

Görilməz oldı ol, izi bəlürməz,
Necə izi ki, hiç tozı bəlürməz.

Bu gəz gördüm düzənligü səfa xoş,
Oturub eyş edərlər, nuş ola nuş.

Şunun kim dünyədə səbr ola yarı,
Səfa vü zövq olur hər ləhzə karı.

Fəda canum sana, ey səbr əyəsi,
Ki səbr oldı bənüm canum ğidasi.

Qaçan kim olasın bu səbr ilə sən,
Əcəbdür olasın sonra peşiman.

Kimə səbr olsa dünyadə müyəssər,
Ana Həq verisərdür mülki-digər.

***

Səbr əhvalini dinlə, deyəyin,
Səbr al, ver qamu bu dünyə malin.

Anunçün səbrdür ətayi-dövlət,
Ki səbr eylər qamu müfsidləri mat.

Səbr qandayısa eylükdür işi,
Müdam azad edər yadu bilişi.

Səbrlü dövləti daim olısar,
Nəsibi səbr olanlar uluyısar.

Eşitdün Yusifi ol çah içində,
Tururdı səbr ilə ol mah içində.

Bilinməzdi nə dənlüdür uzuni,
Çağırsa taşra çıqmaz Yusif üni.

Yuqaru baqar, ol çah ağzı ıraq,
Aşağada məqamı taşü topraq.

Neçə çağırdısa ün taşra çıqmaz,
Qodı çağırmağı ayruq çağırmaz.



İlahi, bən qulun suçı var ola,
Ki bu iş bən qulun ilə yar ola.

Çü topraq bendəsə qanda varam bən?
Səbr qılmaz isəm nə başaram bən?

Der, eylə gözləri yuqarı baqar,
Yenilməz göz yaşı sel kibi aqar.

Ol saətdə gerü-önini dərdi,
Düşirdi kəndüyi vü səbri gördi.

İrürdi dövlətə ol səbri-ali,
Ki səbr ilə xoş oldı cümlə hali.

Yapışdı qoğaya, tartdılar anı,
Dedi irişdi uş dövlət nişanı.

Çü çəkdilər qoğayı çıqdı taşra,
Zehi dövlətlü kim səbri başara.

Görə səbr ilə Yusif nəyə irdi,
Ki səbrün acısı həlvayə irdi.

Səbr issi bilür ol nə idügin,
Səadətlü tutar səbrün dedügin.

Səbr kimdəyisə ol ərşə sünər,
Ki səbr içrə bulınur dürlü hünər.

Çü hər hal sana səbr gərək xoş,
Səbr edər bu cümlə ağuyı nuş.

Səbr gərək sana hər hal içində,
Səbirsüzlər qalurlar qal içində.

Ki hər kimdə olursa səbr hali,
Olısar xeyr ilə anun məali.

Bıraq cümlə işi, qıl səbrü tədbir,
Ərən könlində olur səbr ilə yer.

Nəbidür gər vəli, yol səbrə uğrar,
Əgər sən də varırsan, səbr ilə var.

Gözət səbri ki, ta sən kan bulasın,
Səbr bəklər isən mərcan bulasın.

Səbrsüz kişilərün dirligi xam,
Ki səbr ilə eyü olur sərəncam.

Ögüt gərək isə səbr ilə iş et,
Uzayın der isən, səbr ilə bit.

Nə sarb iş olsa səbr anı bitürür,
Qamu yerdən səadətlər yetürür.

Əmanət al, əmanət qoma səbri,
Bulasın səbr ilə me'racü Turi.

Səbr ilə vardı ol me'racə varan,
Diriykən ölür səbri başaran.

Yunus, sən sadiq isən gir səbrə,
Qatı sabir gərək səbr ilə dura.

Səbrdə turanun buşusı qalmaz,
Çü səbr oldı, yavuz xusı qalmaz.

Səadət istəsən səbri güzin gör,
Ki "Vəllahu muinəs-sabirin" gör.

Eşitdün səbr halin ta nəhayət,
Dutanun canuna olsun bəşarət.



Usan olma, neçəmə yol əmindür,
Hərami çoq bu yolda pur kəmindür.

Əgər dinlər isən deyəm nəsihət,
Həsədlə hoqqədən saqın bəğayət.

Qədimdən bu ikidür miri-ləşkər,
Yüriyüb hər biri bildügin işlər.

Həsud bir kişidür daim o rəncur,
Vücudi sağ ikən rənc ilə məqhur.

Məzərrətdən neçəmə kim ol qaçar,
Əvəz töxmini bitməz yerə saçar.

Nə iş kim işləyə kəndüyə ziyan,
Kim ola kəndözinə eylə qıyan.

Şəkər yeyərsə dadı dalı yoqdur,
Ki tadlu dirligiylə halı yoqdur.

Həsud əli anunçün irməz işə,
Kim kimə quyı qaza kəndü düşə.

Deyəm sana bəxilin nə idügin,
Saqınur kəndüdən kəndü yedügin.

Qazancın kəndünün kəndüyə verməz,
Əli bağludurur, xeyr işə irməz.

Bu nə haldur sana, ey faydasuz can,
Ki yoqdur ğeyrətün, ey qaydasuz can.

Görə nə haldədür canunü cismün,
Nə kimsəsin sənü ya nədür ismün?

Bu nə kutəh nəzər, ya nə fərasət,
Ki bir dəm olmadun kəndünlə xəlvət.

Mühaldur aqil olmaqlıq bəxildən,
Nə kimsə alqış edər ana dildən.

Qo sevmə dünyəyi kim, qala səndən,
Dilərsən, diləməzsən ala səndən.

Süleymandan ilərü olmayasın,
Həqiqətdür cəhanda qalmayasın.

Bəxil olmaq səni Həqdən ayırdı,
Qanı ğeyrət, həmiyyət qanda vardı?

Həsəddən kişi nə faidə görür,
Nəyə kim layiq isən Tənqri verür.

Nəyi nəyə gərək ol bilə gərək,
O qadirdür verür kimə nə gərək.

Nəsibünə sənün sən nəzər eylə,
Ana görə yaraq qıl, həzər eylə.

Zəkatsuz heyvan sədəqəsüz mal,
Nə bərxurdar ola bunun kibi hal.

İnanmazsan bənə, sən kəndün özlə,
Benüm dedügimi kəndündə gözlə.

Nə hacət bən demək, çoq çıqdı fe'lün,
Nişanı oldurur bağlanmış əlün.

Suçı yoq kişinün bağlanmaz əli,
Tolaşur kəndüyə həm kəndü fe'li.



Çü suçun bilməz isən bildirəyin,
Tutub oğrıyı əlünə verəyin.

Çün oğrı yoldaşı başını verür,
Həsudluq, bil, səni yavlaq düşirür.

Şu kim yoldaşına xəyanət eylər,
Kimə yoldaş olursa lə'nət eylər.

Sana yoldaş olanı sən bilürsən,
Səni qurtarasın toğru gəlürsən.

Toğırlıq bəsləyənə büxl irməz,
Həsəd xud kibrdür, hiç anı görməz.

Həsudun qanda(sa) bəllü bazarı,
Anun getməz olur hiç könli tarı.

Anunçün dirligi nedəm içində,
Olur bin gəz həlak bir dəm içində.

Yıl on iki ay anun şadlığı yoq,
Yesə gər yeməsə qayğuyilə toq.

Nə söz söylər isə hövsələsi dar,
Nə dinsə tarlığından bin dəxi var.

Həsəd odı anunçün yaqdı anı,
Yürürkən sağ-əsən, döküldi qanı.

Həsudlıqdan həsuda faidə nə,
Könüldən taşra düşdi, nə edə nə?!

Həsud ilə bəxil sağışda dəgül,
Rədd oldılar bular, hiç işdə dəgül.

Bularun birligə iqrarı yoqdur,
Bulara hər nə olsa arı yoqdur.

Bularun şahdan qorqusı yoqdur,
Kimsənə bəgənəsi xusı yoqdur.

Nərədə olsa xəlq ürkər sözindən,
Kimsənə assı eyləməz özindən.

Bəxilün gözlərində ibrət olmaz,
Kimsənəyə bulardan himmət olmaz.

Ğənidür padişah, ol anı görməz,
Çəkər büxl əlini, nəsnəyə irməz.

Yenür nemətləri şahun bayağı,
Hiç əksilməz durur danə darağı.

Neçə yıldan bərü ol ne'məti yer,
Həqqə bir dersə dəxi şirk ilə der.

Gəlür hər gün yeni nüzlü yeni xan,
Yeni gələnlərə verür yeni ton.

Yeni sübhü yeni aqşam, yeni hal,
Yeni dövran, yeni dəm, yeni vüsal.

Qədəh yeni, yeni mey, yeni məşrəb,
Yeni eyşü yen' işrət, yeni mütrəb.

Nədür bir kişi bil ki, cümlə aləm,
Nəsibini alur nə pişü nə kəm.

Bəxil qandayısa Qarunla qopar,
Ki ol da ancılayın mala tapar.



Deyəlim dinlə Qarunun zəvalın,
Verüb imanını verməδi malın.

Çü Qaruna malıyçün buyruq endi,
Zəkatı verrnədi vü dini döndi.

Edər fəryad, yerə qo verəyin,
Ki boynumdan vəbali endirəyin.

Qoyıcaq yer malun üşrini seçdi,
Qıyamaz verməgə, canına keçdi.

Ayıtdı bunca malı verimeyim,
Yeg ol kim, yer yüzində yürimeyim.

Qo bu mal əksülincə bən öləyin,
Gözüm görür ikən necə verəyin.

Zəkatın verrnədi, dövləti döndi,
Xəbər bu olıcaq yer genə sundı.

Dutub əglətd' anı belinə dəgin,
Verür kəndü əvət anın diləgin.

Görür əvrən dəgül Qarun suratı,
Doyamaz ol əzaba işi qatı.

Gerü fəryad edər bu gəz bəni qon,
Bolay ki, olayıdı taliüm on.

Qəti şərt eylədi üşrini verə,
Biçarəlik nəsibin kim gedərə.

Qoyıcaq yer anı gerü yuyuldı,
Vay ol kişiyə kim ol zərb uruldı.

Peşiman olıcaq yer genə tutdı,
Boğazına dəgin Qarunı yutdu.

Boğazına dəgin tutuldı turur,
Qıyamaz mala, can tərkini urur.

Qatılıqdan işi yavlaq uzatdı,
Gözi baqar ikən mal yerə batdı.

Batar kəndü dəxi malı sonınca,
Gedər hər gün yerə kəndü boyınca.

Qiyamətə dəgin yer yutı gedər,
Gör imdi ki, qiyamət ana nedər.

Ki oddan zəncir edər(lər) malını,
Qamu aləm görə anun halını.

Olub zəncir mal boynına düşər,
Xəlaiq amü xas həb ana düşər.

Deyələr əhli məhşər ol bu haldə,
Boyun zəncirlü qalmışdur vəbaldə.

Zəkatın verməyənün halı budur,
Olır boynına zəncir malı, budur.

Nə çarədür ki, büxli görə anı,
Keçüb boynına tar oldı cəhanı.

Ğinadan faidə olmaz bəxilə,
Keçər yoxsul kibi yüz bin mal ilə.

Ərün baylığı mal ilə dəgüldür,
Neçə malluya yoxsul deyü gül dur.

Məgər kim könlüni ıldırım urdı,
Ki çevrə yanına qarağu durdı.



Xudadan möhr uruldı himmətinə,
Gəlüb kim dinlənə anun qatinə.

Nəsihət bin olursa biri sinməz,
Küfr söylər dili, hiç ağzı dinməz.

Çü aciz kəndü dəxi kəndözindən,
Ki şad olan olur ğüssə yüzindən.

Özinin öz ilə yoqdur hesabı,
Məgər yoq axirətdən fəthi-babı.

Nədür layə bəli, ol hiç bilməz.
Ki bunlara yaraşur iş qılmaz.

Bəxil qanda isə Qarun ilədür,
Güman tutmayasın, mütləq bəladur.

Kişi kim Həqq yolından taşra dura,
Dutub boynına kəndü zəncir ura.

Qamu büxl əhlinün işi bu ola,
Qədimdən qismətidür bu nəvalə.

Kimün kim büxl olduyısa halı,
Əlin urmağa malə yoq məcalı.

Kimün kim kəndüsiylə qədri yoqdur,
İki gözləri kordur, varı yoqdur.

Bəxil olmışdı elmü hünər issi,
Əsirgədi özin ol nəzər issi.

Dilər kim büxl əlindən qurtıla ol,
Əyan ola ana Həqdən yana yol.

Gəlüb əql önünə, yüz yerə urdı,
Əsər etmişdi ana büxlün odı.

Çü ağaz etdi kim sözini deyə,
Qulaq dutdı əql ol kələciyə.

Öküşdür məsiyət əndişə daim,
Dilərəm büxldən bən qurtulayim.

Ömür keçdi diriğa gec oyandum,
Bana bu dünyə baqi qala sandum.

Dilərəm ki, bana fəryad irəsin,
Güc olmış kişiyə sən dad irəsin.

Gör imdi əql ana nə deyisər,
Bizə gələn həsəddən əl yuyısər.

Əql bir kişidür Allaha baqar,
Uyarsan əqlə uy, ol büxli yaqar.

Əql aydur gələ bir gözlərün aç,
Səxavət qandayısa ol yana qaç.

Əlün ala səxavət gedə bilə,
Görəsin Həq yolın xoş tərtib ilə.

Denincə söz səxavət dəxi irdi,
Ətaya pərdə olanı götürdi.

Oluq dəm cümlə malın yəğmalatdı,
Bu dünya cifəsin ardına atdı.

O murdar çünkim andan taşra düşdi,
Bəxillər it kibi çep çevr'ülüşdi.

Şu kişi kim bu gün dünyası tərkdür,
Yəqin bilgil, anun imanı bərkdür.

Sevəməz dünyəyi mərdan kişilər,
Baqi dirlik nədür anı dilərlər.



Baqi aləm görindi gözlərinə,
Oturdı eşq tozı gözlərinə.

Anınçün gözləri Həqqə açıldı,
Xudadan canına rəhmət saçıldı.

Nəsi kim var isə tərk etdi yola,
Bu yol ilə varan mə'şuqi bula.

Qamu elmü əməl bir tərkə dəgməz,
Ki tərki olmayan bir bərkə dəgməz.

Vəliyə vü nəbiyə tərk buyurdı,
Həlaldur tərk ana, can tərkin urdı.

Əgər izzət sevənə tərk mühaldur,
Nola sızmazsa bunda anda qaldur.

Neçə pərdədürür dostı görənlər,
Ya nəyə qayıqa könül verənlər?

Qayıqmaz nəsnəyə hiç könül əri,
Qəbul etməyələr tərksiz bulari.

Xanüman bəkləyən görməyə anı,
Qomayınca təmam fani cəhanı.

Əli toyub qodı səxavət issı,
Çün eylə buyurur yolun ulusı.

Ki yüz bin yügrügi cəmərd ər utdı,
Bu meydan öndülin ol aldı getdi.

Ki yüz bin dəvi qılan ana irməz,
Onun izi-tozını kimsə görməz.

Səxi bir kişidür uçmağa baqmaz,
Ki tacü hülləyə huriyə aqmaz.

Anı tuyanlara nə cənnətü hur,
Ki tərkə girənə nə hur, nə qüsur?!

Anunçün kim təcəlli balqır ana,
Qayıqmaz zərrəcə ol dəgmə yana.

Müşahidə görən nəyə qayıqsun,
Nə var andan eyüyə nəyə baqsun?

Nedər iki cəhanı dosta gedən,
Eşqdür sərmayə, gəl, bazar edən.

Ərəz sərmayə olmaz dost qətində,
Ədəbdür varlığun şəh həzrətində.

Səxavət edər isən eşq alasın,
Təmam tərk olıcaq, eşqdə qalasın.

Səxavət əvəzini eşq bağışlar,
Bulınur eşq içində əcəb işlər.

Aşiq olana nə sərmayə vü mal,
Dilək iki, könül bir, bu nə mühal.

Gəzaf yerdə degül bu sən dedügün,
Bulursın sən səni, sən istədügün.

Səninlə sən tanış gör qandasın sən,
Sənün dövlətünə bəhanəsin sən.

Səni səndən kim eyü bilə bilə,
Keçürdün ömrüni bu dirlig ilə.

Nəyisə dirligün oldur ölümün,
Bugünki gündürür yarınğı günün.

Həqqi tuyanlara bu gün yarın yoq,
İşün bu gün bitür, gözləmə artuq.



Hesabı hər kimün yarına qaldı,
Tut eylə kim, balığı taşa saldı.

Kimün əhvali kim yarına qaldı,
Əliylə başına ol qoydı odı.

Ki zira padişahun bunda hazır,
Nə işün var deyə fərdada axır.

Gözün görür ikən gəl Həqq yolına,
Qomağıl nəfsüni kəndüliginə.

Neçün qorsın səni düşvar saətə,
Qan əqlün göyərsin qiyamətə.

Qamu çig işini həb bunda bişür,
Yol uzaqdur, yüküni bunda döşür.

Ki bunda bitməyən iş anda bitməz,
Sağırmı qulağun, neçün eşitməz?!

Comərdlər duydı bunda ol zəvalı,
K' olara vasil oldı Həqq vüsalı.

Səxayə sən Yunus verdün isə ərk,
Ayıt imdi, bu yolda neylədün tərk.

Vücuhun yoğ isə könüllərə get,
Boyun verməz tamarlarunı səgit.

Könül ərini öndən qoma əldən,
O qurtarur səni dürlü fe'ldən.

Ögüt dutar isən qoma ətəgin,
Tac eylə başuna ayağı xakin.

**Dastani-Əql**

Gəl imdi aydayın bir qaç nəsihət,
Bu əqli-cüzidən sana eyü bəxt.

Qalur taşra bu şərdən əqli-məiş,
Baqar bu yola əqli-cüzi baqış.

Anınçün dost yüzindən gözin ırmaz,
Buçuq saət bu ansuz hiç dəm urmaz.

Çü dost anun olupdur hər nəfəsdə,
Ki dostsuz can quşı turmaz qəfəsdə.

Ögüt alur isən sən bu xəbərdən,
Gərək xaricilər sürilə şərdən.

Ki bin ər şəhr içrə əlbir etdi,
Xaricilər sürilüb əlbir etdi.

Şəhr bizüm olub düşmən sınıqdı,
Bizə tapu edən yavlaq ınıqdı.

Əgərçi işlənür böhtanü ğeybət,
Sərəncam oldılar bunlar məlamət.

Ki ğeybət can ilə qədimi dəgül,
Ki ğeybət qandasa adəmi dəgül.

Çü ğeybət mərtəbəsi küfrə girür,
Nəsibi nəyisə ol anı alur.

Kişinün heyzidür ağzında ğeybət,
Ki ğeybət söyləyən bulmaya rəhmət.

Əgər varisə əqlün, ğeybəti qo,
Ki ğeybət qoyanun xəznəsi tolu.



Padişəh xəznəsində mənna' öküş,
Uyxudan oyanub dut sözümə guş.

Kişi k'ol qapuya hacətə vardı,
Nəyisə məqsudi anı başardı.

Çü büğzü ğeybət ilə gedə taət,
Gərək bu ikidən etmək fərağət.

Gərək fani cəhandan dartınasın,
Müxalif işlərindən həp yunasın.

İçərü gizlüdür cümlə yavuz xu,
Gedər, göstərmə kimsəyə, anı yu.

Gərək sən zəngi vü pası yuyasın,
Sana layiqmidür anı qoyasın?!

Saqın qətran qabına qoyma balı,
Ki nazük yerdədür dostun vüsalı.

Tamarlaruna cümlə seyqəl urğıl,
Ki hər birinə bir qullıq buyurğıl.

Neçə haldən-halə gərək düşəsin,
Keçə çoq ruzigar andan aşasın.

Qaçan gənc bulasın yer qazmayincə,
Yə qəlb safi mi olur qızmayincə?!

Əgər gənc gərək isə rənc ilətgil,
Ögüt dutar isən, gəl gəncə getgil.

Bəri gəl gənci sana buldurayın,
Sana buldurmayanı böldürəyin.

Bulayın derisən qəyyumü həyy ol,
Xəzinəyə vara bəvvabı ta bul.

Dürü göhər bulasın xəznələr(dən),
Bulına cümlə səndə kanü mə'dən.

Qolay tərtib ilə kim bula gənci,
Çün öylə varımazsın qo sığıncı.

Sığınc ilə şəkər kim yedi ya bal,
Bəhasın verməyincə irmədi əl.

Yükin kim bağladı raygan şəkərdən,
Xəbər alayıduq olsa bulardan.

Şəkər dəgüldürür bu sözüm ucı,
Nə eydügüm bilür mə'ni bilici.

Olur mə'ni sözi şəkkərdən ıraq,
Bulayın dėrisən sükkəri bıraq.

O sükkər sevmə kim, Misirdə bitər,
Yenə layiq isə ara ki, yetər.

Nəyi sevər isən gözlərsin anı,
Sana görünmədi şəkkər cəhanı.

Tağü taş oldı bizə külli şəkkər,
Toquz bin kişi anı hər dəm ögər.

Bu aləm şəkkərinə bənzəməz ol,
Səbildür cümləyə anda şəkər bol.

Görəyin dirisən qo bu cəhanı,
Duta ögüdüm ol kim ola canı.

Sana qo dedigüm ğeybətdürür kin,
Bu iki düşməni dost sanma, miskin.

Bu düşmənlərünün sözüni dinlə,
Ana görə yüri, dirligin eylə.



Qamu toğan günü gecəyə bənzər,
Nəyə bənzədəyin yə nəyə bənzər.

Gözi yoq, yer içər, dünyayı görməz,
Toğar ayü günəş, ol anı görməz.

Anunçün gözləri hicab içində,
Qalur zülmat ilə ol xab içində.

Qulağı eşidən, şəklini görməz,
Ki görmək adı ana uyı verməz.

Anı göstərməyən kin ilə ğeybət,
O sağıncdan sana heyhat e, heyhat.

Gözün görməz derisəm qaqıyasın,
O tamardan bəni xud doqıyasın.

Neçə göz ağrısı sənün içündə,
Yer, içər, oturur sənünlə gündə.

Baqar ölü kibi gözün nurı yoq,
Özini görməyən nə görə ayruq.

Sana aqil demə, səni unutdun,
Nə desə kinü ğeybət anı dutdun.

Nə işün var sənün səndən fərizə,
Əməl eylə, əməl sənünlə gedə.

Neçə bir görməmək, açğıl gözüni,
Od içində qodın sən kəndözüni.

Kişi kim ola ol kəndüyə düşmən,
Gənəz dəgül kim, anı qoya düşmən.

Gözi görməz kişi sevgüdən ıraq,
Qanı dost, qandasın, sən gözün aç baq.

Görəmədin gözün n'anlaya könül,
Qəbul etməzsə göz, neyləyə könül.

Qamu sevgü dadın əvvəl göz alur,
Pəs andan sevgüyi könüldə qalur.

Gözi görməz kişinün sevgüsi yoq,
Gözi olandurur sevgüyilə toq.

Qoyan qiymət göz olur hər nəsəyə,
Ki qiymətsüz kim ola baha sayə.

Gözi yoq kişi nəyə qiymət edə,
Soğulmış quyudan kim su ilədə?

Könül qabil gözə fayiz de mütləq,
İrər peşkəş cana eylə olıcaq.

Gözi yoq kişinün sevmək nəsidür,
Könül qul olsa gözün fitnəsidür.

Surət gözi degil bu göz dedigüm,
Bilürəm bən nədən nə istədügüm.

Göz oldur kim, müdam ol canı görə,
Fərizədür qula sultanı görə.

Bu – baş gözi dəgül, ol can gözidür,
Kimün canı varısa anı görür.

Olar kim olalar can yumışində,
Qaçan hərgiz ola dünya işində.

Ulı dirlik gərək ol əmri-cana,
Nə dünya, axirət anı tuyana.

Canı yoq kişinün uyqusı qanmaz,
Ki canlu barmağın uyquya banmaz.



Ömür keçdi, dəxi oyanmağun yoq,
Kinü ğeybət suyına qanmağun yoq.

Üç yüz altmış tamarun uyquladı,
Gedüb kərvan, yükün yabanda qaldı.

Dəxi yuyulmadı ol kin tamarı,
Yolında eybinün xərc oldı varı.

Dilərsən ğeybəti bən bildürəyin,
Şəqavət pərdəsini qaldurayın.

Demək gördügini ğeybət bu, mütləq,
Ki, pərdəlülərə dəgül sabit Həqq.

Desə görməsə, böhtani-əzimdür,
Buyuran böylə Qur'ani-qədimdür.

Fərizə hər kişiyə kəndü sözi,
Baqar kəndü yolına kəndü gözi.

Qaçan kim göz könüldən toğrı baqa,
Eşitməz qulağuna Həqqi çaqa.

Çü Həqdən ğeyri sözi yoqdur ayruq,
Həqq tuyan kişilər Həqq ilə toq.

Qoğıl ayruq sözi, sən səni gözlə,
Sənün suçun ilə sən səni yüzlə.

Kimsənə suç ilə kimsə qınanmaz,
Kişi ayruq suçını suç sanmaz.

Sana biganə suçından xəta yoq,
Meyl yoq kimsəyə, ana-ata yoq.

Ayruğı söyləyən kəndin umıdur,
Ki zira suçludur, asi xuludur.

Sözə yol yoqdurur kim söylənə boş,
Məgər söz həqq ola, həm Həqq ola guş.

Necə söylər isən sən Həqqi söylə,
İcazət yoqdurur ayruqsı meylə.

Necə sözün var isə sana söylə,
Sanasın həqlusın sengle ğəmünlə.

Nə hacətdür sana kimsə xəbəri,
Fərizə cümləyə kəndü bazarı.

Özini gözləyən kimsəyə baqmaz,
Dəxi n' iş der isən ol yanə aqmaz.

Qo ayruqlar sözini sən səni güt,
Qınama kimsəyi sən eşit ögüt.

Sana kimsə suçı bir zərrə irməz,
Sana ayruq yedügi çeşni verməz.

Sən ayruq yedügiylə toymayasın,
Anunla cismü ömri yuymayasın.

Neçə avarəliğlə sana böylə,
Bir-iki gün nola olsan sənünlə.

Dəxi bir gün sana sataşmadun sən,
Dəxi bir gün tağundan aşmadun sən.

Nola bir gün əgər küfrün yenəsin,
Səni şərh eyləyüb səni biləsin.

İkən avarəsin, dölənməgün yoq,
Ki kəndü kəndüni hiç anmağun yoq.

Əgər görsəyidün kəndü zəvalun,
Kimsənə anmaya qalmazdı halun.



Əgər görsən yarağun qılayıdun,
Hesabunı sənün sən alayıdun.

Səadət olsa Həqq versə bəsirət,
Görəydin nə qılur sana bu ğeybət.

Neçə yıl bir kişi ğeybətə uymış,
Sərəncam aqibət kəndüyi tuymış.

Peşiman oldu vü diltəngü ğəmgin,
Nələr etmiş ana bu ğeybətü kin.

Deyüb əhvalini dərdin yenilər,
Əql şahənşəhindən çarə dilər.

İşi toğruluğa buyurdı aqil,
Yüri imdi buna tə'cil yari qıl.

Qığırdı toğrulıq yarənlərini,
Öziylə sapmasuz varənlərini.

Gör imdi toğrulıq bir nələr eylər,
Yaqar ğeybət evin, qara yer eylər.

Toğurlıq cümləsindən yüksək üzər,
Toğurlıq bəsləyənlər ərşdə gəzər.

Məhalmı ərş ya fərş toğrılara?
Verür kəndüligini şəh bulara.

Aşiqdir toğrulığa toğrı canlar,
Toğurlığı bulur dostu sevənlər.

Sadiqdir toğrulıqda eyü kişi,
Toğurlıq eyü edər yavuz işi.

Ögüdi cümlə oğurlıqdan alur,
Toğurlıq dirligi əbədi qalur.

Fəda canum sana, ey toğru varan,
Müşahidə bulur anı başaran.

Əzəl əbəd nə ola toğrulara,
Zahir batin hicab olmaz bulara.

İki aləm bir oddur bir nəzərdə,
Ki birdür toğruya imruzü fərda.

Ki toğru halını yarına qoymaz,
Bu gün yarın demək ol halə uymaz.

Nəyisə zahirün batinün oldur,
Nəyisə əndişən ol yanə yoldur.

Qamuya toğru dersin toğruyisən,
Bulınmaz toğrulıq sən əgriyisən.

Yola getmə sən əgri ey yeganə,
Sənün dirlügünə sənsin bəhanə.

Qamular göz kibidür, sən baqıcı,
Sənün gözündürür səni çaqıcı.

Nəyə kim baqar isən ol yüzündür,
Kimə nə sanur isən kəndözündür.

Əgər bin yıl qaçasın səndən ötməz,
Əməlündür bilə qancəsinə getməz.

Toğurlıq xəl'ətin ol vəqt geyəsin,
Xasü am xərciyə toğru deyəsin.

Toğurlıq göstərə göz baqışına,
Ki səndən cümlə yavuz iş taşına.

Çırağı yaqıcaq qaranğu qaçar,
Özi göynər, bizə nur babın açar.



Sözə tarix yedi yüz yedi idi,
Yunus canı bu yolda fəda idi.

Çıraq yandı dəlil toğru bulundı,
Ev aydın oldı vü oğrı yolundı.

Çıraq dedügüm iman nurı mütləq,
İmanluya didarın göstərür Həqq.

Ol oğrı dedügüm şeytandur azar,
Ki dəmbədəm içündə fitnə düzər.

Məqamını yıqarsan taət ilə,
Muraduna irəsin dövlət ilə.

E ğafil, bilmədin ömrün keçəsin,
Əcəl əli qamu eybün açasın.

Azın-azın bu ömrün keçəsidür,
Sorarsın sən bu ayın neçəsidür.

**Təmmətir-risalətin-nushiyyə**
**bi aunillahil məlikis-səmədiyyə**
**hamidən və müsəlliyən lillahi**



## LÜĞƏT

### A

*-a(ə) dur, -a durur* – indiki zaman formaları
*Abi-heyvan* (*f.*) – əfsanələrə görə zülmətdə olan bir çeşmənin suyudur ki, içən heç ölməzmiş
*Abi-həyat* – bax: Abi-heyvan
*Adım* – addım
*Adəm* (*ə.*) – ilk yaradılan insan və ilk peyğəmbər
*Ağaç at* – tabut
*Ağaz etmək* (*f., t.*) – başlamaq
*Ağmaq* – qalxmaq, yüksəlmək, ucalmaq
*Ağu, ağı* – zəhər
*Aqdarmaq* – devirmək, yıxmaq
*Aqmaq* – axmaq, tökülmək; hücum eləmək
*Alçaq* – təvazökar, sadə, mülayim
*Aldamaq* – aldatmaq, hiylə gəlmək
*Aləmi-vəhdət* (*ə.*) – birlik aləmi
*Am* (*ə.*) – kütlə, xalq; qara camaat
*Ana* – ona
*Anca, ancılayın* – onun kimi
*Anda* – orada
*Andaq* – o qədər, o miqdar; dərhal
*Andan* – ondan, oradan, ondan sonra
*Anı* – onu
*Ansuzın* – ani, bir anda
*Anun* – onun
*Ap-arıca* – tərtəmiz
*Arayiş* (*f.*) – bəzək, zinət
*Arı* – təmiz, saf
*Arif* (*ə.*) – bilən, bilik sahibi. Sufilərin gözündə alimdən üstün dərəcəyə yetişənə deyilir. Duyğuya söykənən irfan əqlə əsaslanan elmdən üstün, Tanrı qatındakı gizlin bilgidən bilən arif də alimdən uca mərtəbədir
*Arquru* – çalın-çarpaz, köndələn
*Armaq* – yorulmaq
*Arşun* – arşın
*Artuq* – artıq; başqa
*Arzuman* (*f.*) – dilək, istək
*Assı* – xeyir, fayda



*Ayağ* (*f.*) – qədəh, badə
*Ayət* (*ə.*) – Qur'an surələrindəki cümlələrin hər biri, ayə
*Ayıtmaq, eytmək* – demək, söyləmək
*Ayruq* – ayrı, başqası, ayrısı
*Azıq* – azuqə, yeyəcək-içəcək

### B

*Bab* (*ə.*) – qapı
*Bac* (*f.*) – vergi
*Badya* – böyük saxsı qab, küp
*Baqım* – görüş, baxış
*Baqır* – mis
*Baqi* (*ə.*) – daimi, həmişəlik, əbədi
*Bal* (*f.*) – qanad
*Balqurmaq* – parıldamaq
*Banlamaq* – burada azan vermək, uca səslə (avazla) azan çəkmək
*Banmaq* – bir yeməyə, bir nəsnəyə barmağını batırmaq
*Bari* (*ə.*) – yaradan, yaradıcı; Allah, Xaliq
*Barigah, bargah* (*f.*) – otaq, saray
*Baru* (*f.*) – barı, qala divarı
*Baş* – yara
*Baş gözü* – can gözünün ziddi, könül gözünün əksi
*Batin* (*ə.*) – görünməyən, gizli, açıq olmayan; iç üz
*Battal* (*ə.*) – işə yaramaz, faydasız; hərəkətsiz, tənbəl
*Bay* – zəngin, varlı
*Baz* (*f.*) – şahin, tərlan
*Becid* – tələsik, tez, cəld
*Bəhr* (*ə.*) – dəniz
*Bəxil* (*ə.*) – paxıl; xəsis
*Bəkləmək* – gözləmək
*Bələş* – pulsuz, havayı
*Bəlürmək* – bəlli olmaq, məlum olmaq
*Bərcis* (*f.*) – Yupiter planeti
*Bəsər* (*ə.*) – görmə; göz
*Bəzm* (*f.*) – məclis, yığıncaq
*Bınar* – bulaq, çeşmə
*Bigi* – kimi, tək
*Bixud* (*f.*) – hissini itirmiş, özündə olmayan
*Bikr* (*ə.*) – bakirə; təmiz, saf

*Bilə* – birlikdə, bərabər, bir yerdə
*Bilişmək* – tanış olmaq, dost olmaq
*Bilqeys* – dini əfsanələrdə Süleyman peyğəmbər zamanında yaşadığı, onun tərəfindən imana dəvət edildiyi söylənir
*Bilü* – bilgi, elm
*Birekü* – bir kimsə, başqası, birisi
*Birin-birin* – bir-bir, birər-birər
*Bişə* (*f.*) – meşə
*Biti* – kitab, yazı; nüsxə, dua
*Bititmək* – qismət eləmək, yazmaq, nəsib etmək
*Boqrat* (*Hippoqrat*) – e.ə. V əsrdə yaşamış məşhur yunan təbibi. Tibb elminin banisi sayılır
*Bolay ki* – ola ki, bəlkə, ehtimal ki
*Böylə* – belə
*Buçuq* – yarı, yarım
*Bud* (*f.*) – varlıq, həyat
*Bulmaq* – tapmaq
*Bulunmaq* – tapılmaq
*Bun* – sıxıntı, qəm; fəlakət
*Bunalmaq* – müsibətə düçar olmaq, fəlakətə düşmək
*Buncılayın* – bunun kimi
*Buraq* (*ə.*) – islam əsatirinə görə, Məhəmməd peyğəmbərin me'rac gecəsi mindiyi əfsanəvi qanadlı atı
*Bustan* (*f.*) – güllük, bağça
*Buşmaq* – qəzəblənmək, acıqlanmaq
*Buşu* – qəzəb, acıq, hiddət
*Buy* (*f.*) – ətir, iy, qoxu
*Büğz* (*ə.*) – kin, nifrət, sevməmə, ədavət
*Bünyad* (*f.*) – əsas, bünövrə
*Bürdbar* (*f.*) – dözümü olan, səbrli

## C

*Calenus* – Qalen, antik təbabətin klassiki, Roma həkimi və təbiətşünası
*Canalıcı* – Əzrayil adlı mələk
*Cəbbar* (*ə.*) – qüdrət və əzəmət sahibi; Allah
*Cəbrayil* (*ə.*) – Allah qatında ən üstün dörd mələkdən ən böyüyü. Peyğəmbərlərə Tanrı müjdələrini yetirən və vəhyə vasitə olan mələk
*Cəllə cəlal* (*ə.*) – "ucalardan uca" mənasında olub Tanrının adı anıldığı zaman söylənir



*Cərcis* (*ə.*) – İsa peyğəmbərdən sonra gələn və onun şəriətinə əməl eləyən peyğəmbər. Adına Qur'anda rast gəlinmir. Yetmiş dəfə öldürüldüyü halda yetmiş dəfə dirilmişdir
*Cəzbə* (*ə.*) – Tanrının qulu özünə çəkməsi, cəlb etmə; vəcd, cuşa gəlmə
*Cəzirə* (*ə.*) – ada
*Cinan* (*ə.*) – cənnətlər, behiştlər
*Cövşən* (*f.*) – zireh, zirehli geyim
*Cümlə* (*ə.*) – bütün
*Cünbüş* (*f.*) – qımıldanma, hərəkət; əyləncə, zövq, kef
*Cür'ə* (*ə.*) – bir qurtumda içiləcək şey, bir udumluq içki
*Cürm* (*ə.*) – günah, təqsir, qəbahət
*Cüstü cu* (*f.*) – axtarma, araşdırma

## Ç

*Çarsu* (*f.*) – çarşı bazar, bazar
*Çaryar* (*f.*) – çaharyar, dörd yoldaş (Məhəmməd peyğəmbərin dörd yaxın dostu)
*Çavuş* – gözətçi, xidmətçi
*Çeşni* (*f.*, *"çaşni"*) – dad, ləzzət
*Çələb* – Tanrı, Allah
*Çəng* (*f.*) – arfaya bənzər musiqi aləti
*Çərçi* – hər şey satan səyyar satıcı
*Çəri* – ordu, qoşun, əsgər
*Çıyan* – əqrəb, çayan
*Çizginmək* – dolanmaq, firlanmaq
*Çözmək* – açmaq
*Çulxa* – bez toxuyan
*Çün* (*f.*) – çünki, madam ki, üçün

## D

*Daq* – qüsur, nöqsan; zarafat, lağlağı; hiylə, məkr
*Daqmaq* – taxmaq
*Danişman* (*f.*) – bilikli, elmli; alim
*Davud* (*ə.*) – peyğəmbərlərdən biri. Zəbur adlı müqəddəs kitabın ehkamlarını məlahətlə oxuyarmış
*Deyr* (*ə.*) – monastır, kilsə
*Dəccal* (*ə.*) – qiyamətə yaxın zühur eləyib bəzilərini dindən-imandan çıxaracağı və Həzrəti İsa tərəfindən öldürüləcəyi söylənən yalançı peyğəmbər
*Dəgin* – qədər

*Dəgmə* – hər yetən kəs, kimsə, hər cür
*Dəgül* – deyil, yox, deyildir
*Dəgürmək* – çatdırmaq, yetişdirmək; bildirmək
*Dəxi* – daha, da, də (ədat)
*Dək* – tay, bəzər, oxşar, tək
*Dək oturmaq* – susmaq, dinməz oturmaq
*Dəlim* – çox, bol
*Dəm (f.)* – zaman, an, ləhzə
*Dəmrən* – oxun iti dəmir ucluğu
*Dənlü* – təhər, cür, qədər
*Dərban (f.)* – qapıçı
*Dərilmək* – yığılmaq, toplanmaq
*Dərmiyan (f.)* – arada, aralıqda
*Dəstgir (f.)* – əldən tutan, yardım edən
*Dəvlənganc* – sarı köynək
*Didar (f.)* – üz, camal; Tanrı gözəlliyi
*Dirgürmək* – diri saxlamaq, diriltmək, yaşatmaq
*Dirhəm (ə.)* – dəyəri az olan gümüş pul
*Diriğa (f.)* – əfsuslar olsun, heyf olsun
*Dirlik, dirlük* – həyat, güzəran
*Dirmək* – bir araya gətirmək, toplamaq
*Donanmaq* – geyinmək, bəzənib düzənmək
*Dölənmək* – dolanmaq, fırlanmaq
*Dört kitab* – Musa peyğəmbərə enən Tövrat, İsa peyğəmbərə enən İncil, Davud peyğəmbərə enən Zəbur, Məhəmməd peyğəmbərə enən Qur'an
*Döşürmək* – yığmaq, toplamaq, bir araya gətirmək; dənləmək
*Döymək* – dözmək, tab eləmək, dayanmaq
*Dutsaq* – dustaq, əsir
*Duzaq* – tələ
*Duzəx (f.)* – cəhənnəm
*Dügəli* – bütün, tamamı, hamısı
*Dükətmək* – tükətmək, bitirmək, başa vurmaq
*Dün* – gecə
*Dürmək* – yığışdırmaq, toplamaq, cəm eləmək
*Dürri-yetim (ə.)* – bir sədəf içərisində tək bir dənə çox iri mirvari, qiymətsiz inci; Həzrəti Məhəmməd
*Düş* – yuxu, röya
*Düşvar (f.)* – çətin
*Dütmək* – tüstülənmək, dumanı qalxmaq
*Dütün* – tüstü



## E

*Elmi lədün (ə. f.)* – Tanrı qatında verilən bilgi, qeyb elmi, Allahın sirlərinə aid mənəvi bilgi
*Erişgən* – yetişən, çatan
*Ertə* – sabah
*Eş* – dost, yoldaş
*Eyü* – yaxşı

## Ə

*Əbsəm (ə.)* – dilsiz, ağızsız
*Əcə* – başçı, böyük, rəis
*Ədəd (ə.)* – say, hesab
*Ədl (ə.)* – ədalət
*Əfrəng (f.)* – firəng, avropalı
*Əhməd (ə.)* – Məhəmməd peyğəmbərin adlarından biri
*Əxi (ə.)* – qardaş
*Əksimək, əksümək* – eksilmək, azalmaq
*Əlast (ə.)* – "Deyiləmmi?" mənası bildirən bir söz. Allahın, ruhları yaratdığı zaman "ələstu bi Rəbbikum" (Mən sizin Tanrınız deyiləmmi?) xitabına işarədir
*Əndişə (f.)* – düşüncə, fikir, qayğı, şübhə
*"Ənəl-həqq" (ə.)* – "Mən Həqqəm", "Mən Allaham" (Həllac Mənsurun dara çəkilməyinə səbəb olan söz)
*Ənqa (ə.)* – Qaf dağında yaşayan əfsanəvi quş. Mifologiyanın təsəvvüfə qazandırdığı rəmzlərdəndir. Haqqın mütləq vücuduna və qeyb aləminə işarə kimi pak eşq ilə müqayisə olunur, Haqqın mərifətini mənalandırır
*Əntər (ə.)* – Həzrət Əlinin öldürdüyü rəvayət edilən bir bahadır
*Ərəfat (ə.)* – Məkkədə bir dağ
*Ərən, ərənlər* – haqqa yetişən, həqiqətə qovuşan(lar); övliya
*Ərəsat (ə.)* – qiyamətdə hər canlının dirilib toplanacağı meydan
*Əraz (ə.)* – işarət, əlamət
*Ərkan (ə.)* – adablar, qayda-qanun; dinin rüknləri
*Ərş (ə.)* – qübbə; ən uca göy. Sufilərə görə varlıq, bədən, bütün cisimlər ərşdir və zahir olanlar hamısı Tanrı ərşidir.
*Əsən* – sağ-salamat
*Əsənləmək* – vida etmək, vidalaşmaq
*Əsfəl (ə.)* – ən alçaq, lap aşağı
*Əsilmək* – tökülmək

*Əsləmək* – qulaq asmaq, dinləmək
*Əsrimək* – sərxoş olmaq
*Əsrük* – sərxoş, məst; qızğın
*Əşər* (ə.) – bir surənin on ayəti
*Əşkər* (f.) – aşkar, açıq, aydın
*Əvrən* – div, əjdaha, qarşısı alınmayan nəhəng; fələk, zaman
*Əyər* – yəhər
*Əyyar* (ə.) – hiyləgər, çevik, əlindən hər iş gələn kələkbaz
*Əyyub* (ə.) – İsrail oğullarından səbriylə tanınmış olan bir peyğəmbər. Qur'anda adı çəkilir
*Əzazil* (ə.) – Şeytanın adı
*Əzrayil* (ə.) – ölüm mələyi, can alıcı

## F

*Fariğ* (ə.) – azadə, daha işi qalmamış; vaz keçmiş
*Fasid* (ə.) – fəsad törədən, pozğun
*Fasiq* (ə.) – günahkar, pis işlər görən
*Fatihə* (ə.) – giriş, başlanğıc; Qur'anın ilk surəsi
*Fəna* (ə.) – yoxluq, heçlik, varlıqdan keçmə; təsəvvüfdə mə'nəvi təkamülün yeddinci qatı
*Fəridə* (ə.) – misilsiz nadir tapılan (inci və s.)
*Fərişta* (f.) – mələk, məlaikə
*Fərizə* (ə.) – dincə yerinə yetirilməsi vacib olan iş
*Fərsəng* (ə.) – ağac, fərsəx (uzunluq ölçüsü)
*Fərş* (ə.) – döşənəcək; döşəmə; yer üzü
*Fəzl* (ə.) – ərdəm, fəzilət, mənəvi üstünlüklərə sahib olma
*Filhal* (ə.) – dərhal, indi, bu saat
*Fir'ovn* (ə.) – Musa peyğəmbərlə bir zamanda yaşamış Misir hökmdarı (Firon); zalım, qəddar adam
*Fürqan* (ə.) – xeyir ilə şəri, haqq ilə nahaqqı ayırd edən; Quranın ikinci adı

## G

*Gənc* (f.) – xəzinə, dəfinə
*Gənc yaz* – ilk bahar
*Gənəz* – asan
*Gər* (f.) – əgər
*Gərdun* (f.) – fələk, tale
*Gəz* (f.) – dəfə, kərə



*Gəzaf* (f.) – mənasız, boş, əsassız
*Gög* – göy, asiman, səma
*Gönilmək* – yönəlmək, üz tutmaq
*Görklü* – əziz, müqəddəs, gözəl, mübarək
*Göymək* – için-için yanmaq, tutuşmaq
*Göynümək, göyünmək* – içdən yanmaq, halına yanmaq
*Gözətmək* – gözləmək
*Gürəş* – güləş
*Güvü* – güvənmə, e'timad, inam
*Güzin* (f.) – seçən, ayırıb bəyənən; seçilmiş, sayılan

## Ğ

*Ğammaz* (ə.) – aravuran, qiybətçi, xəbərçi
*Ğayət* (ə.) – çox, olduqca
*Ğəffaruz-zünub* (ə.) – günahları bağışlayan; Allah
*Ğəni* (ə.) – varlı adam
*Ğəssal* (ə.) – ölüyuyan, mürdəşir
*-ğıl, -gil* – əmr şəklinin II şəxsin təkindəki xüsusi formantı
*Ğılman* (ə.) – oğlan, gənc; cənnətdəkilərə xidmət eləyən cavan xidmətçilər
*Ğüfran* (ə.) – bağışlama, əfv, mərhəmət

## H

*Hacətgah* (ə. f.) – dilək yeri
*Haman* – Musa peyğəmbərin düşmənlərindən olan və ona inanmayan, Fir'ovna tabe olan biri
*Harut, Marut* – dini əsatirdə iki mələyin adı. Sehrkarlıqla məşğul olduqları üçün qiyamətə qədər Babildə bir quyuda başıaşağı asılmışlar
*Həbib* (ə.) – sevilən, sevgili, dost (Allahın vəsflərindən biri)
*Hicə* – baş daşı, məzar daşları
*Hədis* (ə.) – sonradan vücuda gəlmiş; yeni, təzə; Məhəmməd peyğəmbərin sözləri
*Həqir* (ə.) – qədr-qiyməti olmayan, alçaq, hörmətsiz
*Həqq nəfəsi* – ərənlərin himməti, xeyir duası
*Həqqülyəqin* (ə.) – inkaredilməz həqiqət (irfan əhlinə aid inanışdır)
*Həlavət* (ə.) – dad, zövq, şirinlik, ləzzət
*Həllac Mənsur* – IX-X əsrlərdə yaşamış məşhur sufi. Söylədiyi "Ənəl-həqq" («Mən Həqqəm») sözləri şəriətə zidd sayılmış və 922-ci ildə Bağdadda asılaraq öldürülmüşdür

*Həmraz* (*f.*) – sirdaş
*Hərami* (*ə.*) – haram mala əl uzadan; yolkəsən, soyğunçu
*Hərgiz* (*f.*) – heç zaman, əsla, heç vaxt
*Hərir* (*ə.*) – ipək
*Həşr* (*ə.*) – qiyamət günü, qiyamət
*Həvva* (*ə.*) – yaradılan ilk qadın
*Həyy* (*ə.*) – diri, canlı
*Həzar* (*f.*) – min, minlərcə
*Həzar dəstan* (*f.*) – bülbül
*Həzrət* (*ə.*) – qabaq, ön, hüzur
*Hicab* (*ə.*) – pərdə, örtük
*Hiç* (*f.*) – heç
*Hikmət* (*ə.*) – bir işin səbəbi, anlaşılmayan yönü, gizli sirr
*Hövl* (*ə.*) – qorxu
*Huri, hur* (*ə.*) – cənnət qızları
*Huşyar* (*f.*) – ayıq, sayıq; ağıllı, fərasətli
*Hüllə* (*ə.*) – bəzəkli paltar
*Hüma* – uğur, səadət gətirdiyinə inanılan bir quş; dövlət quşu

## X

*Xab* (*f.*) – yuxu
*Xak* (*f.*) – torpaq
*Xaliq* (*ə.*) – Yaradan, xəlq edən, yaradıcı
*Xamuş* (*f.*) – susan, sakit, dinməz
*Xan* (*f.*) – süfrə, yemək
*Xasü am* (*ə.*) – hamı, bütün camaat
*Xəlaiq* (*ə.*) – bütün canlılar, yaradılmışlar, məxluqat
*Xəlil İbrahim* – dini rəvayətlərdə yəhudilərin peyğəmbəri. Bütpərəstliyə qarşı çıxdığı və bütxanadakı bütləri qırdığı üçün Babil hökmdarı Nəmrud tərəfindən oda atılmışsa da, od onu yandırmayıb gülüstana çevrilmişdir
*Xəndan* (*f.*) – gülən, gülər, şən
*Xərabat* (*ə.*) – meyxana
*Xızr* (*Xızır*) – dini əfsanələrə görə zülmətdəki dirilik suyundan içdiyi üçün həmişə diri qalan peyğəmbər. Şərq ədəbiyyatında əbədi həyat və nicat rəmzi kimi bilinir
*Xirqə* (*ə.*) – dərvişlərin geydikləri yaxasız üst paltar
*Xirqəpuş* (*ə.*) – (xirqə geyən) dərviş
*Xişm* (*f.*) – acıq, qəzəb, hiddət
*Xu* (*f.*) – xasiyyət, qılıq



*Xub* (*f.*) – gözəl, göyçək
*Xud* (*f.*) – özü
*Xumar* (*ə.*) – içkinin verdiyi keflilik, sərxoşluq
*Xülq* (*ə.*) – xasiyyət, təbiət

## I

*Ilan* – ilan
*Iraq* – iraq, uzaq
*Irmaq* – irmaq, çay
*Irmaq, ırmaq* – ayırmaq, uzaqlaşdırmaq
*Ismarlamaq* – əmanət etmək, tapşırmaq

## İ

*İbrahim Xəlil* (*ə.*) – bax: Xəlil İbrahim
*İçrə* – içində
*İdris* (*ə.*) – dərzilərin piri sayılan bir peyğəmbər, Şisin oğlu
*İgən, inən* – çox, artıq
*İxlas* (*ə.*) – təmizlik, sədaqət, səmimiyyət
*İqab* (*ə.*) – əzab, əziyyət
*İqrar* (*ə.*) – dil ilə söyləmə, təsdiq etmə
*İlətmək, iltmək* – aparmaq
*İləy* – ön, qarşı; yan, tərəf, ətraf
*İlyas* – "Tövrat"da adı "Elia" şəklində keçən peyğəmbər. Xızırla birgə əbədi həyata qovuşmuşdur. Sularda dara düşənlərə yardım etdiyinə inanılıbdır
*İmran* (*ə.*) – Musa peyğəmbərin atasının adı
*İmruz* (*f.*) – bu gün
*İncil* (*ə.*) – İsa peyğəmbərə enmiş olan kitab
*İncü* (*f.*) – inci, cövhər. Tanrının ilk öncə bir inci yaratdığı haqda rəvayət, lövhi-məhfuzu da ağ incidən yaratdığına dair bir hədis var
*İ'rab* (*ə.*) – ərəbcədə sözlərin oxunuş tərzi
*İrgürmək* – yetişdirmək, qovuşdurmaq
*İrişmək* – çatmaq, yetişmək
*İrmək* – çatmaq, qovuşmaq, yetmək
*İrşad* (*ə.*) – doğru yol göstərmə, doğru yola çəkmə
*İrürmək* – çatdırmaq, yetişdirmək
*İsa* – beş böyük peyğəmbərdən biri və xristianlığın qurucusu
*İsar* (*ə.*) – bəxşiş, bağışlama
*İsmayıl* – İbrahim peyğəmbərin oğlu

*İsrafil* – dini rəvayətlərdə qiyamət günü ölüləri diriltmək üçün sur çalacaq mələyin adı
*İssi* – sahib, yiyə
*İstiğfar* (ə.) – Tanrıdan bağışlanmağı istəmə, tövbə və üzr diləmə
*İtab* (ə.) – məzəmmət eləmə, üzünü danlama

### K

*Kan* (f.) – mədən; mənbə
*Kəksüz* – istəmədiyi halda, könülsüz, istəksiz
*Kəlaci* – söz, mənalı söz
*Kəminə* (f.) – aciz, həqir
*Kəmtər* (f.) – etibarsız, dəyərsiz
*Kəndözi* – özü
*Kibi* – kimi, tək
*Kibr* (ə.) – lovğalanma, qürurlanma
*Kiçi* – kiçik
*Kinə* (f.) – kin, ədavət, qərəzkarlıq
*Kişi* – adam, insan
*Kizb* (ə.) – yalan
*Könlək* – köynək
*Könül əri* – eşq əhli
*Kövn* (ə.) – varlıq, mövcudiyyət
*Kövnü məkan* (ə.) – aləm, kainat, varlıq, dünya
*Kövsər* (ə.) – dini əfsanəyə görə cənnətdə bir bulaq adı
*"Kufuvən əhad"* – "İxlas" surəsinin 4-cü ayəsinə işarə edilir: "Nə də bir kəs O-na tay olubdur"
*"Kün-fəyəkun"* (ə.) – Tanrının kainatı yaratmaq üçün dediyi iki söz: "ol – oldular"

### Q

*Qaçan* – haçan, nə zaman, nə vaxt
*Qaf* (ə.) – əfsanəvi dağ. Cinlərin, şeytanların və divlərin bu dağın o biri üzündə yaşadığı, Simürğ quşunun yuvasının da bu dağın zirvəsində olduğu söylənilir. Təsəvvüfdə insan bədəni anlamında işlədilən bir rəmzdir
*Qağırmaq, qığırmaq* – çağırmaq
*Qaqımaq* – acıqlanmaq, qəzəblənmək
*"Qalu bəla" (bəli)* – "Bəli dedilər". Ruhlar yaradılan zaman Adəm oğullarına "Mən Rəbbiniz deyiləmmi?" Allah nidası gələndən sonra möminlərin verdiyi cavab



*Qamu* – hamı
*Qanca* – haraya
*Qancaru* – ha yana, haraya, hansı yana
*Qanda* – harda
*Qanğı* – hansı
*Qanı* – hanı
*Qanmaq* – susuzluğu yatmaq, doymaq
*Qaranğu* – qaranlıq
*Qarun* – Musa peyğəmbər zamanında yaşamış və mal-dövləti, eyni zamanda xəsisliyi ilə məşhur olmuşdur. Musanın qarğışından öz xəzinələriylə birgə yerə batmışdır. Şərq ədəbiyyatında zənginlik və xəsislik rəmzidir.
*Qatı* – bərk, çox sərt
*Qatında* – hüzurunda, yanında
*Qayğu, qayu* – qayğı, qorxu, narahatlıq, nigarançılıq
*Qayıqmaq* – qayıtmaq, dönmək; sapmaq
*Qayurmaq, qayramaq* – fikir çəkmək, qayğıya düşmək, pərişan olmaq
*Qeyd* (ə.) – qayğı, əhəmiyyət vermə
*Qədr gecəsi* (ə.,t.) – Qur'anın ilk ayələrinin nazil olduğu gecə
*Qəllaş* (ə.) – yalançı, hiyləgər
*Qə'rə* (ə.,«qə'r») – dib
*Qılavuz* – bələdçi
*Qiylü qal* (ə.) – qalmaqal, səs-küy, hay-küy
*Qolay* – asan
*Qolmaş* – hərzəçi, boş-boş danışan adam, yalançı; saxtakar, hiyləgər
*Qonuq* – qonaq, mehman, müsafir
*Qopuz* – saza bənzər kiçik musiqi aləti
*Qova* – su qabı
*Quşanmaq* – kəmər bağlamaq
*Qut* – can, ruh, həyat gücü
*Qutlu* – mübarək, uğurlu, taleli

### L

*Laşərik* (ə.) – ortağı, şəriki olmayan
*Lövlak* (ə.) – "Həbibim! Sən olmasaydın mən fələkləri yaratmazdım" anlamındakı hədisi-qüdsiyə işarədir
*Leyli* (ə.) – "Leyli və Məcnun" əsərlərinin qəhrəmanı. Şərq ədəbiyyatında gözəl, vəfalı və sadiq mə'şuqə rəmzi kimi işlənmişdir
*Ləhzə* (ə.) – bir an, göz açıb yumunca keçən zaman, bir göz qırpımı
*Ləin* (ə.) – məlun, lənətlənmiş, Şeytan

*Ləmyəzəl* (ə.) – həmişəlik, əbədi, daimi, ölməz
*"Lən tərani"* (ə.) – "Məni heç görə bilməzsən" ( "Ə'raf" surəsi, 143-cü ayə)
*-ləyin* – kimi, tək (qoşma)
*Lisan* (ə.) – dil
*Lütf* (ə.) – yaxşılıq, ehsan, kərəm

## M

*-madın, -mədin* – madan, – mədən (feli bağlama)
*Manənd* (f.) – bənzər, oxşar, misl, tay
*Mehman* (f.) – qonaq, müsafir
*Mehr* (f.) – sevgi, məhəbbət
*Me'rac* (ə.) – çıxılacaq yer; göyə çıxma (Məhəmməd peyğəmbərin göyə çıxıb dolaşmağı)
*Məab* (ə.) – qayıdılacaq yer, sığınacaq
*Məcal* (ə.) – güc-qüvvət, iqtidar
*Məcnun* (ə.) – "Leyli və Məcnun" əsərlərinin qəhrəmanı. Şərq ədəbiyyatında sadiq, vəfalı və dəlicəsinə sevən aşiq rəmzidir
*Mədəd* (ə.) – yardım, kömək
*Məğrib* (ə.) – günbatan, qərb
*Məhfil* (ə.) – yığıncaq yeri, toplaşılan yer
*Məhşər* (ə.) – dini etiqada görə ölülərin dirilib yığılacağı yer
*Məxluq* (ə.) – xəlq olunmuş, yaradılmış olan
*Məkrəmət* (ə.) – ləyaqət, şərəf, hörmət, izzət
*Məqam* (ə.) – dayanılan yer, duracaq məkan
*Məqsud* (ə.) – məqsəd, arzu, dilək
*Məlaik* (ə.) – mələklər
*Məlamət* (ə.) – qınama, qaxınc, danlaq
*Mələkut* (ə.) – mələklər və ruhlar aləmi
*Məncəniq* (ə.) – orta əsrlərdə şəhər və qalaları dağıtmaq üçün ağır daşlar atmağa yarayan qurğu
*Mənqur* (ə.) – buynuzdan düzəldilən boru, şeypur, nəfir
*Mənşur* (ə.) – yazılmış və nəşr olunub yayılmış fərman, hökm
*Mərğzar* (f.) – çayırlıq, çəmənlik
*Məsrur* (ə.) – şad, sevincli, şən
*Məstur* (ə.) – örtülü, qapalı, gizli
*Məşayix* (ə.) – şeyxlər
*Məta'* (ə.) – mətah, mal-mülk, əşya
*Mə'zul* (ə.) – işdən və ya qulluqdan çıxarılmış, vəzifəsi alçaldılmış
*Misl* (ə.) – bənzər, oxşar



*Mismil* («*bəsmələ*»*dən*) – təmiz, pak, arı, saf
*Musa* (ə.) – yəhudilərin peyğəmbəri. İlk müqəddəs kitab – "Tövrat" ona nazil olmuşdur
*Mövc* (ə.) – dalğa, ləpə
*Mücrim* (ə.) – günahkar, təqsirli
*Müctəba* (ə.) – seçilmiş, bəyənilmiş
*Müddəi* (ə.) – haqsız yerə bir şey tələb edən
*Müdərris* (ə.) – dərs verən, müəllim, oxudan
*Müfsid* (ə.) – fəsad törədən, fitnəçi, araqarışdıran
*Mühibb* (ə.) – sevən, dost, sevgi bəsləyən
*Mülkət* (ə) – səltənət, şahlıq, hökmdarlıq
*Müməyyiz* (ə.) – yaxşını pisdən ayıran, seçən
*Münacat* (ə.) – gizli söhbət, dua
*Mün'im* (ə.) – nemət verən, yedirib içirən
*Münkər, Nəkir* (ə.) – ölüləri qəbirdə sorğu-suala tutan iki mələkənin adı
*Münkir* (ə.) – inkar edən, danan
*Mürtədd* (ə.) – dinindən dönən
*Mürüvvət* (ə.) – insana yaraşan sifət, insanlıq; comərdlik
*Müşrik* (ə.) – Tanrıya şərik qoşan

## N

*Naliş* (f.) – inləmə, fəğan etmə, inilti
*Nam* (f.) – ad, şöhrət, san, ün
*Nar* (ə.) – od, ateş
*Neçəmə* – hər nə qədər, neçə, nə qədər
*Neşə* – niyə, nə üçün
*Netə* – necə, nə cür, nə şəkildə
*Neyşəkər* (f.) – şəkər qamışı
*Nəbi* (ə.) – peyğəmbər, Tanrıdan xəbər gətirən
*Nəfəs* (ə.) – Ələvi-Bəktaşilərdə təriqətə aid olan və çoxu heca vəzniylə yazılan, adına "ilahi" də deyilən şeir
*"Nəhnu qəssəmna"* – "Biz... böldük" (Zuxruf surəsi, 32-ci ayə)
*Nəxcir* (f.) – ov heyvanı
*Nəmrud* (ə.) – Babil şəhərinin əfsanəvi hökmdarı. Musa peyğəmbər zamanında yaşamış, allahlıq iddia etmiş, axırda bir milçəyin onun qulağına girməsiylə ölmüşdür
*Nəsnə* – şey, hər hansı bir şey
*"Nəuzü-billah"* (ə.) – "Allah göstərməsin! Üzdən iraq!" mənasında işlədilən dini ifadə

*Nəvalə* (ə.) – pay, yeyəcək, bəxşiş
*Nifrin* (f.) – bəddua, qarğış
*Nigar* (f.) – gözəl, sevgili
*Niqab* (f.) – örtük, üz örtüyü
*Nisar* (ə.) – saçma, səpmə, dağıtma; qurban
*Nisyan* (ə.) – unutma, yaddan çıxartma
*Nişan* (f.) – əlamət, iz, əsər
*Növrəstə* (f.) – kamala yeni çatmış, yeniyetmə
*Nuşin-rəvan, Nuşirəvan* (f.) – qədim İranda ədalətin timsalına çevrilmiş Sasani hökmdarı
*Nüktə* (ə.) – ibarə və ya bir sözdən çıxarılan eyhamlı, incə və dərin məna

**O**

*Obrılmaq* – ovulmaq, yarılmaq, çökmək
*Oqımaq* – oxumaq; çağırmaq, də'vət etmək
*Oluq dəm* – o anda, dərhal
*Olvanın* – onun
*Onmaq, onatmaq* – sağaltmaq, yaxşılaşdırmaq
*Orğan, urğan* – örkən

**Ö**

*Ög* – əsl, kök, maya; ağıl, fikir
*Ögin dərmək* – ağlını başına yığmaq, özünə gəlmək
*Ögün* – bir dəfəlik yeyəcək
*Ögütləmək* – öyüd vermək, nəsihət eləmək
*Öküş* – çoxlu, daha artıq, çox artıq
*Öndin* – əvvəl, qabaq, irəli
*Öndül* – yarışda qazanana verilən mükafat
*Ötə* – o yan, o tərəf
*Öz* – mənəvi varlıq

**P**

*Payan* (f.) – son, axır, nəhayət
*Paydar* (f.) – daimi, həmişəlik, sürəkli
*Paləhəng* (f.) – boyunluq
*Paymal* (f.) – ayaqlar altında qalan, təpikaltı, ayaqaltı
*Peymanə* (f.) – şərab piyaləsi, qədəh



*Pərtov* (f.) – işıq, nur, şüa, parlaqlıq
*Pərvanə* (f.) – gecələr işığın başına dolanan xırda kəpənək
*Pişrov* (f.) – irəlidə gedən, qabaqcıl
*Pusu* – pusqu, pusquda durma
*Pünhan* (f.) – gizlin, xəlvəti
*Pür* (f.) – dolu, dolğun, çox
*Pürnur* (f.) – çox işıqlı, parlaq

**R**

*Rast* (f.) – doğru, düz
*Rayigan* (f.) – müftə, havayı
*Raz* (f.) – sirr, gizli şey
*Rəca* (ə.) – xahiş, istək, dilək
*Rəcim* (ə.) – qovulmuş, daşla qovulmuş
*Rəhman* (ə.) – rəhmli, şəfqətli
*Rənc* (f.) – zəhmət, əziyyət
*Rəncur* (f.) – incimiş, incik
*Rəsm* (ə.) – adət, üsul, qayda
*Riyazət* (ə.) – zahidlik, nəfsini öldürmə
*Rizq* (ə.) – yeyəcək, yeyinti, azuqə
*Rizvan* (ə.) – islam əsatirində cənnətin gözətçisi olan mələyin adı
*Röhban* (ə.) – rahiblər
*Ruzgar* (f.) – zəmanə, dövran, fələk
*Rüku'* (ə.) – namazda əlləri dizlərə dayayıb əyilmə
*Rümuz* (ə.) – rəmzlər

**S**

*Sahibcəmal* (ə.) – göyçək, camallı, gözəl
*Sağ-əsən* – sağ-salamat
*Sağınc* – əməl, istək; xülya, düşüncə
*Sağış* – say, miqdar; sağış günü – məhşər, sorğu-sual günü
*Sahibqiran* (ə.) – qədim münəccimlərin fikrincə, Zöhrə və Müştəri ulduzunun bir bürcdə bir-birinə rast gəldiyi zaman dünyaya gəlmiş xoşbəxt
*Saqın* – çəkin, ehtiyatlı ol
*Saqi* (ə.) – su (və ya içki məclisində) şərab paylayan
*Salaca* – üstündə ölü götürülən dördqollu düz taxta
*Salus* (f.) – hiyləgər, fəndgir; ikiüzlü
*Sanu* – düşüncə, fikir; zənn, təsəvvür

*Sayru* – xəstə, azarlı
*Sayvan* (*f.: "sayəban"*) – kölgəlik, çardaq
*Sevi, sevü, sevgü* – sevgi, eşq, məhəbbət
*Səbəq* (*ə.*) – dərs; mükafat; birincilik
*Səbil* (*ə.*) – savab üçün, ehsan olaraq paylanan hər şey
*Səbükbar* (*f.*) – yüngül yüklü, yükü çox olmayan
*Səccadə* (*ə.*) – üzərində namaz qılınan kiçik xalça və ya qumaşdan tikili döşənək
*Səqqa* (*ə.*) – su daşıyan, suçu
*Səla* (*ə.*) – çağırış, dəvət; namaza çağırış
*Səlatin* (*ə.*) – sultanlar, padşahlar
*Sələvat* (*ə.*) – Məhəmməd peyğəmbərə və soyuna rəhmət oxuma
*Səməd* (*ə.*) – əbədi mövcud olan (Allahın vəsflərindən biri)
*Səncileyin* – sənin kimi
*Səng* (*f.*) – daş
*Sərab* (*ə.*) – çöldə aydın havada gün işığının təsiriylə görünən, gerçəkdə isə olmayan su, göl; ilğım
*Sərbəsər* (*f.*) – başdan-başa, bütünlüklə
*Səttar* (*ə.*) – eyibləri örtən; Allahın vəsflərindən biri
*Səyyad* (*ə.*) – ovçu
*Sımaq* – sındırmaq, pozmaq
*Siddiq* (*ə.*) – birinci islâm xəlifəsi Əbubəkrin ləqəbi
*Sidq* (*ə.*) – doğruluq, sədaqət, iman
*Sima'* (*ə.*) – sufi dərvişlərin neylə ifa elədikləri zikr
*Sin* – məzar, gor, qəbir
*Sina* (*Turi-Sina*) – Sina dağı, dini əfsanələrə görə Musa peyğəmbərin Allah ilə danışdığı dağ
*Sinək* – milçək
*Sinmək* – həzm olmaq
*Sipahi* (*f.*) – əsgər, qoşun; əsgəri
*Sir* (*f.*) – tox, doymuş
*Sirat* (*ə.*) – yol; dini əfsanəyə görə cəhənnəm üzərində qurulmuş qıl körpü
*Siva* (*ə.*) – başqa, qeyri
*Siyasət* (*ə.*) – cəzalandırma, cəza
*Soğulmaq* – suyu, seli çəkilmək
*Son uc* – nəticə, son, axır
*Sormaq* – soruşmaq
*Sorucı* – qəbirdə ölmüş kimsələri sorğu-sual edən mələk (Münkər, Nəkir)
*Suç* – günah, qüsur, qəbahət
*Sud* (*f.*) – qazanc, fayda
*Sufi* (*ə.*) – təsəvvüfü mənimsəyən adam, dərviş



*Suq* (*ə.*) – bazar, çarşı
*Sunmaq* – uzatmaq, vermək, təqdim etmək
*Susalıq* – susuzluq
*Süci* – şərab, içki növü
*Süleyman* (*ə.*) – dini rəvayətlərə görə, Davud peyğəmbərin oğlu, dünyaya hökm eləyən padşah. Bütün canlıların dilini bildiyi, onlara hökmü yetdiyi deyilir. Adı Şərq ədəbiyyatında qüdrət rəmzi kimi işlənmişdir
*Sün'* (*ə.*) – əməl, iş
*Sünük, süngük* – sümük

## Ş

*Şeşirmək, şeşmək* – açmaq, boşlamaq; düyününü çözmək
*Şeybət* (*f.*) – qocalıq, saç-saqqalın ağlığı
*Şeyda* (*f.*) – dəlicəsinə vurğun, dəli-divanə
*"Şey'un lillah"* (*ə.*) – dərvişlərin və yolçuların "Allah yolunda bir şey" mənasında işlətdikləri söz
*Şəcər* (*ə.*) – ağac
*Şəfaət* (*ə.*) – bir günahkarın bağışlanması üçün iltimas etmə
*Şər* (*f.: "şəhr"*) – şəhər
*Şərməndə* (*f.*) – utanılacaq bir iş görən, xəcalətli
*Şaş olmaq* – rast gəlmək, təsadüf eləmək
*Şirk* (*ə.*) – Tanrıya şərik qoşma
*Şit, Şis* – Adəm peyğəmbərin oğullarından biri
*Şivə* (*f.*) – naz, işvə, əda
*Şur eyləmək* (*f., t.*) – coşmaq, cuşa gəlmək
*Şümar* (*f.*) – say, hesab

## T

*Taət* (*ə.*) – itaət, boyun əymə
*Tağ* – dağ
*Tal* – qol, budaq
*Tamu* – cəhənnəm
*Tan, tanla* – səhər tezdən, sabah, dan yeri ağararkən
*Tana qalmaq* – təəccüb etmək, çaşıb qalmaq, heyrət eləmək
*Tanıq, tanuq* – şahid
*Tapduq Baba* – Yunus Əmrənin şeyxi və Baraq Babanın xəlifəsi
*Tapu* – ibadət
*Taraş* – tarac

*Taş* – xaric, xarici görkəm
*Taşra* – dışarı, bayır, çöl
*Tatlu* – dadlı; şirin
*Təbdil* (ə.) – dəyişdirmə, başqa şəklə salma
*Təbərra* (ə.) – üz çevirmə; uzaq durma
*Təcəlli* (ə.) – görünmə, zahir olma
*Tə'cilləmək* (ə., *"tə'cil"*) – tələsdirmək
*Təfərrüc* (ə.) – gəzmə, seyrə çıxma, gəzinti
*Təhi* (f.) – boş
*Təhtüssəra* (ə.) – torpağın altı
*Təqdir* (ə.) – qədər, qismət; Allah
*Təmə'* (ə.) – tamah; acgözlük
*Tən* – bədən
*Tənəşür* (ə.) – üzərində ölü yuyulan taxta
*Təng* (f.) – dar, darısqal
*Tənqri, Tənri* – Tanrı, Allah
*Tərəh* (ə.) – qəm, qüssə
*Tərsa* (f.) – xristian, xaçpərəst
*Təyyar* (ə.) – Həzrət Əlinin qardaşı Cəfərə şəhid olarkən Peyğəmbərin verdiyi ləqəb
*Təzvir* (ə.) – yalan qarışdırma, hiyləbazlıq
*Timar* (ə.) – baxma, qayğısına qalma
*Toğan* – şahin, qızılquş
*Toğrı* – doğru
*Tolı, tolu* – dolu
*Tolınmaq* – batmaq, qürub eləmək
*Ton* – don, paltar
*Tonanmaq* – geyinmək
*Tovhid* (ə.) – Allahın birliyinə inanma
*Toylamaq* – doyurmaq, ziyafət vermək
*Tuba* – əfsanəyə görə cənnətdə gözəl, hündür bir ağac
*Tur* – Həzrəti Musaya ilahi təcəllinin olduğu dağ
*Turaq* – dayanılacaq yer
*Türab* (ə.) – torpaq, məzar

## U

*-uban, -übən, ubanı, übəni* – feli bağlama şəkilçiləri
*Uçmaq, uçmağ* – cənnət, behişt
*Ud, ut* – abır-həya



*Ulaşmaq* – birləşmək, çatmaq, yetmək, qovuşmaq
*Ulu* – böyük
*Umu* – umulan şey, ümid
*Urmaq* – vurmaq
*Uru* – ayaq üstə durma, dayanma
*Us* – ağıl, huş
*Uslu* – ağıllı
*Uş* – bu, belə
*Uşatmaq* – qırıb tökmək, parçalamaq
*Utmaq* – qalib gəlmək, qazanmaq, yenmək
*Uyaqmaq* – batmaq, qürub etmək
*Uyqu, uyxu* – yuxu
*Uymaq* – uyğunlaşmaq
*Uz gəlmək* – uyğun gəlmək

## Ü

*Üləş* – pay, hissə
*Üləşmək* – bölüşdürmək, paylaşmaq
*Ün* – səs, nida, səda; şöhrət
*Üstun* (f. *"sütun"*) – dirək, sütun
*Üşdə* – budur (modal söz, ədat)
*Üşənmək* – çəkinmək, qorxmaq; narahat olmaq
*Üşmək* – toplaşmaq
*Üşr* (ə.) – məhsulun onda biri miqdarında olan dini vergi
*Üveys* – Veysəl Qarani

## V

*Varmaq* – getmək
*Vəbal* (ə.) – günah, təqsir, xəta
*Vəhm* (ə.) – yersiz qorxu, şübhə
*Vəqt* (ə.) – vaxt, zaman
*Vəli* (f.) – lakin, amma, ancaq
*Vilayət* (ə.) – övliyalıq, kəramət
*Vü* – və
*Vücud* (ə.) – varlıq; cisim, bədən
*Vüslət* (ə.) – vüsal, aşiqin sevgiliyə qovuşması

### Y

*Yaban* – çöl, səhra
*Yaqa* – yaxa
*Yaqmaq* – yaxmaq, yandırmaq
*Yalab–yalab* – par-par, alov kimi
*Yalıncaq* – çılpaq, paltarsız
*Yalunuz* – yalnız, təkcə
*Yana* – tərəf, tərəfdən, tərəfə
*Yanqu* – əks-səda, səsin əksi
*Yapmaq* – qurmaq, tikmək
*Yarən* (*f. "yaran"*) – dostlar, yoldaşlar
*Yarın* – sabahkı gün
*Yarlığamaq* – bağışlamaq, əfv və mərhəmət eləmək, günahından keçmək
*Yatlu* – pis, fəna
*Yavı varmaq* – itmək, qeyb olmaq
*Yavlaq* – çox, son dərəcə
*Yavuz* – acıqlı, pis
*Yaya, yayaq, yayan* – ayaqla, piyada
*Yazı* – çöl, düzənlik, ova
*Yazuq* – günah
*Yedi dört on səkiz* – yeddi dəniz, dörd ünsür və on səkkiz min aləmə işarədir
*Yeg* – yaxşı
*Yegrək* – daha yaxşı, üstün
*Yeltəmək* – meyl etdirmək
*Yen* – paltarda qolun ələ yaxın hissəsi, qolçaq
*Yenilə* – yenicə, təzəliklə
*Yerinmək* – kədərlənmək, qəmli olmaq
*"Yey" "nun" "sin"* – "Yunus" adının yazıldığı hərflər
*Yəğma* – basqın, çapqınçılıq, talan, qarət
*Yə'qub* (*ə.*) – İsrail oğullarından Yusif peyğəmbərin atası
*Yəzdan* – zərdüşt dinində xeyir allahı; Allah
*Yıl* – il
*Yıldız* – ulduz
*Yitmək* – itmək
*Yiyləmək* – iyləmək
*Yormaq* – yozmaq, yuxu yozmaq
*Yudmaq* – udmaq
*Yuqaru ellər* – Azərbaycan və İran haqqında deyilir
*Yumış* – xidmət, iş, qulluq



*Yurd* – xaraba, viran
*Yusif* – əfsanəyə görə Yaqub peyğəmbərin oğlu. Adı Şərq ədəbiyyatında gözəllik rəmzi kimi işlənmişdir
*Yuyıcı* – ölü yuyan, mürdəşir
*Yücə* – uca

### Z

*Zahid* (*ə.*) – ibadətlə məşğul olan
*Zari* (*f.*) – inləyiş, ağlama, nalə
*Zehi* (*ə.*) – nə yaxşı, nə gözəl, əcəb
*Zeyn* (*ə.*) – zinət, bəzək
*Zəbun* (*f.*) – zəif, gücsüz, qüvvətsiz; məğlub, əsir
*Zəbur* (*ə.*) – Davud peyğəmbərə enən kitab
*Zəkəriyyə* – İsrail oğulları peyğəmbərlərindən biri. Qövmündən qaçıb bir ağacın içinə girmiş, ona inanmayan qövmü həmin ağacla bərabər onun özünü ikiyə bölmüşdür
*Zikr* (*ə.*) – yada salma, xatirə gətirmə, Tanrının vəsflərini anma; dua
*Zinhar* (*f*) – Ay aman! Qorun! Saqın, ehtiyatlı ol!
*Zira* (*f.*) – çünki, belə ki
*Zöhd* (*ə.*) – dinin yasaq etdiklərindən çəkinmə, saqınma
*Zöhrə* (*ə.*) – Venera planeti. Şərq poeziyasında fəza çalğıçısı timsalıdır
*Zülcəlal* (*ə.*) – cəlal sahibi
*Zünnar* (*ə.*) – xristianların bağladıqları sərt qurşaq

## DİVANDAKI ŞEİRLƏRİN AD GÖSTƏRİCİSİ

## QAYNAQLAR

1. Ord. Prof. Dr. Fuad Köprülü. *Türk edebiyatında ilk mutasavvıflar*, 7. baskı, Ankara, 1991

2. Yunus Emre. *Risalat al-Nushiyya ve Divan* (hazırlayan Abdulbaki Gölpınarlı), İstanbul, 1965

3. Nihad Sami Banarlı. *Resimli Türk edebiyatı tarihi*, 1. cilt, İstanbul, 1987

4. *Yunus Emre Divanı* (hazırlayan Prof. Dr. Faruk K. Timurtaş), Ankara, 1989

5. Ahmet Yaşar Ocak. *Türk sufiliğine bakışlar*, İstanbul, 1996.



## MÜNDƏRİCAT

